*Bu kitab "**A.Bakıxanov.** Seçilmiş əsərləri" (Bakı, Yazıçı, 1984) nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

Tərtib edəni, fars dilindən tərcümələr, müqəddimə, qeyd və şərhlərin müəllifi: **Məmmədağa Sultanov**

Redaktorlar: **Ənvər Əhmədov**
**Rəhim Sultanov**

**894.3613 - dc 21**
**AZE**
**Bakıxanov Abbasqulu ağa Qüdsi. Seçilmiş əsərləri.** Bakı, "AVRASİYA PRESS", 2005, 488 səh.

Yeni maarifçiliyin ideya sələfi rolunda ağlın ehtiraslı tərənnümçüsü, çağdaş Avropa mədəniyyətinin Şərqdə ilk carçısı Abbasqulu ağa Bakıxanov Qüdsinin elmi, ədəbi, fəlsəfi xidmətləri tarixi əhəmiyyət kəsb edir. A.Bakıxanov – orta əsrlərdən yeni dövrə, Asiyadan Qərbə, ənənədən müasir mənada elmə keçidi hazırlayan ilk böyük maarifçi ədib və alimdir. O, özünün zirvə məqamına M.F.Axundzadə ilə çatan yeni ictimai fikrin də ilk baniləri və klassik xadimləri sırasındadır.

Azərbaycan xalqının böyük mütəfəkkir alim və şairinin zəngin elmi-ədəbi irsindən seçmələrdən ibarət olan bu kitaba müəllifin "Təhzibi-əxlaq", "Nəsihətlər", "Kəşfül-Qəraib" əsərləri ilə yanaşı "Kitabi-Əsgəriyyə" povesti, "Mişkatül-ənvar" poeması, lirik şeirləri və mənzum hekayətləri daxil edilmişdir.

**ISBN 9952-421-03-4**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**"Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında"**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir

# ÖN SÖZ

Abbasqulu ağa Bakıxanov Qüdsi Azərbaycan xalqının ensiklopedik biliyə malik olan mütəfəkkir simalarından biridir. O, tarix, fəlsəfə, nücum, sərf-nəhv, ilahiyyat və etikaya aid qiymətli əsərlər müəllifi, fəal maarifçi, eyni zamanda klassik Azərbaycan poeziyasının bütün sirlərinə bələd olan qüdrətli bir şair kimi tanınır. Ədəbi-bədii irsi dərindən öyrənildikcə Bakıxanov gözlərimiz qarşısında daha da böyüyür. Onun XIX əsrin birinci yarısında yaşamış görkəmli rus və Avropa alim və şairlərilə bir cərgədə durduğu ürəyimizi sonsuz iftixar hissilə doldurur. A.Bakıxanovun yaradıcılığına küll halında baxdıqda dünyagörüşündəki bəzi ziddiyyətləri də görürük. Bu, şübhəsiz, onu əhatə edən mühitdən, sarsılmaqda olan feodalizm ilə yaranmaqda olan kapitalizm arasında baş qaldıran ziddiyyətlərdən və şairin patriarxal dini baxışları ilə realist, hətta bəzən materialist görüşləri arasındakı çarpışmadan irəli gəlirdi.

A.Bakıxanovun bizə yadigar qoyub getdiyi əsərlər aşağıdakılardan ibarətdir.

Şeirlər külliyyatı – buraya şairin "Mişkatül-ənvar" adlı poeması, avtobioqrafik şeriləri, mənzum hekayələri, qəsidə, qəzəl, qitə, rübai və məsnəviləri daxildir.

Uzun müddət Bakıxanovun şerilər divanı itmiş hesab edildiyindən o, bir şair kimi tədqiq edilməmişdi. Lakin bu sətirlərin müəllifi həmin külliyyatı Respublika Əlyazmaları Fondunda tapıb, fars dilində yazılmış bütün şerilərini Azərbaycan dilində nəşr etdikdən sonra alimlərimiz Bakıxanov Qüdsini qüdrətli bir şair kimi də tədqiq və təhlil etməyə imkan tapdılar[1].

"Riyazül-Qüds" – A.Bakıxanovun ilk əsərlərindən biridir. Doğma Azərbaycan dilində yazdığı bu əsər əsasən mərsiyə xarakteri daşısa da, yeri gəldikcə onu dinlə əlaqəsi olmayan lirik şerilərlə bəzəmişdir: Bu şeirlər əsas mətndən ayrı-müstəqil əsər kimi oxunduqda, şairin hələ yaradıcılığının ilk dövrlərində nə qədər bədii və gözəl şeirlər yarada bildiyinin şahidi oluruq. A.Bakıxanov bir çox başqa klassiklərimizdən fərqli olaraq öz əsərlərinin yazılma tarixini göstərdiyi üçün yaradıcılığındakı inkişaf xəttini müəyyən dərəcə izləmək mümkündür. Məsələn, o, "Riyazül-Qüds"in yazılma tarixini "əbcəd" hesabilə (əsərin adındakı hərflərlə) göstərmişdir. Bu sözlər rəqəmə çevrildikdə hicri 1236-cı (miladi1820) ili göstərir ki, buradan da müəllifin həmin əsəri 26 yaşında ikən yazdığı aşkar olur. Bu əsərdə sənətkarlıqla qələmə alınmış şeir parçalarından aydın olur ki, A.Bakıxanov lap gənc yaşlarından ana dilində Şeir yazmağa başlamış və bu şeirlərin bir qismini sonradan "Riyazül-Qüds"ə daxil etmişdir. Bu əsərdə Vaiz-Kaşifinin "Rövzətüş-şühəda", Məhəmməd Füzulinin "Hədiqətüs-süəda" və Məhəmməd Bağır Məclisinin "Cilail-üyün" əsərlərinin təsiri var.

[1] Bu barədə müfəssəl məlumat almaq üçün bax: "Литературный Азербайджан" jurnalı, 1964, № 3, səh. 65-71.



"Qanuni-Qüdsi" – A.Bakıxanov bu əsəri uşaqlara fars dilinin sərf və nəhvini sadə dildə öyrətmək məqsədilə yazmışdır. Bu dərslik kitabı farsların özlərindən də çox qabaq bu dilin təlimi üçün yazılan ilk əsərlərdəndir. A.Bakıxanov əsəri üç fəslə bölür: fonetika, morfologiya və sintaksis. Burada müəllif əsasən ərəb və rus dillərinin qrammatik prinsiplərinə əsaslanmış, onları orijinal yolla fars dilinin daxili qanunlarına uyğunlaşdırmağa çalışmışdır. O, Şərqdə bir ənənə şəklini almış qaydaya riayət edərək, bəzi misalları şeirlə vermişdir və bu şeirlərdə atalar sözlərini xatırladan hikmətamiz fikirlər ifadə etmişdir. Müəllif bu əsəri "Riyazül-Qüds"dən təqribən 8 il sonra, yəni hicri 1244-cü (miladi 1828) ildə yazmışdır. Əsər ilk dəfə 1831-ci ildə fars dilində, 1841-ci ildə isə Tiflisdə rus dilində nəşr edilmişdir, "Gülüstani-İrəm" – A.Bakıxanovun müxtəlif dillərdə mövcud olan əsas mənbələri və tarix kitablarını uzun illər oxuyub öyrəndikdən sonra, 1841-ci ildə ilk dəfə Azərbaycan və Dağıstan xalqlarının tarixinə dair beş fəsildən ibarət farsca yazdığı bu əsər özünün dərinliyi, əhatəliyi, tərtibi və tarix elminə verdiyi tərif etibarilə müəllifinə dünya şöhrəti qazandırmışdır.

Azərbaycan və rus dillərində nəşr edilmiş bu əsər sonrakı dövrdə yaşayan tarixçilərimizin stolüstü kitablarından olub, əsasən islamın meydana gəlməsindən tutmuş 1813-cü ildə Rusiya ilə İran arasında bağlanan sülh müahidənaməsinə qədərki dövrdə xalqımızın tarixini tədqiq və təhlil etmək işində mühüm mənbələrdən biridir.

"Əsrarül-Mələkut" – Müəllifin nücum elminə dair ərəb dilində yazdığı bu əsər Azərbaycan xalqının elmi təfəkkür tarixində, habelə A.Bakıxanovun öz dünyagörüşünün təkmilləşməsində son dərəcə böyük rol oynamışdır. Əgər A.Bakıxanov özünün ilk əsərlərindən biri

olan "Riyazül-Qüds"də *şiələrin dini təziyələrini* qələmə almışsa, "Əsrarül-Mələkut" əsərində islam dininin ehkamlarının əksinə olaraq, kainat quruluşunu və Günəş sistemini elmin o zamankı nailiyyətləri arasında, materialistcəsinə izaha çalışmışdır. A.Bakıxanov Yeri kainatın mərkəzi sayan geosentrik nəzəriyyəyə qarşı çıxaraq, Günəşi mərkəz hesab edən heliosentrik nəzəriyyəsinin müdafiəçisi olmuşdur. Bu cəhətdən o, məşhur Polşa alimi Kopernikin (1473-1543) XIX əsrə qədər *görkəmli alimlər tərəfindən artıq dönə-dönə təsdiq edilmiş mütərəqqi fi*kirlərinə tərəfdar çıxmış və bu əsərilə elm aləmində şöhrət tapmışdır.[1]

"Təhzibi-əxlaq" – Bu kitabı A.Bakıxanovun əsas əxlaqi-fəlsəfi əsəri hesab etmək olar. Bu əsərdə o, cəmiyyət haqqındakı fikirlərini bir sistem şəklində nəşr edərək, gənclər arasında nəcib əxlaq normalarını, onun gözəl cəhətlərini təbliğ edir. Əsər müqəddimə və xülasədən başqa 12 fəsildən ibarətdir.

Müqəddimədə kitabın yazılma səbəbləri və hikmət qanunları, xülasədə isə bilik əldə etməyin sirləri haqqında danışılır.

Fəsillərin adlarından aydın olur ki, A.Bakıxanov bu əsəri yazarkən klassik Şərq ədəbiyyatında bu səpkidə yazılmış bir çox kitabları araşdırmışdır. O, əsərdə bir əxlaq müəllimi kimi faydalı məsləhət və nəsihətləri ilə oxucunu düz yola dəvət edir, onu əməyə rəğbət, dostluğa sədaqət, böyüklərə hörmət, təvazö və ədalətə çağırır. İnsan qəlbini ləkələyən, onu cəmiyyət içərisində xar edən tənbəllik, riya, paxıllıq, nankorluq, yalançılıq kimi alçaq sifətlərdən çəkindirməyə çalışır və öz fikirlərini elmi surətdə, dərin fəlsəfi izah və sübutlarla möhkəmləndirir, bir çox məsələlərdə dünyəvi əxlaq cəbhəsində duraraq ümumbəşəri əxlaq normalarını təbliğ edir. Əsərdə yeri gəldikcə Şərqin Sənai, Əttar, Rumi, Sədi, Hafiz kimi məşhur şairlərinin şeirlərindən istifadə edir və əxlaq gözəlliyi ifadə olunmuş bu şeir parçaları ilə oxucunun qəlbinə daha çox təsir göstərməyə çalışır.

[1] A.Bakıxanov ərəb dilində hələ 1832-ci ildə yazdığı bu əsərini, Turkiyə yolu ilə Məkkəyə səfəri zamanı özü ilə aparıb, 1846-cı ildə hakimiyyət başında olan Sultan Əbdülməcidə təqdim etmişdir. O dövrün türk alimləri tərəfindən təqdir edilən bu əsər Sultanın tapşırığı ilə görkəmli türk alimi Həyatizadə Seyid Şərəf Tərəfindən türk dilinə tərcümə və şərh edilərək "Əfkarül-cəbərut fi əsrarül-mələkut" adı altında İstanbulda (1848) nəşr *edilmişdir. A.Bakıxanov bu səfərdən qayıtmayıb vəfat etdiyindən* əsərin nəşrini görməmişdir. Müəllif bu əsəri fars dilində də yazdığını qeyd etmişdir. Çox təəssüf ki, əsərin fars mətni bizim əlimizdə yoxdur.



"Nəsayeh" – *ədəbiyyat tarixində* "Kitabi-nəsihət", "Nəsihətnamə" və "Nəsihətlər" adlanan bu əsəri "Təhzibi-əxlaq" əsərindən bir çıxarış və ya ondan xülasə hesab etmək olar. Müəllifin yeniyetmələrə tərbiyə vermək məqsədilə asan dildə yazdığı bu yığcam əsər 103 nəsihətdən ibarətdir. Bu nəsihətlərin əksəriyyəti bu gün də öz əhəmiyyətini itirməmişdir.[1]

"Kəşfül-Qəraib" – Amerikanın kəşfinə dair olan bu əsəri A.Bakıxanov "Məriz" təxəllüslü şair-alim Mirzə Məhərrəm ilə birlikdə fars dilində yazmışdır. Əsər təkcə Amerikanın kəşfi hadisəsi ilə bitmir.

Burada Xristofor Kolumbun (1451-1506) başına gələn əhvalatlar, o zamankı Amerika ərazisində yaşayan qəbilələrin ənənə və mərasimlərindən, əxlaq normalarından, coğrafi və iqlim şəraitindən geniş bəhs edilir.

Əsər sadə xalq dilində qələmə alındığından maraqla oxunur və tarixi oçerk təsiri bağışlayır.[2]

"Ümumi coğrafiya" – Çox təəssüf ki, A.Bakıxanovun fars dilində yazdığı bu qiymətli əsəri əlimizdə yoxdur. "Gülüstani-İrəm"də verilən məlumatdan aydın olur ki, alim bu əsərində dünyanın təbii və siyasi əhvalından, cəmiyyət quruluşundan, qitə və sərhədlərdən, maddələrin tərkib vəziyyətindən... bəhs etmişdir. Bakıxanovun yaradıcılığı ciddi tədqiq edildikdə aydın olur ki, müəllif ərəb dilində "Əsrarül-Mələkut"u yazarkən özünün "Ümumi coğrafiya" əsərindən müəyyən qədər istifadə etmişdir.

"Eynəl-mizan" – Məntiqə dair ərəb dilində yazılmış bu əsər də, şairin şeirlər külliyyatı kimi, son zamana qədər itmiş hesab edilirdi. A.Bakıxanovun yaradıcılığı və onun fəlsəfi görüşləri üzərində ciddi tədqiqat aparan professor Ənvər Əhmədov əsərin bir nüsxəsini Leninqrad kitabxanasında tapıb dilimizə tərcümə *etdirmişdir*. Bu əsər də

[1] 1907-ci ildə Bakıxanovun "Nəsayeh" əsəri qubalı "Məşədi Əbülqasım" adlı bir şəxsin xahişi ilə həmyerlisi Seyid Rza Mir Hüseyn oğlu tərəfindən Azərbaycan dilinə tərcümə edilmişdir. Firidun bəy Köçərli və başqa alimlərimiz tərəfindən "Nəsihətnamə" adı ilə çap edilən parçalar çox ehtimal bu tərcümədən alınmışdır. Bu tərcümənin dili ağır və müəyyən təhriflərlə dolu olduğundan əsər bu sətirlərin müəllifi tərəfindən orijinaldan tərcümə edilmişdir.

[2] *Əsərin Leninqradda və İran dövlət kitabxanasında mühafizə edilən iki əlyazması* bir-birilə tutuşdurularaq bu sətirlərin müəllifi tərəfindən Azərbaycan dilinə tərcümə edilmişdir.

"Təhzibi-əxlaq" və "Nəsayeh" əsərləri kimi ciddi fəlsəfi məzmuna malikdir. Burada xüsusilə formal məntiq məsələləri aydın şərh edilmişdir.

"Kitabi-Əsgəriyyə" – A.Bakıxanovun doğma ana dilində yazdığı bu əsər Azərbaycan ədəbiyyatı tarixində ilk povest adlana bilər. Burada iki gəncin pak və səmimi eşqi tərənnüm edilir, bu saf məhəbbətə maneçilik törədən içtimai mühit, dini ehkamlar qamçılanır. Əsər müəyyən mənada dastan şəklində qələmə alınaraq, nəsrlə nəzmin üzvi birləşməsindən ibarətdir. Qəribə burasıdır ki, A.Bakıxanovun bu əsərdə nəsr dili mürəkkəb ibarə və tərkiblərlə dolu olduğu halda, şeir dili bədii və sadədir. İsmayılbəy Qutqaşınlının "Rəşidbəy və Səadət xanım" hekayəsindən əvvəl, XIX əsrin birinci yarısında yaranmış olan bu əsərə görə A.Bakıxanovu müasir bədii nəsrimizin banisi adlandırmaq olar.

* *
*

Abbasqulu ağa Bakıxanov Bakı xanları nəslindəndir. O, 1794-cü ildə Bakının Əmirhacıyan (Əmircan) kəndində anadan olmuşdur. Sonralar XIX əsrin lap əvvəllərində Bakıxanovun atası Mirzə Məhəmmədxan xanlıqlararası çəkişmə, vuruşmalar nəticəsində Bakıdan Qubaya köçməli olmuş və yeddi yaşlı oğlu Abbasqulunu da özü ilə bərabər aparmışdı. A.Bakıxanov ilk təhsilini Qubada almışdır. O, az müddətdə ərəb və fars dillərini mükəmməl öyrənmiş və bu dillərdə bir çox kitab oxumuşdur. Bunun nəticəsi idi ki, A.Bakıxanov 1819-cu ilin sonlarında Qafqazın o zamankı baş hakimi general Yermolov tərəfindən Tiflisə çağırılaraq, Şərq dilləri mütərcimi vəzifəsinə təyin olunmuşdur.

A.Bakıxanov mədəniyyət mərkəzlərindən birisi olan Tiflisə düşdükdən sonra onun bilik dairəsi daha da genişlənir. O bu şəhərin gözəlliyini özünün "Tiflis" müxəmməsində ustalıqla təsvir etmişdir. Qüdsinin "Tiflis" müxəmməsi forma və məzmun etibarilə Molla Pənah Vaqifin "Tiflis" müxəmməsi ilə səsləşir. A.Bakıxanov məşhur Azərbaycan şairi, Mirzə Fətəli Axundovun müəllimi Mirzə Şəfi Vazeh tərəfindən yaradılmış "Divani-hikmət" adlı ədəbi məclisin iştirakçısı olmuş, şeirləşmələr (müşairələr) zamanı onun tərəfindən təqdir edilmişdir. Tiflisə gələn rus şairləri, Avropa səyyah və alimləri ilə yaxından tanış olan Bakıxanov həyata yeni bir nəzərlə baxmağa



başlayır. Qüdsi rus şairlərinin əsərləri ilə tanış olmaqla bərabər, öz şeirlərini də onlara təqdim edirdi. A.Bakıxanovun şeirləri hələ özü sağ ikən dillər əzbəri olmuş və elm-sənət sahiblərinin nəzərini özünə cəlb etmişdi. Təsadüfi deyildir ki, o zaman Tiflisdə yaşamış alman şairi Fridrix Bodenştedt özünün "Şərqdə min bir gün" adlı əsərində Mirzə Şəfi və Abbasqulu ağadan bəhs edərkən onun şairliyinə yüksək qiymət vermiş və şeirlərindən bir neçəsini alman dilinə tərcümə etmişdi. Xüsusilə "Tatar (Azərbaycan) nəğməsi" adlı şerinin rus dilinə tərcüməsi müəllifinə böyük şöhrət qazandırmışdı. Bu şeri A.Bakıxanovla yaxından tanış olan polyak şairi Lado Zablotski nəsr şəklində polyak dilinə çevirmiş və sonra o zamanlar Tiflisdə yaşayan şair Polonski polyak dilindən ruscaya yenidən nəzmən tərcümə edərək "Zakavkazskiy vestnik" qəzetinin 1847-ci il 3-cü nömrəsində nəşr etmişdi[1].

Aşiqanə deyişməyə bənzəyən "Tatar nəğməsi" şeri yüksək sənətkarlıqla yazılmış gözəl bir əsər kimi xalq arasında dillər əzbəri olmuşdu. Təəssüf ki, bu əsərin A.Bakıxanovun işləyib şair Lado Zablotskiyə verdiyi orijinalı əlimizdə yoxdur. Buna görə də onun forması haqqında fikir yürütmək çətindir.

Fridrix Bodenştedt özünün "Şərqdə min bir gün" adlı əsərində Qüdsinin "Fatma tar çalır" şerinin də gözəl nəğmə olduğunu qeyd etmişdir. Mirzə Şəfi Vazeh də bu nəğmənin A.Bakıxanova böyük şöhrət qazandıracağını əvvəlcədən xəbər vermişdi. Doğurdan da, "Fatma tar çalır" şeri öz emosional təsir qüdrəti ilə "Tatar nəğməsi"ndən heç də geri qalmır. Təəssüf ki, bu şerin də orijinalı əlimizdə yoxdur.

Şairin dunyagörüşünün inkişafında onun rus yazıçıları ilə yaxından tanışlığı əhəmiyyətli rol oynamışdır. Xüsusilə, "Ağıldan bəla" əsərinin müəllifi A.S.Qriboyedov ilə onun əməkdaşlığı, hər ikisinin yaradıcılığına müsbət təsir göstərmişdir. A.Bakıxanovun Puşkin yaradıcılığı və Puşkin ailəsi ilə əlaqəsi də təsirsiz qala bilməzdi. A.S.Qriboyedovun öz əsərlərinin ilk variantını A.Bakıxanova oxuması və onun fikrini öyrənməsi Qüdsinin hələ gənc yaşlarında çox dərin biliyə və hörmətə malik olduğunu göstərir. Təsadüfi deyildir ki, A.Bakıxanov özünün tarixi əsəri olan "Gülüstani-İrəm"i Lado Zablotski ilə birlikdə rus dilinə tərcümə etmişdir. A.Bakıxanov məşhur rus şairi Bestujev-Marlinski

[1] Polonski bu şeri bir az da təkmilləşdirərək 1851-ci ildə özünün "Bir neçə şer" adlı kitabçasına daxil etmişdir.

ilə də birgə çalışmışdır. 1833-cü ildə A.Bakıxanov Polşada çar canişini general-feldmarşal İvan Fyodoroviç Paskeviçin yanında olur. Onun himayəsi ilə daha böyük hörmət qazanır və beləliklə, Rusiyanın və Avropanın mərkəz şəhərlərini gəzir. Bir çox mədəni məclislərin qonağı olursa da, qəlbi həmişə öz doğma vətəni üçün çırpınır. Özünün "Xəyalın uçuşu" adlı poemasında şair Avropanın cah-cəlallı məclislərində qəlbinin sıxıldığını, "Vətən" deyib qürbət yerdə gün keçirdiyini və xəyalının onu doğma vətənə uçurduğunu ürək yanğısı ilə təsvir edir və nəhayət, özünün yaşadığı
"Əmsar" adlı balaca kəndi böyük şəhərlərdən üstün tutur.

A.Bakıxanov vətən həsrəti, vətən məhəbbəti ilə doğma yurda can atdığını başqa əsərlərində də təkrar-təkrar qeyd etmişdir.

A.Bakıxanov rus qoşununda hərbi xidmətdə olduğu zaman böyük qəhrəmanlıqlar göstərmiş və hərbi texnikanı dərindən mənimsəyib, bəzi mühüm tapşırıqları rəşadətlə yerinə yetirdiyi üçün dəfələrlə orden və medallarla təltif edilmiş və polkovnik rütbəsinə qədər yüksəlmişdir. Lakin hərbi xidmət onu kifayətləndirməmişdir. O, daima elmi, ədəbi fəaliyyəti özünün ən sevdiyi bir sahə hesab etmiş və ömrünün son illərini hərbi xidmətdən ayrılaraq, yaradıcılıq fəaliyyəti ilə, əsərlərini bir yerə toplayıb nəşr etmək işi ilə məşğul olmuşdur.

...A.Bakıxanov Məkkə səfərindən salamat qayıtmadı. O, 1846-cı ildə vəfat edərək, "Vadii-Fatimə" adlı yerdə dəfn edilmişdir.

* *
*

Oxuculara təqdim etdiyimiz bu kitabda şairin bütün bədii əsərləri toplanmışdır.Biz burada A Bakıxanovun şairlik istedadından, onun poeziyasının sənətkarlıq xüsusiyyətlərindən nisbətən müfəssəl danışmağı lazım bilirik.

A.Bakıxanovun şeirlər külliyyatına daxil olan əsərləri də müxtəlif vaxtlarda yazıldığı üçün məzmun etibarilə bir-birindən fərqlidir.

Qüdsi klassik Şərq poeziyasının, xüsusilə Cəlaləddin Rumi kimi böyük şairin təsiri ilə şeir yazdıqda panteizmə meyl edir, mütərəqqi rus ədəbiyyatının təsiri ilə şeir yazdıqda isə onda realist meyllər güclənir. Buna görə də A.Bakıxanovun ədəbi yaradıcılığına birtərəfli yanaşmaq olmaz. Onun istər dünyagörüşündə, istərsə bədii yaradıcılığında nəzərə çarpan ziddiyyətlər, şübhəsiz ki, şairin müxtəlif dövrlərdə müxtəlif bilik səviyyəsinə, müxtəlif əqidəyə malik olması ilə izah edilməlidir. Yaradıcılığının ilk illərində (1820-ci illərdə) yazdığı "Riyazül-Qüds" əsəri sırf dini mahiyyət daşıyırsa, 1829-cu ildə yazdığı "Mişkatül-ənvar" poemasında sufizmin təsiri ilə panteist dünyagörüşünə meyl edirsə, Azərbaycanın bir hissəsinin Rusiya tərkibinə daxil olmasından, şairin mütərəqqi rus yazıçıları ilə tanışlıqdan, Avropa mədəniyyəti ilə yaxın təmasdan sonra, XIX əsrin 30-cu illərinin əvvəllərində yazdığı "Meraci-xəyal", "Məclisi-firəngi" və başqa əsərlərində artıq yetişmiş şair kimi nəzəri cəlb edir. A.Bakıxanovun bu əsərlərində dini sxolastikadan və mistikadan əsər belə yoxdur.

Şairin dindarlığına da iki cəhətdən baxmaq lazım gəlir. Onu sırf dindar hesab edənlər möhkəm yanılırlar. A.Bakıxanovun elmi əsərlərində və şeirlərində elə motivlər vardır ki, o, dünya zövqünü xəyyamanə bir görüşlə axirət zövqünə qarşı qoyur və yaşadığı aləmdə fürsəti əldən verməməyi təbliğ edir. O, zahid, şeyx və din xadimlərinin riyakarlığını açıb göstərirdi. Dini təvəkküldə təsəlli axtarmağın əleyhinə çıxaraq, insanları öz müqəddəratını həll etməyə, həyata fəal təsir göstərməyə çağırır.

A.Bakıxanov bir şair kimi tədqiq edilərkən hər şeydən qabaq onun "Xəyalın uçuşu", "Avropa məclisi", "Ərzi-əhval" kimi avtobioqrafik əsərləri üzərində dayanmaq lazımdır. Şair özünün "Xəyalın uçuşu" poemasında səadəti uzaqlarda deyil, ancaq doğma vətənində axtarmağın lazım gəldiyini irəli sürür, ömrün mənasını xalqa xidmətdə və yaradıcı əməkdə görür. Bu əsərində şair Polşaya səfərini, Avropa məclislərini, orada olan cah-cəlalı təsvir edir. Lakin onun xəyalı bu gurultu ilə qənaətlənmir, xəyal onu vətənə aparır. Şair elm və sənətlə məşğul olub xalqa xidməti təbliğ etmək nəticəsinə gələrək əsərini bitirir. Onun "Məclisi-firəngi" adlı əsərində də baş qəhrəman yenə şair özüdür. Bu şeirdə Qüdsi Avropanın mənfi əxlaq normalarını tənqid edir. "Ərzi-əhval"da özünün daxili həyəcanlarını, eşqə, məhəbbətə sığındığını nəzərə çarpdırır.

"Mişkatül-ənvar" ("Nurlar mənbəyi") öz məzmunu etibarı ilə Nizaminin "Məxzənül-əsrar" ("Sirlər xəzinəsi") adlı poemasına orijinal bir nəzirədir. Kitabın adından da bu bənzəyiş nəzərə çarpır. Poemanın sonunda "Əməlin cəzası" adlı olduqca maraqlı hind əfsanəsi ilə bu əsərin ideya məzmununa bir yekun vuraraq, ədalətin zülm və riyaya qalib gəldiyini göstərir.

Əlimizdə olan əsərlərdən aydın olur ki, A.Bakıxanov öz vəziyyətindən razı qalmamış və zəmanədən acı-acı şikayətlənmişdir. O, "Bəyani-hal" sərlövhəsi ilə yazdığı şerində deyir:

Günəş Şərqdən tulu edib çıxan zaman səhərlər,
Ürəyimi min əzaba düçar edir qəm, kədər.
Sübh kimi köynəyimi parça-parça edib mən,
Odlu ahlar çəkirəm hey bu yanıqlı ürəkdən.

Başqa bir şerində öz zəmanəsində ictimai ədalətsizliyə qarşı çıxaraq hər şeyin öz yerində olmadığını nəzərə çarpdırır:

Bülbül ilə qarğanı gör salırlar bir qəfəsə
Fərq qoyulmur bu dünyada məhəbbətlə həvəsə.
Təəssüf ki, bu ömrümüz boşa gedir anbaan,
Nə xeyr işə sərf olunur, nə sevgiyə, ah-aman!
Zəmanə min bəla verir, ürəyimi qanadır,
Üzümdəki allıq mənim ürəyimin qanıdır.

Sonra şair öz müasirlərindən şikayətlənir. Layiqincə qiymətləndirilmədiyini, iztirab və düşüncələrini duymadıqlarını qeyd edərək yazır:

Gözlərimdən qan sel kimi axır, qəlbim dağlıdır,
Qönçə kimi könlüm dolu, dodağımsa bağlıdır.
Çox sirlər bilirəm mən, açmağasa yox imkan,
Desəm belə, bu dünyada kimdir məni anlayan?

O, ədalətsizliyə qarşı çıxaraq "Mişkatül-ənvar" əsərində "Şah necə olmalıdır" məsələsini belə həll edir:

Şahın hökmü olmalıdır xalq rəyinə müvafiq,
Elə bir iş tutmalıdır ki, olsun xalqa layiq.
Hər zalim şah ölkəsində zülmə edərsə adət,
Heç zaman xalq içində hökm sürməz ədalət.

Lakin o, şahların nəsihətlərlə düzələcəklərinə inanmadığı üçün bədbinliyə qapılır, iztirablı qəlbinə təsəlli axtarır. Qüdsi bütün dərdi, qəmi dağıtmaq üçün saf eşq və təmiz məhəbbəti gözəl vasitələrdən biri hesab edir. O deyir:



Bu dünyada şadlıq ancaq məhəbbətdə görünür,
Xoş o kəsin halına ki, eşq ardınca sürünür,
Eşqdir bu aləmləri, dərdi, qəmi dağıdan.
Ancaq onun sayəsində fərəhlənir hər insan.

Qüdsinin mənzum hekayələri də həm şəkil, həm də məzmun etibarı ilə son dərəcə maraqlıdır. Şair bu şeirlərində çox lakonik surətdə ideyalarını oxuculara aşıladır və həmişə haqqı, ədaləti müdafiə, zülmü, haqsızlığı isə ifşa edir.

Bakıxanov insan şüurunun qüdrətinə böyük qiymət verərək "Hikmətin fəziləti" adlı mənzum hekayəsində çox maraqlı bir lövhə yaradır. Burada dünyada ən xeyirli şeyin hünər və qabiliyyət olduğunu, ən yaxşı şeyin xeyirxahlıq olduğunu və ən lazımlı şeyin həqiqət olduğunu aydın boyalarla təsvir edir. Bu fikir onun "Məşvərətin şərtləri" şerində də öz əksini tapmışdır. Bu şeirdə qoca bir alim qəddar əmirə müraciət edərək düşünməməyə, qanmamağa qadir olmadığını bildirir. Şair yazır:

Şərafətə çatar insan artarsa onda şüur
İnsan idrak sayəsində günəş kimi verər nur.

"Ümidin boşa çıxması" şeri də şairin qeydə layiq əsərlərindəndir. Burada bağban Həsən şah qapısından ümid gözlədiyi halda, oradan ancaq əzab və işgəncə görür. Nəhayət o, şahın üzünə duraraq cəsarətlə deyir ki, bütün ailə üzvlərinə, qohum-qardaşına və dost-aşnasına nəsihət edəcəkdir ki, ömürlərində şah qapısından kömək və mərhəmət ummasınlar.

A.Bakıxanovun qəzəlləri də öz incəliyi və məzmunu ilə diqqəti cəlb edir. Klassik Şərq poeziyasında böyük şöhrət qazanmış Xaqani, Hafiz, Füzuli kimi ustadların qəzəl sahəsindəki ənənələrini davam etdirən Qüdsinin, indi əlimizdə Azərbaycan və fars dilində 140-a qədər qəzəli vardır. A.Bakıxanovun istər azərbaycanca və istərsə də fars dilində yazdığı qəzəllərini gözdən keçirdikdə onun ən çox Füzuli sənətindən ilham aldığı nəzərə çarpır. Füzuli ədəbi irsinin Bakıxanova təsiri onun "Riyazül-Qüds" və "Kitabi-Əsgəriyyə"sində də özünü parlaq surətdə göstərməkdədir.

A.Bakıxanovun lirik əsərlərinin əksəriyyəti, xüsusilə qəzəlləri əsas etibarı ilə azad eşqi tərənnüm edir. Lakin şairin elə qəzəlləri

də vardır ki, onlar siyasi mövzulara həsr olunmuş, dövrün ictimai vəziyyətini və şairin dövrdən şikayət səciyyəli etirazlarını ifadə edir. Məsələn:

Cahan əhli bu icz ilə özünü zənn edər sultan,
Sözü "düzlük" olar, lakin oğurluqdur işi hər an.
Sənə möhtac olan dəmdə əyər baş, qul olar, lakin
Ona düşsə işin dərhal vurar dəm kətxudalıqdan.

A.Bakıxanovun azərbaycanca yazdığı qəzəlləri içərisində "Şəklin göstərir" rədifli qəzəl şairin müasirlərinin nəzərini daha çox cəlb etmiş və bir çox görkəmli Azərbaycan şairi, o cümlədən Mirzə Şəfi Vazeh, Mirzə Mehdi Naci, Sədi Sani Qarabaği və başqaları həman qəzələ nəzirə yazmışlar.

Şairin Azərbaycan dilində yazdığı şeirləri içərisində "Bismillah" rədifli müxəmməsi də bədii xüsusiyyətlərinə görə diqqəti cəlb edir. "Bismillah" sözü burada heç yerdə dini məfhum olmayıb, bəlkə "buyur", "iqdam et", "qədəm qoy" kimi mənaları ifadə etmişdir. Bu əsər hələ 1907-ci ildə "Füyuzat" məcmuəsində[1] çap edildikdən sonra oxucuların hüsn-rəğbətini qazanmış və təkrar-təkrar nəşr edilmişdir. Bakıxanovun "Gürcülər arasında" mənzum məktubuna da "Şəklin göstərir" rədifli qəzəli kimi nəzirələr, bənzətmələr yazılmışdır. Bu nəzirələr içərisində Qasım bəy Zakir və Mirzə Ələsgər Növrəsin nəzirələri də vardır. Şairin məzmunca dərin, formaca gözəl şeirləri onu XIX əsr Azərbaycan poeziyasının görkəmli siması səviyyəsinə qaldırır.

Qüdsinin bədii yaradıcılığından aydın olur ki, o, klassik şairlərin ədəbi ənənələrini davam və inkişaf etdirməklə bərabər yeni demokratik ədəbiyyatın banilərindən biridir.A.Bakıxanovu ciddi öyrənmədən biz, Mirzə Fətəli Axundovu, Həsənbəy Zərdabini, Seyid Əzim Şirvanini və XX əsrin bir sıra görkəmli mütəfəkkir ədib və şairlərini aydın dərk edə bilmərik.

Mütəfəkkir sənətkar özünün "Xəyalın uçuşu" əsəri ilə Azərbaycan ədəbiyyatı tarixində, müasir mənada, poema janrının təməlini qoymuşdur.Ona qədər biz məsnəvi şəklində yazılmış müstəqil bioqrafik poemaya təsadüf etmirik.

Böyük şair eyni zamanda rus xalqının ədəbiyyatına dərin rəğbət bəsləmişdir. O, Krılovun "Eşşək və bülbül" təmsilini Azərbaycan di-

[1] "Füyuzat" məcmuəsi, 1907, №28



linə sərbəst tərcümə etmiş, "Yersiz iftixar", "Qurd və ilbiz", "Tülkü və qoyun" adlı alleqorik əsərlər yazmışdır.

A.Bakıxanov xalqlar arasında qarşılıqlı mədəni əlaqələrin getdikcə genişlənməsinə böyük əhəmiyyət vermişdir. Təsadüfi deyildir ki, bu meyl Mirzə Fətəli Axundov, Seyid Əzim Şirvani, Abbas Səhhət və başqa klassiklərin əsərlərində daha da güclənmişdir.

A.Bakıxanov yaradıcılığındakı ziddiyyətlərə baxmayaraq, mütərəqqi yol tutmuş və həmişə xalqın tərəfində olmuşdur. Məsələn, o deyir:

Hər kəs həqdən ol üzə, hərgiz qovuşmaz xəlqə o,
Xəlq ilə birləşsə olmaz heç zaman həqdən kənar.

Yaxud:

Hünərmi, ey Qüdsi, xəlqə əziyyət,
Mərdsənsə et xalqın dərdinə dərman.

A.Bakıxanov tüfeyli həyat sürən adamları ifşa edib, onları cəmiyyətin yaraları, namuslu əməyi isə səadətin açarı hesab edir. O, "yaradan, ruzunu da verəcəkdir" fikrini qəbul etmir. Onun zənnincə bekar duranlar "insan" adlanmağa layiq olmayanlardır. Şair "Mişkatül- ənvar" poemasında "əməksiz insan yaşaya bilməz" ideyasını yüksək səylə irəli sürmüşdür:

Əməksiz, bil, bu aləmdə iş aşmaz, ruzi bəxş olmaz,
Bizimdir hər əməl, hər iş, bizə bunlar müyəssərdir.

Şair yeri gəldikcə riyakar din xadimlərini də ifşa etməkdən çəkinməmişdir. O yazır:

.......Məsciddə xudnümalıq adət olmuş hər kəsə.
Təkəbbürlə öyünmək qəribə bir haləttdir.
Özgənin zərərində axtarar öz xeyrini,
Alçaqlıq və rəzalət onlara bir adətdir.
Hanı özündən keçib millətə xidmət edən,
Kimin işi, göstərin, vətəninə xidmətdir?!

A.Bakıxanov sənətkar şairdir. O, təşbeh, istiarə, kinayə, təzad və başqa bədii ifadə vasitələrindən böyük məharətlə istifadə etmişdir.

Şair təbiəti sadəcə olaraq təsvir etmir, canlı, real lövhəsini yaradır:

Zaman gözəl bir zamandır, gülməkdədir ilk bahar,
Güllər açmış, çəmənlərdə olmuş hər yer laləzar.
Sabah yeli vurmaqdadır gülüstana min bəzək,
Çəmənzarın simasına ənlik vurur hər çiçək:
Hər tərəfdə kef əhlindən etmək üçün bir xahiş,
Yarpağını kağız edib göndərir gül sifariş.
Bu gülşəndə bir saqidir al geyinmiş hər lalə,
Almış ələ o gül rəngli, jalə dolu piyalə.

Şair Quba almasını təsvir edərkən onun sarı və qırmızılığını kədər və sevinc rəmzi kimi qələmə alır:

Heç kəs belə alma görməmiş yəqin,
Onda ətri vardır gözəl güllərin.
Bir yanı qırmızı, sarı bir yanı,
Var idi fərəhdən, dərddən nişanı.
Aşiqlə məşuqdur guya bu sayaq,
Birləşib oturmuş qucaqlaşaraq.

Qüdsinin çox incə və mürəkkəb cinasları var. O, böyük bir məharətlə sözləri mum kimi şəkildən-şəklə salıb, ağıllı və mənalı ifadələrlə bədii ifadə vasitələri, orijinal istiarələr, mübaliğələr, kinayələr yaradır. Bircə "Sərdar" sözündən istifadə edərək, şerin hər misrasında onu başqa mənada işlədir. Bütün bunlar göstərir ki, A.Bakıxanov klassik Azərbaycan poeziyasının və əruzun bütün incəliklərini bilmiş və öz şeirlərində Xaqani, Nizami, Füzuli ədəbi məktəbinin ən müqtədir davamçılarından biri olmuşdur.

Bu kitaba Bakıxanov Qüdsinin şeirlər külliyyatına daxil olan farsca yazdığı bütün əsərlərindən başqa "Riyazül-Qüds" əsərində istifadə etdiyi şeirlərin bir qismi, müəllifin Azərbaycan dilində yazdığı şeirləri müvafiq bölmələrə əlavə edilmiş və belə şeirlərin birinci misrasının qarşısında (*) işarəsi qoyulmuşdur. Bunlardan başqa şairin "Fatma tar çalır" nəğməsi, "Qurd və ilbiz" təmsili, "Gözəl yay" şeri və altı qitəsi Lev Ginzburqun və "Tatar nəğməsi" Polonskinin polyakcadan ruscaya tərcümələrindən Azərbaycan dilinə çevrilmişdir.

***Məmmədağa Sultanov***





...Hicri 1248-ci (miladi 1831) ildə bu kiçik bəndə bakılı Mirzə Məhəmməd xanın oğlu Abbasqulu Qüdsi təxəllüs...[1] xalqların böyük adamlarının, islam, yunan və Avropa filosoflarının əsərlərindən bir qədər tədqiqat işi apararaq, öz ağlımın dərəcəsinə görə material toplayıb, bu müxtəsər kitabçanı yazmaq istədim. Hərçənd mənim elə istedadım yoxdur ki, özümün qafilliyim və nöqsanlarım göz qabağında ikən, başqalarına nəsihət verməyə cəsarət edim.

Naməlum bir şair demişdir:

"Özün bələd olmadığın məsələ barədə başqalarına öyüd vermə, çünki əvvəlcə ox kamana qoyular, sonra nişana atılar".

Lakin əgər yenə bu vasitə ilə bir azacıq mənfəət hasil olub, onun bəzi mətləbləri kamal əhlinə layiqincə, başqalarına müəyyən dərəcədə təsir edərsə, deməli, mənim səyim hədər getməmiş olacaqdır. Əgər buna da qabil olmasa, yenə bekarlıq və ya boş həvavü həvəsdə, xalqa zərər verməkdə sərf oluna bilən ömrümüz, yaxşı olar ki, elə-belə işə sərf olunsun.

Məzmuna müvafiq olaraq adını "Təhzib-əxlaq" ("Əxlaqın təmizlənməsi") qoyub, onu bir müqəddimə, bir xatimə və 12 fəslə böldüm:

Müqəddimə – Hikmət qaydaları haqqında;
Birinci fəsil – Etidala riayət etmək haqqında;
İkinci fəsil – Yaxşılığın fəziləti haqqında;
Üçüncü fəsil – Rahatlığı əldə etmək haqqında;
Dördüncü fəsil – Adətə bağlılıq haqqında;
Beşinci fəsil – Şöhrət haqqında;
Altıncı fəsil – Eşq aləmi haqqında;
Yeddinci fəsil – İşin (əməyin) faydaları haqqında;
Səkkizinci fəsil – Rəftar qaydaları haqqında;
Doqquzuncu fəsil – Təvazökarlıq qaydaları haqqında;
Onuncu fəsil – İnsaf haqqında;
On birinci fəsil – Qənaətin şərtləri haqqında;
On ikinci fəsil – Təvəkkül qaydaları haqqında;
Xatimə – Maarifin rəmzləri haqqında.

---

[1] Kitabda üç nöqtə (...) qoyulan yerlərdə ixtisar vardır (*M.S.*)

## MÜQƏDDİMƏ

## HİKMƏT QAYDALARI HAQQINDA

Nemətlərə yiyələnmək barədə düşündükdə və şeylərin həqiqətini araşdırdıqda elə bir keyfiyyət əmələ gəlir ki, gözəllik və çirkinlik onun vasitəsilə nəzərə çarpır. Beləliklə, heç bir şey insana qəribə görünməz və o, çətinliklə təsəlli tapar, öz təbiətinin qaranlığında təcəlla nuru parıldar və insan bu vasitə ilə elmi öyrənməyi və məsarifi (sərf olunan şeyləri) təhqiq etməyi bacarar və bəşəriyyətə məxsus olan həvavü həvəsi[1] özündən mümkün qədər uzaqlaşdırmağa müvəffəq olar. Bu cür təfəkkür əsl hikmət deməkdir. "Hər kəs hikmətdən xəbərdar olarsa, böyük faydalar alar" hökmünə görə hikmət insanı bu dünyada afiyətə, can sağlığına sahib, axirətin nemətinə varis edər. Sənai[2] demişdir:

"Bir elm ki, səni səndən ala bilmir
Cəhalət elə elmdən yüz dəfə yaxşıdır".

Himmətin məqsədi göy cisimlərini və onların hərəkət xətlərini müəyyən etmək deyil, bəlkə maarifi təhsil və məsrəfləri təhqiq etməkdir. Lakin bunlar xalq üçün bir təhsil vasitəsi olmaq əvəzinə bir mancə alətinə çevrilmişdir.

Müəllif[3] deyir: "Bəziləri mədrəsənin qeylü-qalından baş çıxarmayıb, cəhl və heyrət içində qalar".

Belə ki, birinin vaxtı nəhvə, o birinin vaxtı mənasız bəyana sərf olunur. Başqa birisi əsildən qafil ikən, üsulun qeydindədir; daha o birisi zəif və qüvvəsiz olduğu halda, xəbərləri araşdırmaqdadır.

Bəli, bunların hamısı bilik üzündən deyil, bəlkə adətin təsirindəndir. Çünki hər kəs hər hansı bir cəmiyyət içərisində yaşarsa, o cəmiyyətin əxlaqını mənimsər, yaxud o cəmiyyətə zidd olmaqda öz zərərini və ona yaxınlaşmaqda öz xeyrini güdər, özünü onlara bənzədər; daha burasını düşünməz ki, Allah ona idrak qüvvəsi vermiş, ağlı yaxşını yamandan seçmək üçün təyin etmişdir ki, bu vasitə ilə sair heyvanlardan üstün olub seçilsin. Yoxsa bəşəriyyətə məxsus olan bu zahiri fayda və zərəri heyvanlar da hiss edirlər. Bu baxımdan arada insanı heyvandan ayıran

[1] Nəfsin aludəsi olmaq (*M.S.*)
[2] Əsərdə adları çəkilən müəlliflər haqqında kitabın sonunda məlumat verilmişdir.
[3] Müəllif - yəni Bakıxanov özü



bir fərq qalmaz. Belə olduğu təqdirdə, əql ilə təhqiqat aparmadan, həqiqi faydalı bir ümidin nədən ibarət olduğunu, baş verə biləcək şərri göstərən qorxunun nə olduğunu və ondan nə cür qorunmağın lazım gəldiyini, bu qorunmanın mümkün ola biləcəyini necə bilmək olar? Ona görədir ki, çoxları istəklərinin nə olduğunu özləri bilmədikləri halda, onu elə bir yerdən və elə bir şəkildə tələb edirlər ki, bunu əldə etmək mümkün olmur. Əldə etdikləri nəticə arzularının əksinə olduqda, bəxtlərindən küsürlər və özgələrini bunda müqəssir bilirlər.

*Müəllif* deyir:

"Ürəyin mətləbi nədir, əgər mətləb yoxsa, kimdən şikayət edirsən? Heç kəs səbəbsiz kədərlənməməlidir"

Hamıdan pisi odur ki, Allahı xeyrin maneəsi kimi zənn edərək, "təqdirim tədbirimlə uyğun gəlmədi" – deyirlər. Bəli, bütün bunların səbəbi onların öz nöqsanlarını bilmədikləridir. Bəlkə də özlərini nadan və pis hesab etmək istəmirlər. Mənim öz halım buna misal ola bilər:

Gənclik çağlarında öz ağlıma tamamilə inanırdım, nöqsanlı olduğumu heç zaman ürəyimə gətirmirdim. Rəyimə müvafiq olmayan bir işə və ya istəyimin əksinə nəticələnən bir məsələni özgəsindən bilərək, zəmanə adamlarını təqsirləndirirdim. Hərçənd ki, onlar da günahsız deyildilər. Lakin onların günahı mənim düşündüyüm qədər deyildi. Getdikcə təhqiqatım və təcrübəm artdı, öz ağlımın dərəcəsinə şübhə etməyə başladım. Dərk etmədiyim nöqsanlarım yavaş-yavaş meydana çıxdı. Nəhayət kefimin xoş bir çağında və yabançılardan uzaq olduğum bir zamanda insafı hakim edərək, özümün xasiyyət və rəftarımı bir-bir nəzərdən keçirdim. Məlum oldu ki, mənim təsəvvürlərim puç olub, nəfsimin şəhvətimin təsiri altında imiş. Yaxşı sandığım şey mənim halıma uyğun deyilmiş. Vaxtilə zehnim və zəkam xudbinliyimə qalib gəlmiş olsaydı, bu gün peşmançılığını çəkdiyim işləri görməzdim.

Sonra ən çox güvəndiyim elmimin dərəcəsini bilmək istədim. Təhqiq etdikdən sonra elmimin zahiri işləri belə əhatə etmədiyinə təəccüb etdim. Təcrübəyə deyil, təsadüflərə və adətlərə qapılmışammış. Həqiqəti deyil, xəyalı özümə rəhbər tutmuşammış. Bir çox lüzumsuz şeyləri əldə edərək lazımlılarından xəbərsiz olmuşam. O vaxtdan ədəb və bilik əldə etmək, əxlaqı təmizləyib saflaşdırmaq və təhqiqat aparmaq üçün keçmiş adamların kitablarına əl atdım. Buradan da istədiyim tam hasil olmadı. Gördüm biri zahidliyə və şübhəyə qapılmış, başqa birisi hər şeyi inkar edərək, hətta inam və əqidənin zəruri işlərindən

belə kənarda qalmışdır. Birisi şirindilli, amma ürəyi qərəzlidir. O birisi şöhrət qazanmaq üçün özünü tərifləyir. Bunların arasında bir neçə haqq danışana rast gəldimsə, onların da sözləri maarifə və həqiqətə uyğun olduğuna baxmayaraq, aralarında elə ixtilaflar var idi və bir-birindən elə fərqlənirdilər ki, mətləbləri tutuşdurmadan və dəlilləri araşdırmadan onları anlamaq çətin idi.

Elə ki, günbəgün əhvalımı, nöqsanımı mülahizə etdim, dünyanın qabaqcıl adamlarının və xalqların böyük alimlərinin əsərlərini araşdırmağa və tədqiq etməyə başladım, onlardan bir az xəbərdar olmaqla çox faydalar əldə etdim. Həyəcan və iztirabım nisbətən yumşaldı. İndi çətinliklərin çoxundan təsəlli yolu tapmışam. Dövlətimlə sevinmirəm, çətinlikdən şikayətim azalmışdır. Bundan təsəvvür etmək olar ki, bilik və təcrübə dərəcəsi artmış olsa, nələr görərik.

Birinci fəsil

## ETİDALA RİAYƏT ETMƏK HAQQINDA

...Aləmin dövr etməsi bir-birinə tam zidd və müvafiq səbəblərə bağlı olduğu üçün heç bir işi vasitəsiz başa çatdırmaq müyəssər olmur, ona görə səbəblərdən hər birinə öz yerində riayət etmək lazımdır ki, işlərin rədd və ya cəzb olunması nəticəsində bir sabitlik və habelə şeylərin ixtilafından və cürbəcür xassələrindən bir etidal[1] əmələ gəlsin; çünki etidal olmasa, heç bir şeyin davamı olmaz. Zahiri işlərin özündə belə bu etidal gözə çarpır.

Dünyanın məhsulatı rütubətə (suya) möhtacdır, lakin həddindən artıq olsa, məhsulu zay edər. Yer kürəsinin soyuqluğu mane olmasa, günəşin hərarəti aləmi yandırar. Hər şey təbiətdə lazımi və kifayət qədər müəyyən edildiyi üçün, insana da lazımdır ki, başdan-ayağa bir aləmdən ibarət olan öz bədənində təbii surətdə təşəkkül tapmış bu qanuna əxlaq baxımından dəxi riayət etsin, bütün xislətlərdən artıq bunun qeydinə qalsın çünki yalnız bunun vasitəsilə başqalarını da islah etmək olar.

"Hər şeyin orta vəziyyəti yaxşıdır" – hökmünə görə insanın da xeyirxah xasiyyətləri bəyənilər və işi faydalı olar.

[1] Orta vəziyyət, müvazinət (*M.S.*)



...Etidal cığırından çıxan adamın işi aləmin nizamı və təbiətin xasiyyətlərinə zidd olduğu üçün, aydındır ki, zərərli olar. Təmiz xasiyyətli o adama demək olar ki, o hər işində ifrat-təfritdən[1] çəkinib, orta bir yolu özünə şüar edə və bu vəsaitə (səh. 25-ə bax).

Etidalın fəziləti o qədər aydındır ki, heç kəs onu inkar edə bilməz. Müxtəsər mülahizə etməklə məlum olar ki, xəsislik pis xasiyyətlərdən biri olduğu kimi, israfçılıq da ona bənzər bir şeydir. Həlimlik xasiyyətlərin ən yaxşısı hesab edilir, ancaq yeri gəldikdə qəzəbsiz də iş keçmir. Yaxşılıq etmək yaxşı şeydir, lakin yamanlara yaxşılıq etmək, yaxşıların haqqında pislik etmək kimidir. Hərisliyi pisləyirlər, amma tənbəllik də ondan yaxşı deyildir. Dəfələrlə təcrübədən çıxmışdır ki, etidal həddindən çıxan hər bir işin təsiri, əksinə olar. Məsələn, işrət getdikcə adət şəklini alır və axırda hər bir adi iş peşmançılığa səbəb olur. Azadlıq ifrat dərəcəsinə çatdıqda özbaşınalığa çevrilir. Şöhrətpərəstlik insana qalib gəlsə, onu öz nəfsinin qulu edər. Zehnin itiliyi fəsadlı və puç xəyallara qapılarsa, axmaqlığa çevrilər. Ehtimal və təsdiq işində olan ifrat bilik, tərəddüdə və şübhəyə gətirib çıxarar.

İkinci fəsil

## YAXŞILIĞIN FƏZİLƏTİ HAQQINDA

Aləmin hərəkət dairəsi səbəblərin varlığından asılı olduğu üçün, hər bir cüzün özünə məxsus xasiyyəti vardır və hər bir xasiyyət də bir xeyirli iş üçündür. Əgər iş məsləhətə müvafiq olsa, bu işin nəticəsi də xeyirli olar. Deməli, aləmdə olan hər şey xeyir üçün yaradılmışdır, həqiqətdə şərin vücudu yoxdur. Şər hiss olunarsa, o da xeyir üçündür. Aydındır ki, böyük xeyir xatirinə cüzi şərə yol vermək özü məsləhətli və xeyirlidir. Necə ki, ilan vurmuş barmağın kəsilməsi bütün bədəni qorumaq üçün zəruridir.

*Mövləvi* deyir:

"Dünyada mütləq pislik yoxdur;
Bil ki, pislik də nisbidir".

[1] Həddindən lap az və ya lap çox (*M.S.*)

Aləmin bütün cüzlərində, vacibəl-vücudun (Allahın – *M.S.*) zatından başqa həqiqi təsiredici bir qüvvə yoxdursa da, insana hər bir işi görmək üçün ixtiyar və bacarıq verilmişdir. İnsan bir işi görməklə savab və günah qazana bilər. Belə ki, nütfəyə aləmin nizamına uyğun olaraq mayalanmaq və uşaqlıq kisəsinə bəsləmək qüvvəsi vermiş, balanın qidası üçün heyz qanını müəyyən etmişdir. Vədə başa çatdıqda onun dünyaya gəlməsi üçün şərait yaratmışdır. Bunların hamısı qüdrəti-ilahidir. Lakin insan onun hökmü xilafına olan zinaya məşğul olduqda məsuliyyətə cəlb olunur.

Dünyada heç bir şey təbiətin ziddinə çıxa bilməz. Şeylər öz varlıqlarında gözlənilən vəzifəni icra edə bilməzlər. Lakin insan müstəsnadır, çünki o bu işi görməyə və görməməyə muxtardır. Bu səbəbdən də o həm yaxşı, həm də pis iş görə bilər. Aləmdə əsil məqsəd və həqiqi məsləhət xeyirdən ibarət olduğu üçün aləmin ən şərafətli cüzi olan insan da gərək borclarını əda eləsin və öhdəsinə düşən vəzifəni unutmasın. Həmişə yaxşılıq etməyə çalışsın və bilsin ki, əxlaqı təmizləyib islah etməkdən və maarif təhsil etməkdən məqsəd yaxşılıqdır. Çünki onsuz əməl meyvəsiz ağac kimi təsirsiz olar.

Misra:

"Bu əkin yerində yaxşılığı yaxşı ək!"

Lakin çoxları pis işi yaxşı təsəvvür edərək görür və yaxşılıq əvəzində pislik edirlər. Yaxşılıq odur ki, onda ümumun mənfəəti olsun. Belə olduğu təqdirdə ümumun mənfəəti xatirinə xüsusi zərəri qəbul etmək lazımdır. Dünyada adamların işinin çoxu qərəz üzündən olduğundan hər faydalı işə yaxşılıq və hər bir zərərli nəticələnən işə yamanlıq demək olmaz. Adamların yaxşı işlərinin çoxu yamanlıqdır. Çünki bir nəfərə yaxşılıq etməklə min nəfərə zərər yetirir. Bu ona bənzəyir ki, soyuq dəymiş adamı isitmək üçün elə bir od qalayalar ki, o oddan bir şəhər alışıb yana. Belə olduqda, lazımdır ki, hər kəs özünün bütün işlərini və hərəkətlərini insaf gözü ilə mülahizə etsin: başqasına yamanlıq etmək fikrində olan adama yaxşılıq etsin. Çünki birisi başqasını bir işə sövq edirsə, o işi özü görmüş kimidir. Çox vaxt olur ki, bir nəfər günahkarın halına acıyaraq və ya öz mənafeyi ucundan qanunla cəzaya layiq olan adamı xilas edir və sevinib deyir ki, bu gün mən yaxşı iş görmüşəm. Daha orasını bilmir ki, bu vasitə ilə o başqa cinayətkarlara da cəzadan xilas olmaq ümidi vermiş bir günaha batmışdır.



Günahkarın bağışlanmasına vasitəçilik etmək ümumun asayişini pozan ən pis hərəkətdir.

Günahkarın haqqında vasitəçilik edən şəxs iş sahibini ya zalım bilir və ya onu günaha batırmaq istəyir. Cəza yersizsə-zülmdür, haqdırsa müqəssirə cəza verməmək günahdır və başqalarının tüğyanına səbəb olur.

Bağışlamaq əxlaqın ən gözəlidir. Lakin bu bağışlamaqdan zülm doğmamalıdır. Bir günahsızın haqqında açıqdan-açığa zülm edildikdə xalq həyəcana gəlib zalım haqqında deyər ki, filankəs nə pis iş gördü. Lakin günahkarı məlum səbəbə görə bağışlarlarsa, onu tərif edərlər, amma bilməzlər ki o qədər təəssüfə səbəb olan zülm yalnız bir nəfər haqqında idi; lakin onun tərif olunan əfvi başqalarını günaha müşviq edir və bu isə min nəfərin haqqında zülm deməkdir. Yaxşısı budur ki, bir nəfərin cəzalandırılması ilə min nəfər rahatlansın. Şəxsi qərəzlə iş görən adama və ya əvəzini nəzərdə tutub yaxşılıq edənə yaxşı demək olmaz, çünki bu, alverə bənzər və öz malını başqa bir şeylə əvəz etmək kimidir.

*Naməlum bir şair* deyir:

"Əvəzini umaraq yaxşılıq etmək hünər deyildir.
Yaxşılığı möhtac olmadığın adama et!"

İnsan etdiyi yaxşılığı yadına saldıqca elə bir zövq alır ki, heç bir dövlət ona çatmaz; pis iş tutmuş adam isə əməlini düşündükcə xəcalət çəkər. Pis işin səbəbi əməlini büruzə verməzsə də, batində daim özünü məzəmmət edər və onun cəzasının qorxusundan asudə olmaz.

İndi bir nəfər yaxşı və bir nəfər də pis iş görən adamın halını müqayisə edək. Əvvəlincinin əhvalında sakitlik və fağırlıq, çətinliklərə təsəlli və işlərinin vəziyyətində intizam müşahidə edilər. Ona bir hadisə üz verdikdə çoxları onun köməyinə gələr, yardım göstərə bilməsələr də, onun dərdinə şərik olub təəssüf edərlər. Hətta düşmənləri belə, onun haqqını inkar edə bilməzlər. Əksinə olaraq, nalayiq iradəli və alçaq tədbirli bir şəxs həmişə bəd əməlinin aşkara çıxacağından qorxur və bir müsibət üz verdikdə iztiraba düşər. Ehtiyac qarşısında hər cür alçaqlığı qəbul edər. İqtidarlı olduğu zaman təkəbbürlə özünü öyər və başqalarına zülm edər. Bir bəlaya düçar olduğu zaman isə tənə və məlamətdən başqa bir şey eşitməz. Özünə dost bildiyi adamlar ondan

üz döndərərlər, kömək əvəzinə ona töhmət vurarlar. Çünki onun dostları da özü kimi adamlardır.

İnsaf gözü ilə baxsaq, görərik ki, birincilər ikincilərin əlində məğlub olduqları halda belə, yenə qalibdirlər. Heyf o adama ki, yaxşılığı bacarır, lakin etmir: halbuki insan yaxşılıq etdikdən sonra haqlı şükrə layiq olur: başqaları ilə bir səviyyədə ikən onların nemət vericisi olur.

O xoşbəxt adama eşq olsun ki, Allahlıq sifətilə şöhrətlənə və bu tükənməz dövlətdən üz döndərməyə.

Ü ç ü n c ü  f ə s i l

## RAHATLIQ ƏLDƏ ETMƏK HAQQINDA

Hər kəsin gördüyü işdən gözlədiyi – sağlamlıq və rahatlıqdır. Lakin xalqın bilik və ənənəsi nöqsansız olmadığı üçün bir çoxları rahatlığın nə olduğunu və onun hansı vasitələrlə əldə ediləcəyini bilmir. Rahatlıq özlüyündə yaxşılıqdan ayrı deyildir. Çünki bu iki sifəti ələ gətirməyə çalışan şəxsə əxlaq gözəlliyi üçün sağlam təb, şeylərin həqiqətindən xəbərdar olmaq üçün ağıl və bilik, ifrat və təfriti aradan qaldırmaq üçün ədalət, maneələri rədd etmək üçün isə himmət və iradə lazımdır.

Rahatlıq haldadır, malda, dövlətdə və rütbədə deyildir. Əgər rahatlıq rütbədə olsaydı, gərək hamıdan artıq böyüklərdə olaydı. Halbuki rütbə və malın artması ilə zəhmət və ehtiyac da artır.

Rahatlıq insanın öz halından razı olmasından ibarət olduğu üçün hər kəs hər hansı bir mənsəbdə və ya peşədə olur-olsun rahatlığı əldə edə bilər. Mümkündür ki, bir kəndli bağında əhli-əyalı ilə şadlığa məşğul olsun. Bu onun üçün rahatlıqdır. Padşah isə məmləkətində ixtişaş olduğu üçün haman saatda dərd çəksin. Şadlıq müxtəlif hallarda təsəvvür oluna bilər. Məsələn, elə ola bilər ki, xəstə üçün xəstəlik zamanında, fəqir üçün əliboş olduğu vaxtda və məhbus üçün zindanda yatdığı zaman şadlıq üz versin. Bu şadlıq onlar üçün rahatlıqdır.

*Müəllif* deyir:

> "Ürəyim bənddə də olsa, bu halından narahat deyildir.
> Xoş halına o əsirin ki, əsirliyindən şaddır".

Rahatlığın yüksək dərəcəsi etidaldır. Belə ki, maddi çətinlik ixtişaş, pərişanlıq və məyusluğa səbəb olduğu kimi, təmtəraq da ehtiyaca



və kədərə səbəb olur. Lakin biz qafil olduğumuzdan asayişi dövlət və həşəmətin çoxluğunda görürük. Onun əldə edilməsi üçün lazım olan çətinlik və ehtiyaclardan xəbərsizik.

*Müəllif* deyir:

> "Şadlıq əldə etmək səbəblərinin fikrini etmək tükənməz bir qəmdir. Bu dairədən uzaq olan ürək şaddır".

Xülasə, adam gərək elə etməsin ki, öz tayları ona qibtə etsin, eyni zamanda özünü o yerə yetirməsin ki, onların nəzərində xar olsun. Hər bir böyük və kiçik iş üçün orta bir hədd vardır ki, bütün hallarda bəyənilən və rahatlıq axtaranlar üçün zəruridir. Rahatlığa lazım olan şərtlərin başlıcası qəlbin sakitliyidir ki, dünyada baş verən hadisələr onu iztiraba salmasın. Doğrudan da, rahatlıq qazanmış adamı nə kimi hadisə iztiraba sala bilər? Biz həmişə özümüzdən yüksək adama baxaraq onun zahirini düşünüb özümüzü bədbəxt hesab edirik. Bu doğru deyildir. Bu hərəkətdən vaz keçməliyik və özümüzdən aşağı olanlara baxmalıyıq. Öz həmcinslərimiz arasında özümüzdən fəqir və bədbəxtlərə çox rast gələ bilərik. Belə olduqda şikayət deyil, şükür və şadlıq etməliyik. Özümüzün həqiqətən bədbəxt olub-olmadığımızı düşünməli və bu bədbəxtliyə özümüzün, ya başqasının səbəb olub-olmadığını aramalıyıq. Madam ki, dünyada hər vəziyyətdə müdara etmək mümkündür, nə üçün etməyək və nə üçün işi lazımi qaydada görməyək. Halbuki, dünyada həqiqi bədbəxtlik yoxdur, bu adi təsadüfdür. Arzumuz əhval və vəziyyətimizə uyğun gəlmədikdə isə bədbəxtlik deyirik. Həqiqi bədbəxtlik odur ki, adam müsibətə tab gətirməyərək özünə təsəlli yolu tapa bilməsin. Bizə üz verən hər cür müsibətin iki səbəbi ola bilər. Yəni ya özümüz, ya başqası ona səbəbdir. Özümüz səbəb olmuşuqsa, başqalarından deyil, özümüzdən şikayət etməliyik. Özümüz səbəb deyiliksə, onda ola bilsin ki, onun nəticəsi xeyirlidir. Çox zaman böyük bir xeyirdən ötrü insana kiçik zərər toxunur və bu zərərin ona məsləhət olub-olmadığını heç özü də bilmir.

*Müəllif* deyir:

> "Çox vaxt olur ki, pis hesab edilən işlərdən yaxşılıq doğur. Yoxsa Azər nəslindən bütləri qıran necə çıxa bilərdi?!"[1]

---

[1] Məkkədə bütləri qıran İbrahim peyğəmbərə işarədir. O, Nəccar Azərin oğlu idi (*M.S.*)

İnsaf gözü ilə baxsaq, görərik ki, sənə üz verən müsibətdən daha pisi vardır. Sənin üçün çox pis keçən gün, mümkündür, azı yüz min nəfər üçün daha pis keçsin. Əgər onlar sənin vəziyyətində olmuş olsaydılar özlərini xöşbəxt sayardılar. Əgər bir azacıq səbr etsən, halın təğyir tapar, çox çətin işlər, şübhəsiz, asanlaşar, müsibətlə, yaxud işrətlə keçən gündən yalnız xəyal qalar. Lakin fərq burasındadır ki, şadlıq günü yada salmaqdan təəssüf və küdurət doğar, müsibət gününün keçməsindən şadlıq hasil olar.

Maraqlı burasıdır ki, bəzi adamlar aləmdə baş verən hadisələrin çoxunu özünə nisbət verərək, deyirlər ki: – "Görürsənmi mənim bəxtimdəndir; gəmiyə minən kimi tufan qopdu və ya filan hadisə üz verdi. Bunların hamısı taleyimin müsaid olmadığındandır, zəmanə mənimlə saz deyil". Bu olduqca yanlış fikirdir, biçarə düşünmür ki, o nəçidir və onun vücudunun nə qiyməti var ki, onun səbəbindən aləmin dövranında bu cür ixtilaflar əmələ gəlsin. Bu umumtəbiətin tələbindən əmələ gəlir, onun o arada olub-olmamasının əhəmiyyəti yoxdur.

*Naməlum bir şair* deyir:

"Dəryanın özünə görə dalğalanması vardır.
Çör-çöp elə bilir ki, dəniz onunla çəkişir".

Rahatlıq istəyən adam gərək öhdəsinə düşən lazımi vəsaiti sahmana salmağa səy etdikdən sonra işlərinin nəticəsini Allahın hikmətinə həvalə etsin və pozğunluqdan, möhnətdən başqa faydası olmayan intizar və iztirabdan saqınsın. Gəmi dənizdə zədələndikdə içində olanların hamısı qorxuya düşür. Çox zaman iztirablı adam özünü itirib xilas olmaq üçün çarə tapmaz və ya qorxudan vaxtından əvvəl özünü ölümə verir.

*Müəllif* deyir:

"Aşiqin səbirli olması yaxşıdır çünki,
Tutulmuş quş çapaladıqca, tora daha da möhkəm bənd olar".

Lakin sağlam adam özünü itirməyərək, bir taxta parçasından yapışıb, özünü dənizin gurultulu dalğaları içərisinə atar, bəlkə də xilas olar, xilas olmasa da, qorxu və peşmançılıq nəyə lazımdır. Ölüm adi bir işdir.



*Müəllif* deyir:

"Canandan canıma gələn həyat və ya ölüm qəbulumdur,
Bunların hər biri öz yerində yaxşı nemətdir ".

Daha qorxmaq nəyə lazımdır?! Ölüm – yaxşılıq etmiş adamı bu dünyanın əzabından xilas edib, daha yaxşı yerə aparar, pis iş görən adamı isə ömrünün sonrakı müddətində pis əməllər etməkdən xilas edər.

Amma diri ikən ölüm axtarmaq, ölüm ayağında həyat axtarmaq sağlam düşüncə və qanunun əksinədir və bu, iztirab əlamətidir.

*Müəllif* deyir:

"İztirab faydasız cəhd etməyə səbəb olur,
İş öz qaydası ilə gedəcəkdir..."

Dördüncü fəsil

## ADƏTƏ BAĞLILIQ HAQQINDA

Avam adamların idrak və mərifətlərinin yüksək dərəcəsi təqliddir. Onlar heç bir halda təqliddən kənara çıxmağa qadir deyillər. Etdikləri hər cür təhqiqat və təfəkkür zirəklikdən deyil, adət üzündəndir. Məsələn, bir ölkənin əhalisi öz məmləkət və millətinin qayda-qanunu və yaşayış yollarını bəyənir, başqa məmləkətin əhalisi isə özü üçün bambaşqa adət və qanun seçdiyindən, onu bu səbəbə görə töhmətləndirirlər. Qəribə burasıdır ki, hər iki tayfa haqlı olduğunu iddia edərək öz adətləri ilə fəxr edir.

Bir çox işlər bir tayfanın yanında yaxşı hesab olunur. Məsələn, itə, pişiyə və başqa heyvanlara itaət edənlər Allahın birliyinə inanan adamı kafir və yanlış yolda hesab edirlər. Dəlil və sübutlara diqqət etmələrinə baxmayaraq, öz nöqsanlarını bilməzlər. Bunların hamısı göstərir ki, adamların işləri təhqiq və tədqiq deyil təqlid və təsdiq etməkdən ibarətdir. Onların dəlilləri, təhqiq etmək işi də adətə uyğun olan təsəvvürlərdir.

*Sənai* deyir:

"Öküzü Allah bilib ona inanırlar,
Amma Nuhun peyğəmbərliyinə inanmırlar".

Deyirlər, Sokrat vəfat etdiyi zaman demişdir ki, xalqın etimadı elmədir, mənimki isə cəhlə. Bəli, adamın cəhalətinə qəti dəlil onun elmə inanmağıdır. Tarix kitablarının müəllifləri müxtəlif tayfaların zülm və qəbahətli işlərindən çox şeylər yazmışlar və onları fəxrlə təqdim edərək, onun əksinə getməyi ar bilmişlər. İndi isə biz təəccüb edirik ki, insanlar necə olmuş ki, bu işlərin pisliyindən xəbər tutmuşlar? Bizim əsrimizin özündə belə İranda adət olan şey Avropada qəbahət hesab edilir. Avropa qitəsində bəyənilən iş isə ərəb ölkələrində bəyənilmir. Hətta bir ölkənin özündə də almanları ingilislər bəyənmirlər və ispaniyalıların adətini fransızlar qəbul etmirlər. Hələ avam camaat kənarda dursun, kamal sahibləri də təqliddən əl çəkə bilmirlər. Zahidliyə əsir olan şəriət başçıları, vacib şeylərdən başqa, ehtiyatla hərəkət edib, heç bir şeyin puçluğunu qəbul etmirlər.

*Müəllif* deyir:

"Bir çox bilikli adamların düşüncələri, öz fəzilətlərinə baxmayaraq, bu işdə avamlarınkından da qüsurludur".

Məgər qədim alimlər insan üçün havada uçmağın mümkün olacağına inanırdılar? Halbuki, biz buxar qüvvəsi ilə havaya qalxanları görürük. Kim bilir, bundan sonra dünyada nə kimi kəşflər olacaqdır. Nücum elmini inkar edənlər Yer kürəsinə ən yaxın cism olan Ayın təsiratına inanmırlar. Onlar deyirlər ki, bir səma cismi ki, Yer kürəsindən əlli bir min üç yüz əlli üç millik məsafədə ola, bizə nə təsir edə bilər? Halbuki, Buştenin[1] sübutları ilə məlum olmuşdur ki, bitkilərin bitməsindəki gecikmə və sürət Ayın tam (bədr) halında olması və naqisliyi ilə bağlıdır. Dənizin mədd və cəzri[2] də Ayla əlaqədardır. Qadın tayfasının damarlarında qan axınının əmələ gəlməsinin də səbəbi Aydır[3].

Bu qayda ilə hər şeyin təbiətində bir keyfiyyəti və hər işin bir xasiyyəti vardır ki, onu işlərə sərəncam verən dünyanın bərqərar olması üçün müəyyən etmiş və onun hikmətini puç xəyalətdən və pozucu düşüncələrdən gizlətmişdir. Lakin dünyada olan şeylərin hamısı yaranmışların ən şərafətlisi olan insan üçün yaradılmışdır. Ona istəyinə yetmək üçün elm və bilik vasitəsilə bu örtülü sirlərdən mümkün

[1] XVIII əsrin axırı və XIX əsrin əvvəllərində yaşamış fransız nəbatat alimi (*M.S.*)

[2] Dənizin qabarıb-çəkilməsi

[3] Aybaşı (heyz)



qədər xəbardar olmaq bacarığı vermişdir. Bunu hamı bilir. Lakin düşünüb tapanlar, elm və əməlin faydalarını əldə edənlər çox azdır.

Bizim biliklərimizin çox nöqsanlı olduğunu və həvavü-həvəsimizin həddini aşdığını bildikdən sonra insan gərək öz bilik və etiqadına tam arxayın olmasın, işin dal-qabağını dərin düşünmədən ona əl atmasın: əqli təhqiqatlarını dünyanın böyük adamlarının və xalqların görkəmli alimlərinin rəyləri ilə tətbiq etsin və ümumi faydasına olan işi qəbul etməkdən utanmasın. İndi ki, bizim heç bir işimiz təqlidsiz deyildir, heç olmazsa, pisliyə və zərərə səbəb olan əmək deyil, ümumun faydasına səbəb olan iş təqlid edilsin

*Naməlum bir şair* demişdir:

"Allahı seçə bilən gözün yoxsa,
Barı öküzpərəst olmayıb, günəşpərəst ol!"

### Beşinci fəsil

## ŞÖHRƏT HAQQINDA

Dünyada vəziyyəti və məişəti yaxşılaşdırmaq şöhrət üçün, eləcə də başqalarının bizim haqqımızda yaxşı fikirdə olması üçündür. Bu səbəbdəndir ki, bir çoxları bir-birinin haqında yaxşılıq və ehtiram qaydalarını gözlədiyinə baxmayaraq, bu sifət həddindən aşsa, insanın düşgünlüyünə səbəb olar və gözəl əxlaq tədricən korlanar, öz işləri və əməllərində həmişə təşvişdə olar. Çəkinmək və habelə şöhrət düşgünü olmaq nəhayət peşmançılığa səbəb olar: etidal dərəcəsini gözləmək isə insanı öz mətləbinə çatdırar.

Tutaq ki, istedadlı adamların fikri haqqımızda yaxşıdır. Lakin müxtəlif rəylərə möhtac olan bir iş haqqındakı fikrin nə davamı ola bilər? Bir nəfərin iftira və uydurması onu poza bilər. Madam ki, hər kəsin bir cür rəyi vardır və şeylərin keyfiyyətini hər kəs bir cür mülahizə edir və özünün biliyinə, düşüncəsinə görə bu keyfiyyətə inanır, çox ola bilsin ki, bir nəfər öz nadanlığı üzündən birisini tərif etmək əvəzinə pislər və başqalarının nəzərində çox pis, nöqsanlı olan sifətləri, özü bəyəndiyi üçün, özlərinə nisbət verir: lakin həmin bu sifətlər başqalarının nəzərində çox pis və nöqsanlı sayılar. Başıaşağılığa səbəb olan və ağıllılar yanında bəyənilməyən rəylərdən çəkinmək lazımdır.

Belə olduqda, insan şöhrət qeydinə qalmayaraq, öz insanlığının tələbi ilə iş görməlidir. Bir para adamların yanında mərdümazarlıq zirəklik, pislik etmək fərasət, hiylə işlətmək məharət hesab olunur; bir paraları da, ola bilsin ki, belə adamlar irad tutmasın deyə, onların töhmətinin qorxusundan yaxşı iş görməkdən vaz keçər. Lakin abırı, yaxşılığı şöhrətdən üstün tutan şəxsin yamanlığına danışanların tənəsindən qorxusu olmaz, bəlkə də yaman danışanlar onun paxıllığını çəkərlər. O, pisliyinə danışan adamdan iki cəhətdən xoşhal olar: əgər o, qabil adam deyilsə, onun özünə tay olmadığını bildiyindən, əgər qabilsə öz nöqsanından xəbər tutub, onu islaha çalışacağından şad olar. Pis danışanların sözlərinə çox da fikir vermək yaramaz. Hamıya məlumdur ki, insan pis danışanların tənəsindən can qurtara bilməz çünki onlar, heç olmazsa, bu və ya başqa bir işə irad tutacaqlar: bəlkə də yaxşıya yaman deyəcəklər. Məlumdur ki, ən ağıllı hesab edilən peyğəmbəri də bəzən ağılsız hesab etmişlər.

Bir çoxları hikmətə bağlı və hər bir halda məsləhətə müvafiq olan hadisələri və aləmin intizamını öz rəylərinə düz gəlmədikdə bəyənmir. Mümkün etsələr, hətta Allahın özünü belə məlamət edər və ona irad tutarlar. Beləliklə, camaatın rədd və ya qəbulu insanı öz işindən geri qoymamalıdır. Bununla belə məlum rəftar və hərəkətinin, adət və ənənələrinin mümkün qədər ziddinə olmamağa çalışmaq lazımdır. Çünki hər şey xalqın adət ənənələrinə zidd olduqda xalq ondan çəkinər və xeyirli iş görməyə bacarığı olmaz...

*Dəfələrlə təcrübədən keçmişdir ki, şöhrətpərəstlərin tərəqqi etməsi* çətindir. Çünki insanın özü qürrə səbəbindən işdən qalar və başqaları paxıllıq və ya başqa qərəzlər üzündən ona mane olmaq istərlər. Belə olduqda, insan öz fəzilətini başqalarının paxıllığına səbəb olacaq dərəcədə göstərməməlidir və ya mübahisə işlərin təhqiqi zamanı birisini o dərəcədə rüsvay etməməlidir ki, onun nadanlığı oradakıların hamısına məlum olsun. Bu hal ona ağır gəldiyindən kininə səbəb olar və onda ədavət doğurar. Bir çoxları danışıqda qalib gəlməyi özlərinə fəxr bilir və buna nail olmaq üçün səy göstərirlər. Daha maraqlısı budur ki, bir çoxları ictimai və təbii elmlərdən tamam-kamal xəbərsiz olduqları halda, məclislərdə öz fəzilətini nişan vermək üçün qəribə bir söz deməyə və ya anlaşılmaz sözlərlə mübahisə açmağa fürsət axtarırlar. Çox zaman birisi özünü məlumatlı göstərmək üçün özündən çox bilikli adamla mübahisəyə girişər və bununla özünün nadanlığını büruzə verər.



Altıncı fəsil

## EŞQ ALƏMİ HAQQINDA

İnsanın xasiyyəti iki cürdür: biri təbiətin verdiyi fitri xasiyyət, o biri isə sonradan kəsb edilən xasiyyətdir ki, elm və adətlər səbəbilə əmələ gəlir. Fitri xasiyyəti rədd və ya qəbul etmək çətindir. Əgər mümkün olsa da bunun üçün çox əziyyət və zəhmət çəkmək lazımdır. Sonradan kəsb edilən xasiyyəti isə ilk vaxtlarda az bir səy ilə rədd və ya qəbul etmək mümkündür: Lakin getdikcə bu kəsb edilmiş xasiyyət möhkəmlənir və məcazda elə kök salır ki, fitri xasiyyət kimi olur: buna ikinci fitri xasiyyətdir – deyiblər. İnsan təbiətinin başlıca mənəvi tələbi eşqdir. Heç kəs eşqsiz ola bilməz. Ancaq dərəcələri vardır. Dünyadakı nizam və intizam da eşqdəndir, ya eşqin özüdür. Çünki eşqsiz heç bir şey var ola bilməz və onsuz heç bir iş irəli gedə bilməz. Bu sifət məcazların, təbiətin maddələrinin müxtəlifliyindən, bilik dərəcəsi və adətin təkrarından asılı olaraq bir neçə şəkildə meydana çıxır:

Birinci, meyldir ki, bütün təbiətdə – üç aləmin hamısında, hətta cəmadatın və nəbatatın özündə baş verir. Məsələn, dəmirin maqnitə, samanın kəhrabayla meyli və s. kimi.

İkincisi, ünsiyyətdir ki, bu da mütləq heyvanlara məxsusdur. Ünsiyyət meylin yüksək dərəcəsidir ki, uzun müddət içərisində əmələ gəlir. Məsələn, bir heyvan cinsiyyət səbəbindən, yaxud başqa bir səbəbə görə özgə heyvanla ünsiyyət tapır. Belə ki, onunla görüşməkdən zövq alır və onu itirəndə kədərlənir.

İnsan yaranmışların kamili olduğu üçün onun ünsiyyəti də başqa heyvanlarınkından daha mükəmməl olur.

Üçüncü, həvayi-nəfsdən ibarət olan həvəsdir, yəni insanın təbi, təbiətin xassələri və adətin tələb etdiyi hər şeyi əqli-təhqiqat aparmadan həvəsə tərəf çəkər. Bu xasiyyət isə məsələn, yüyürmək, sıçramaq, qışqırmaq, yemək-içmək, yuxulamaq, cinsi əlaqədə olmaq və sairə kimi ehtiyacları təmin etmək bütün canlılara məxsusdur. Lakin insana xüsusi istedad verildiyi üçün onun həvəsinin üstünlüyü də məxluqatın sair növlərinə nisbətən daha yüksək dərəcədə olur. Eşq də ifrata vardıqda "onlar heyvan kimi, bəlkə də heyvandan daha azğındırlar" ayəsinə görə, beləleri yaranmışların ən alçağı olur. Lakin insan ağlın ayırd edici qüvvəsi ilə nəfsani həvavü-həvəsə tədricən qalib gələ bilər

və özünü əsl insan mərtəbəsinə yetirər. Belə olduqda "biz bəni-adəmi əziz yaratmışıq" hökmü əsasında tükənməz feyzlərə çatıb, ilahi sifətləri özündə büruzə verir.

Dördüncü, şövqdür ki, bu da yalnız insana məxsusdur. Başqa heyvan növləri bundan məhrumdur. Şövq elə bir şeydir ki, insanı xoşuna gəldiyi və ondan bir fayda gözlədiyi işə, istər düşüncə, istərsə adət üzündən rəğbətləndirir. Doğrudan da, şövq məqsədə çatmaq üçün verilmiş elə bir nemətdir ki, onsuz insan öz istəyinə çata bilməz. Şövqün elə qüvvəsi vardır ki, təkmilləşdiyi halda bütün maneələri aradan qaldırar, hər kəsi öz qüvvəsi daxilində olan məqama çatdırar. Şövq hər bir halda işə yarayar. Elm və hünər qazanmaq da ona bağlıdır. Günah və pis işləri görmək yenə onun vasitəsilə olur. Lakin şövq təbin istəyindən və mənfəət arzusundan doğduğu üçün insan onu, yaxşını pisdən ayırd edən əqlin vasitəsilə fəsadlı niyyətlərdən çəkindirər və ədəb, maarif və gözəl xasiyyətlər qazanmağa yönəldə bilər.

Beşincisi, məhəbbətdir ki, o da ünsiyyətin ən yüksək mərtəbəsidir. O, ürəyin sevməsindən əmələ gəlir. Sevgi də iki qismdir:

Biri xalq arasında adət olmuş dostluq və rabitələr yolu ilə ünsiyyəti davam etdirmək, ya maraq və mənfəət ümidilə zövq alınması nəzərdə tutulan mal və rütbəyə bağlı olmaq kimi, ikincisi – təbiətin tələbi üzrə övlad və qohum-qardaşa bəslənən məhəbbətdir. Bu xasiyyət bütün təbiətdə mövcuddur. Biz bu əlaqəni heyvanlar arasında da görürük. Çünki onsuz dünyada hər növ nəsil kəsilərdi. Həmin bu əlaqə insanın evlənməsinə və bu evlənmənin davamlı olmasına səbəbdir. Ünsiyyət və onun yüksək dərəcəsi olan məhəbbət də cinsiyyət əxlaq və adətin uyğunluğundan əmələ gəlir. Uyğunluq olmazsa, məhəbbət ola bilməz. Məsələn yaxşı adamla pis adamın və ədalətli adamla zülümkar adamın arasında məhəbbət əlaqəsi ola bilməz. Habelə ağıllının dəli ilə və insaflı adamın alçaq adamla dostluğu tutmaz. Demək olar ki, hər kəsin əxlaqının necəliyini onun dostlarının əxlaqından öyrənmək olar.

"İnsanın dostu onun əqlinin dəlilidir" dedikləri kimi, onun dostluğa qəbul etdiyi adamlar əxlaq və ədəbcə özünün tayı olacaqlar.

Altıncı eşqdir. Eşq məhəbbətin ən yüksək dərəcəsidir. Məhəbbət ifrat dərəcəyə çatdıqda insana elə bir hal üz verər ki, onun ürəyi başqasının xəyalından azad olar. Varlıq və yoxluq onun üçün bir olar. Bu vəziyyət iki halda əmələ gələr:



Birincisi, tədricdir ki, bir nəfərin məhəbbəti, surətinin və ya xasiyyətinin gözəlliyi səbəbindən müəyyən vaxt içərisində ürəyində yerləşən və bu məhəbbət görüşmək və ya xəyalına salmaq yolu ilə tədricən artar.

*Müəllif* deyir:

> "Xatirin meyli yavaş-yavaş yüksələrək sevdaya çevrilər:
> Qətrə-qətrə yığılar, axırda dəniz olar".

O birisi fövri məhəbbətdir ki, bir gözəlin sürətini görməklə və ya bir təsadüf səbəbilə eşqin sultanı ürək mülkünü elə işğal edər ki, nə təsəvvür etməyə macal, nə də hiddətlənməyə imkan qalar.

*Möhtəşəm* deyir:

> "Eşqin sevgilisi elə bir hərifdir ki, imkan taparsa,
> Əlini Əzrailin qanına boyayar":

Eşq ruhun tələbidir. Təbiət aləmində ruhlarla ünsürlərin arasında xüsusi bir rabitə olduğu üçün, maddələrin mahiyyəti və xasiyyətlərin tələbi səbəbindən vücuda eşq naqis və kamil ola bilər. Eşq hisslər vasitəsilə həm qafil, həm də ayıq ola bilər. İşin başlanğıcında eşqimizin kimə olduğunu və ondan nə əldə edəcəyəmizi düşünməliyik. O, əqlə batan və məqbul olarsa, əsl xoşbəxtlikdir.

*Sədi* deyir:

> "Eşq insanlıqdır, o səndə yoxdursa,
> Yeməkdə və yatmaqda heyvanla şəriksən":

Belə olmadığı təqdirdə heç olmazsa onun zərərini mümkün qədər düşünmək lazımdır: çünki eşq ürəkdə möhkəmləndikdə bütün hissləri və xasiyyətləri özünə qul edər və əql üçün tədbir görməyə macal qalmaz.

"Eşq bir oddur ki, özündən başqa hər şeyi yandırar" – dedikləri kimi, aşiqin gözünə də məşuqdan başqa heç nə görünməz. Həkimlər eşq dərdi üçün dərman tanımamışlarsa da, lakin gördüyümüz kimi, eşqin ilk dövründə müxtəlif işlərlə məşğul olmaq və başqaları ilə əlaqə və rabitə saxlamaq, şəhvəti öldürmək və ya şəhvəti söndürmək vasitəsilə onun odunu sakitləşdirmək mümkündür.

Təbin məşuqdan başqa şeyə meyli olmadığına baxmayaraq, onu məcbur etmək lazımdır ki, getdikcə başqa işlərə adət etsin və eşq odu tədriclə sönsün.

Xülasə, nə cür olur-olsun, eşq zahiri zərərlərlə nəticələnsə də, tərifə layiqdir.

*Müəllif* deyir:

"Mişk qoxulu zülfün ətrindən başımız ağrısa da,
Həmişə başda bu ağrı olsa yaxşıdır":

Eşqdən hasil olan saysız-hesabsız mənfəətlərdən başqa, yalnız bunu qeyd etmək kifayətdir ki, eşq insanı bütün alçaq xasiyyətlərin mənşəyi olan dünyanın qeydindən azad edər və aşiqin başında məşuqun xəyalından başqa bir xəyal qoymaz.

*Yəğma*[1] deyir:

"Bir gözəlin zülfünün kəməndi
Boynumu bir tükə bağlayaraq elə çəkdi ki,
Yüz zəncirimi qırdı"

Məşhur məsəldir deyərlər: "Dərd bir olsa, əlacı çətin deyil". Məcazi olsa da eşqin zövqü bir həqiqətdir. Çünki can verməyin çətinliklərini aşiq üçün yüngülləşdirər və təbini məşuqdan başqa nə varsa, hamısını unutmağa öyrədər. "Məcaz həqiqətin körpüsüdür", dedikləri kimi, o, həqiqi eşqə yolgöstərici olar.

Axırda o məqama çatar ki, aşiqə özünü unutdurar. Doğrudan da, eşq budur və bütün bu təriflər, göstərdiyimiz yollar və vəsilələr onun üçündür.

*Müəllif* deyir:

"Mən məhəbbəti ona görə alqışlayıram ki, bu şadlıq məclisinin badəsindən başqa, bütün nəşələrin hamısının ardınca bir xumarlıq vardır".

Məqsədimiz əxlaq və ədəbdən bəhs etmək olduğu üçün məcazi eşq məsələsindən kənara çıxmadıq.

[1] Bu şairin adını orijinalda "Nəima" da oxumaq olar (*M.S.*)



Yeddinci Fəsil

## İŞİN FAYDALARI HAQQINDA

Ziddiyyətlərin toplandığı mərkəz olan bu aləm səbəblərin varlığı, yəni onların cüzləri arxasından xüsusi rabitə ilə bağlıdır. Bütün bu ziddiyyətlər xasiyyət cəhətindən müxtəlif olmalarına baxmayaraq, ixtisas cəhətdən ayrılmazdırlar.

*Qasim Ənvar* deyir:

"Bu yolda cüz" və küll bir-birinə möhtac olmuşlar:
Bir hörümçək peyğəmbərin pərdədarı ola bilər.

Yer üzünün padşahı və cüzlərin ən şərəflisi olan insanın bu maddələrə ehtiyacı hamıdan artıqdır. Çünki burada ünsürlərin imtizacından bəşəriyyətin rəmzi olan bədənin tərkibindən, nəfəsin istəkləri və insanlığa xas olan bilik və görüşdən mənfəət əldə etmək və onların yollarını seçmək məsələsi meydana çıxır. Sonra bir çox növlər də onlardan doğulur. Onların hamısı ümumiyyətlə və xüsusi olaraq gah bir-birilə bağlı və gah da ayrıdırlar. İnsanlar şəkil və simaca bir-birindən fərqli olduqları kimi, əxlaqca da müxtəlifdirlər. Dünyada iki nəfər tapılmaz ki, onların əxlaqi bir-birinin eyni olsun, hər kəsin hər işdə ayrı cür rəyi vardır. Hər kəs eyni bir şeyi müxtəlif şəkildə görür. Lakin bu ixtilafı bilik vasitəsilə aradan qaldırmaq olar. Bu mümkün olmadıqda, onları tutuşdurmaq lazımdır ki, ortalıqda əlaqə yaransın və ehtiyacların dəf edilməsinə səbəb olsun. Ehtiyac üzündən olan bu əlaqəyə məişət qaydası deyirlər. Hər bir şəxsin özünəməxsus xasiyyəti olduğundan ona lazım olan səbəblər də mövcuddur. Fərq batini fəzilətlərdə və zahiri rütbələrdədir. Aləm nizamının özü də bunu tələb edir. Çünki bərabərlik ehtiyacsızlıq deməkdir, belə olan təqdirdə mümkün qədər (çox) varlanmağa nə ehtiyac var?

*Müəllif* deyir:

"Aşiq rüsvayçılıqdan, zahid isə pəhrizkarlıqdan əl çəkə bilməz,
Hərənin müəyyən bir məşğələsi (peşəsi) vardır".

Biz bunu bilmədiyimiz halda Allaha irad edərək deyə bilmərik ki, nə üçün filan şeyi belə etmişdir, filankəsə belə vermişdir. Madam ki, biz Allahı hikmət sahibi bilmişik daha ona etiraz etmək yeri qalmır.

"İncil"də yazılmışdır ki, küzəqayıran qabları cürbəcür işlərdə işlətmək üçün müxtəlif şəkillərdə qayırır. Görək gil qab qayırana deyə bilərmi ki, sən niyə məni bu şəkildə düzəltdin? "İncil"in on ikinci babında yenə də qeyd olunmuşdur ki, əgər bədənin hamısı göz olsaydı qulaq harada olardı? Əgər hamı qulaq olsaydı iyi necə duymaq olardı? Allah bədəndə olan hər üzvü istədiyi kimi yaratmışdır. Əgər hamısı bir üzv olsaydı, o zaman bədən olmazdı. Üzvlər çoxdur, bədən isə birdir. Göz ələ deyə bilməz ki, mənim sənə ehtiyacım yoxdur. Habelə, bu sözü baş ayaqlara deyə bilməz. Ən zəif hesab edilən üzv ona verilmiş kəramət sayəsində başqa üzvlərin ehtiyacını rəf edir. Bir üzv ağrıdıqda bütün üzvlər ağrıyır. Habelə, şadlıqda da bütün üzvlər şərikdirlər. Buradan anlaşılır ki, aləmdə olan bütün şeylər bir bədən hesabında olub bir-birinə möhtacdırlar. Belə olduqda növlərin və üzvlərin hər biri öz yerində lazım görünür.

*Möhtəşəm* deyir:

"Gülə gözəl iy və gilə can verən,
Hikmətlə hər kəsə özünə layiq şey vermişdir".

Hər kəs dolanacağını, iradə və ətvarını ümumun məsləhətinə mütabiq etməlidir, elə iş görməməlidir ki, ondan ləkələnsin. O həmişə özündən gözlənilən məsləhəti özgələrinə verməlidir.

Xülasə, aləmin nizamı səbəblərin varlığına bağlı olduğu üçün səysiz və çalışmadan heç bir iş mümkün olmaz. Əməllərin nəticəsi Allahın hikmətinə bağlıdır, "insan üçün səydən başqa bir şey yoxdur" – ayəsinə müvafiq olaraq insan çalışmalıdır. Şumlanıb əkilməyən yerdən taxıl bitməz. Çalışmadan buğda təmizlənməz və ondan da un və çörək hasilə gəlməz. Deməli, bir çörəkdən ötrü nə qədər insanın işlədiyini düşünmək lazımdır. Cismani və ruhani mənfəətlər dünya və axirətin xeyri ilə bağlıdır. Fəzilətlərin başlıcası və tükənməz dövlət olan elm də iş vasitəsilə əldə edilər və işə yarayar.

*Sənai* deyir:

"Elmsiz iş, şoran yerə səpilmiş toxum kimidir.
Əməlsiz elm, diri-diri basdırılmış adam kimidir".

İnsanın qazandığı hünər və sənət heçə çıxmaz. Bir vaxt gələr ki, gərək olar.



Maraqlı burasıdır ki, bəzi adamlar işləmədən deyirlər ki, Allah istərsə verər. Daha bunu bilmirlər ki, Allah hər kəsə hər nemətin imkanlarını verməklə, o nemətin özünü də ona vermişdir. Lakin o özü çalışmadığından o neməti əldən vermişdir. İşləmədən, çalışmadan Allahdan nemət gözləmək özünü sərgərdanlıq zəncirinə bağlamaq deməkdir: çünki müstəhəq olmayan adama bəxşiş vermək-günahı bağışlamaq kimidir.

İşdən can sağlığı, bilik və təcrübə hasil olar: məişətin və axirətin səvabı iş vasitəsilə əldə edilər. İşdən boyun qaçıran adam ümum aləmin nizamını pozmuş və bu səbəbdən Allahın hökmünün xilafına iş görmüş olur. Dəfələrlə sınanmışdır ki, fitnələrin çoxu işsizlikdən törənir, tənbəllik zahirdə böyük eyiblər kimi nəzərə çarpmasa da, əsl həqiqətdə hamısından pisdir. Çünki tənbəl adam yaradılışın səbəblərindən qafil olmuşdur. Onun varlığında gözlənilən xeyir puç olur. Onun məişəti başqalarının boynunda ağır yük olur. O, cansız cismlərdən də pisdir. Çünki daş və palçıq, heç olmazsa, tikinti işlərində gərək olur.

Qədim millətlərdən biri olan Afina tayfasının qanununda tənbəllərə başqalarının kəsb etdikləri maaşın hissəsini oğurlayanlar kimi baxaraq, onları ölüm cəzasına məhkum edirdilər. Tənbəllik insanın təbiətində kök salarsa onu işdən qoyar; sonra getdikcə bədənin səlamətliyini və zahiri hissələri pozmağa yol tapar. Cismani xassələr ruhun xassələri ilə bağlı olduğu üçün batini hisslərə də xələl yetirər və bunun nəticəsində tərəddüd və məcaz süstlüyü əmələ gələr. Təbin (məzacın) əqli dəlillərlə bir işə əzm və qəsd etməyə və o işi tamamlamaq üçün ciddiyyətlə çalışmağa qüvvəti olmaz, hər işdə şübhəli və qorxaq olar. Nəhayət, öz yaşayışından təngə gələr: çünki qorxaq və hürkək adam yaşayış ləzzətindən məhrum olur.

Tənbəlliyin səbəblərindən başlıcası qarınqululuq və ya can bəsləməkdir. Nəfsin həzzi və cismani ləzzətlər məzacda adət şəklini alarsa, insan onun əsiri olar, onları tərk etməkdə çətinlik çəkər; bunun nəticəsində də ciddi işlərə başlaya bilməz və mətləbinə çatmaq üçün cürbəcür alçaq sifətləri özünə qəbul edər. Məsləksizliyi, yalan və hərzə danışmağı özünə adət edər və nəhayət, bu alçaq sifətlərin zərərini çəkər. Məsləki olmayan adama heç kəs inanmaz. Müsibətə düçar olduğu zaman, ya bir şeyə ehtiyacı olduğu halda heç kəsdən kömək görməz. Əksinə, məslək sahibi həmişə möhtərəm olar. Düşmənlərin özləri də onu böyük sayarlar. Onu tanımayanlar onunla dost olmağa çalışarlar.

Yalan danışmağa adət edən adam tez rüsvay olar və çox ehtimal ki, onun doğru sözünə inanmazlar. Xalq onun söhbətindən qaçar, töhmətindən çəkinər, o da başqalarını özü kimi bilərək ona deyilən doğru sözə inanmaz. Şübhə və tərəddüdün çoxluğundan bir halda qərar tapmaz. Lakin düzlüyə adət etmiş adam təşviş və qorxudan həmişə arxayın olar, doğruluğunun məlum olacağı ümidi ilə təsəlli tapar. Həqiqət "haqq söz acı olar" – məsəli kimi çox zaman təbə xoş gəlməyə bilər; zahirdə məsləhətin ziddinə görünər, lakin həqiqətdə isə məsləhətli olar.

Müddəi adam işin həqiqətindən xəbər tutduqda, zahirdə, xudbinliyindən özünün anlamadığını boynuna almasa da, ürəyində onun doğru olduğunu təsdiq edir. Həqiqət dərman kimi acı da olsa, faydalıdır.

Bir filosof deyir ki, "böyüklərə sözün ancaq doğrusunu de, qəbul etməsə də cəza görməzsən". Necə ki, deyiblər: "Həlak olmaq yalançılıqda olduğu kimi, nicat tapmaq da doğruluqdadır"

Doğru söz qəbul olunmadıqda, ya ondan zərər göründükdə susmaqdan başqa çarə yoxdur. Ona görədir ki, çox zaman susmağı danışmaqdan faydalı hesab ediblər. Danışmaq məhz hikmət olsa da, lazım gəldiyi yerdə danışmamaq məsləhətdir, habelə danışmaq lazım gəldiyi yerdə susmaq da zərərdir. Belə olduqda, insan danışmaq və susmağın yerini bilməlidir. Danışmaqda tələsməməli. Çünki hələ deyilməmiş sözü demək olar. Lakin deyilmişi geri qaytarmaq olmaz. Deyib peşman olmaqdansa, gec demək məsləhətdir.

Danışmaq qaydaları da müxtəlifdir. Eyni bir mətləbi müxtəlif şəkillərdə demək olar. Elə demək olar ki, qulaq asana kobud və ya mülayim görünsün. Aydındır ki, hərzə danışmaq məzacın süstlüyündən əmələ gəlir. Çünki hərzə danışan adamın yaxşını yamandan seçmək qabiliyyəti möhkəm olmaz, deyilməməli sözü deməkdən özünü saxlaya bilməz. Bir çoxları üçün ən qorxulu cəhət elə budur. Çünki ürəyin sirlərindən xalqın xəbəri yoxdur və bir şəxsin niyyətini qısa müddətdə əməlindən öyrənmək olmaz. Onun yaxşı-yamanını və işdəki ixtilafı söz vasitəsilə məlum etmək olar.

*Mövləvi* demişdir:

> "Böyüklər bunun üçün demişlər ki,
> Dünyada insanın rahatlığı dilini saxlamaqdadır".

Xülasə, əgər hərzə danışmaq insanların təbiətində kök salsa, getgedə onda söz gəzdirmək, eyb axtarmaq və özgəsinin pisini axtarmaq



adət şəklini alar. Çox vaxt birisi özgəsinin eybini danışmaq və arada söz gəzdirmək vasitəsilə başqa birisi ilə yaxınlaşmaq istər. Daha orasını bilməz ki, o bu hərəkəti ilə öz batininin pisliyini açıb meydana qoyur. Bu sifətin adət üzündən olduğu məlumdur. Söz yox ki, o adamın da eybini özgələrinə deyəcəkdir. Bir çoxları özgənin pisliyini danışmağı özlərinə şüar etmişlər, bunu özlərinə bir növ fəzilət sayırlar. Adamın dalınca pisinə danışaraq üzdə ehtiram və mehribançılıq edirlər. Daha bilmirlər ki, bu hərəkət onların alçaq olduqlarını göstərir. Məlumdur ki, bu hərəkət, yəni batinin ziddinə olaraq zahirdə özgə cür rəftar etmək, qorxu ya ehtiyac üzündəndir.

## Səkkizinci fəsil

## RƏFTAR QAYDALARI HAQQINDA

Dostluqdan ibarət olan gözəl rəftar-ləzzətlərin ən yaxşısıdır. Hələ onun başqa faydaları kənarda dursun, dostların görüşündə heç bir nemətdə misli görünməyən bir zövq vardır. Dost, ürəyin darıxdığı vaxt sənə munis və müsbətində şərik olar, maddi cəhətdən çətinlik çəkdiyin zaman sənin əlindən tutar. Çətinliyə düşdikdə xilas olmağın üçün çarə axtarar. Nöqsanlarından və eyblərindən səni xəbərdar edər və cürbəcür nəsihətlərdə səni pis işlərdən saqındırar. Daha bundan yaxşı nə ola bilər. Demək, xoşbəxt o adamdır ki, dostları çoxdur.

Sənan deyir!

> "Dostları az olan adamı pis adam bil,
> Ondan daha pis o adamdır ki, dostu ola, lakin dosluğunu tez unuda".

Əksinə, zərərin mayəsi olan və peşmançılıqla nəticələnən düşmənçilik elə işdir ki, düşməni görməklə və ya ürəyində kin bəslədiyin bir nəfəri yada gətirməklə əhvalın dəyişir, ovqatın təlx olur, təbiətin asayişini pozan bir qəm əmələ gəlir. Tutaq ki, düşmənə qalib gəlmisən və ona zərər yetirməyi bacarırsan, ancaq düşmənin tez-gec fürsət tapıb vurduğun zərəri əvəzində azaçıq da olsa, sənə zərər yetirməyəcəyini haradan bilirsən? Bu fürsətlə hər iki tərəf zərərdə bərabərdir. Beləliklə birinə kələk qurmaq üçün sərf olunan vaxt puça çıxır. Fərz edək

ki, düşmənin zəif və arxasızdır. Nədən bilirsən ki, onun dostları və ya köməyinə gələ biləcək qüvvətli adamlarla əlaqəsi yoxdur? Hələ bu bir kənarda dursun, dəfələrlə görünüb ki, xeyli zəif bir düşmən sultanların şövkətini dağıtmışdır. Ağıllı adam həmişə özünün danışıq və rəftarının qaydalarını diqqətlə mülahizə etməlidir. Elə etməlidir ki, o, başqasının əziyyətinə səbəb olmasın, özgəsi tərəfindən görülən işi özünə pis sandıqda, o işi başqalarının haqqında da rəva görməsin, dostlarına kömək, düşmənləri ilə müdara etsin. Çox zaman dostlar təblərinə xoş gəlməyən iş üstündə düşmən olurlar, istədiyi bir şeyi verməmək xatirinə min yaxşılığı unudurlar. Eyni zamanda düşmənlər də sənin rəftarının gözəlliyi və işlərinin yaxşı vəziyyətdə olması səbəbindən səninlə dost olmaq istəyirlər. Bununla belə, insan dostluğu ifrat dərəcəsinə çatdırmamalı və sirlərini açmaqla öz ixtiyarını özgəsinə tapşırmamalıdır; çünki dostu onunla düşmən olduğu vaxtda onu aciz edə bilər. Düşmənçiliyi o dərəcəyə çatdırmamalıdır ki, bir gün o düşməni dost olduqda insan etdikləri pislikdən xəcalət çəksin. Nəfsani qərəzlər üzündən olan dostluğun o qədər də davamı olmaz və ehtiyac rəf olan kimi pozular. Lakin öz rəftarının gözəlliyi ilə xalqın məhəbbətini qazanan adama nisbət dostluq daimi olar və ehtimal ki, düşmənlər onun haqqında insafdan keçməzlər.

Dostluğun şərtlərini bilmək məsələlərin ən mühümüdür. Çünki insanların bir qismi cürbəcür məqsədlərə və vəziyyətin tələbinə görə dostluq iddiası edirlər. Lakin doğrudan-doğruya əsl dostluğu bacaran adamlar çox azdır.

Xülasə, insan özünü dostluğa qabil hesab etmədikcə, başqalarından dostluq umması səhvdir.

Xalq arasında olan dostluq üç cürdür:Əvvəlincisi, müdara qaydasının məhşur səbəblərinə görə, rəsmi təarüflərdən ötrü olan dostluqdur. Belə dostla elə o cür də rəftar etməli, özündən razı salmaq üçün təarüflər mərasimini unutmamalıdır.

İkincisi, zahiri mənfəətlər əldə etmək üçün olan dostlardır. Belə adamla da elə o cür rəftar etməli, özündən razı salmaq üçün istədiyini verməli.

Üçüncüsü, bilikli və dünya vəziyyətindən yaxşı xəbərdar olduğu üçün həqiqi dost axtaranların dostluğudur. Bu cür dostluq az tapılar. Lakin belə dost ələ düşərsə, onun yolunda mal nədir, bəlkə candan da keçmək olar.



Xülasə, hər halda bilikli adamla dost olmaq məsləhətdir. Bilikli adam işin axırını, vəziyyətin necəliyini düşündüyü üçün həmişə ədəb qaydalarını və işin yaxşılığını gözləyir. Əksinə, heç bir şeydən xəbəri olmayan nadan adam çox zaman gördüyü işi faydalı xəyal hesab edərək, elə iş görər ki, ondan xeyir deyil, zərər baş verər. Öz işinin xeyrini bilməyən adam özgələri üçün nə edə bilər? Bəli, yaxşı demişlər: "Ağıllı düşmən agılsız dostdan yaxşıdır". Səninlə dostluq etmək istəyən bir adamın qərəzi olub-olmadığını və dostluq adını öz məqsədinə çatmaq üçün alət edib-etmədiyini həmişə nəzərdə tutmalısan. Çox vaxt düşmən səni aldadıb zərərə salmaq niyyəti ilə dostluq iddiası edər və ya zəifdirsə, qüvvət əldə etmək üçün fürsət gözlər.

*Müəllif* deyir:

"Paxıllıq bir çox əzizləri yüksək mərtəbəsindən quyuya salmışdır. Qardaşın da olsa özgəyə arxalanma"!

Bir çoxları vardır ki, öz qərəzlərinin səbəbindən sənə xoş gələn sözlər deyərlər, ya ayrı cür tərif və xoş sözlər deyər və ona da insanlıq adı verərlər. Deyərlər ki, bəli, filankəs nəcib nəsildəndir, ya kamalı və hünəri vardır və ya onunla köhnədən qohumuq. Belə deyildir, bəlkə onlar bu sözlərlə öz fikirlərinin üzərinə pərdə çəkirlər. Dünya əhlinin bir qismi bu cürdür, möhtac olduqda sənə ibadət etməyə çalışar, sən ona möhtac olduqda Allahlıq iddiası edər. Mən özüm bunların hamısını müxtəlif hallarda təcrübədən keçirmişəm.

*Sənai* deyir:

"Mən adamlardan heç bir vəfa görməmişəm,
Sən görsən, məndən ona salam söylə!"

Demək, insan başqalarının ona göstərdiyi hörmətin öz qabiliyyətinə görə olduğunu düşünməlidir. Bu cür hiylələrdən xəbərdar olmalıdır. Hər şeydən artıq insanı şirin sözlər aldadır. Böyüklərin və əmirlərin çoxu bu dərdə mübtəladır. Bəli, nə yaxşı demişlər:

Misra:

"Hər kəsin xoşuna gələni dedim, xoşuna gəldim".

Hər kəsin "dostam!" – dediyinə inanma! Ola bilsin ki, onun da bir dostu var və o dost sənin düşməninin dostudur. Aşkara çıxarılması zərərli olan sirrini "filankəs düz adamdir və mənim xeyirxahımdır, onu

saxlar" – deyə heç kəsə demə. Bir halda ki, özün öz sirrini saxlaya bilmirsən, daha özgədən nə umursan?! Haradan bilirsən ki, o da həmin bu gümanla sənin sirrini öz dostlarına deməyəcəkdir?

Dunya malına və rütbəyə vurulmuş adamla dostluq etmək yaramaz. Çünki belə adam zərurət vaxtında insanlığın bütün şərtlərini pozar. Əksinə, xasiyyətində yaxşılıq və mürüvvət olan adamın təbiəti həmişə dostluğa meyl edər. Onun düşmənçiliyi də möhkəm olmaz. Çünki onun düşmənçiliyi vaxtın tələbinə görədir.

Lakin zatında rəhmsizlik və zalımlıq olan adamın təbi düşmənçiliyə tərəf meyl edər, başladığı dostluq da davamsız olar. Dəfələrlə təcrübə edilmişdir: təvazökar, səxavətli və xoşəxlaq adamın həmişə dostu çox olmuşdur.

Təvazöyə gəldikdə bir çox insanlar xudpəsəndlik toruna kiriftar olduqlarından təvazö gördükdə xoşhal olar, dostluq edərlər. Əksinə, təkəbbürlü adama hamı nifrət edər və ondan gözlənilən faydadan da əl çəkərlər.

Səxavətə gəldikdə dünya əhli fayda əldə etmək düşkünü olduğundan xeyir və mənfəət ümidi görsə ixtiyarsız onun tərəfinə meyl edər və bəzən istədiyi faydanı əldə edə bilməsə də elə ümidlə də kifayətlənər. Əksinə, xəsis adam mal bağışlamaq istəsə də, insanların çoxu ona inanmaz və çarəsizlik üzündən bağışladığını düşünərlər.

Əxlaq gözəlliyi haqqında demək lazımdır ki, bu xasiyyət hər kəsdə fitri olarsa, onun dostu çox olar. Çünki o səbəbsiz heç kəsi incitməz özünün başqası tərəfindən incidilməsinə də çox fikir verməz ona güzəşt edər: Əksinə, bədməcazdan xalq əziyyət görər. Beləsini razı salmaq çətindir: o, səbəbsiz olaraq xalqı incitməyə başlar, xalq da o bədməcazə düşmən olar.

Dostluq əlaqələrinin nəticəsi xeyirli olsa da yaman ilandandan da yaman olan pis yoldaşın söhbətindən saqınmaq lazımdır. Buna görə də demişlər ki, "səlamətlik təklikdədir". Ondan sənə yetişəcək cürbəcür zərərlər bir kənara dursun, bu kifayətdir ki, onun təbinin xəsisliyi ünsiyyət dolayısı ilə sənə təsir edər və əxlaq gözəlliyi tədricən səndən zail olar.

*Sənai* deyir:

"Pis adamlarla az əyləş, yoxsa pis olarsan.
İnsanın təbi (başqasından) xasiyyət götürəndir".



Lakin işləri səbəblərin varlığına möhtac bildiyimizdən rəftar qaydalarında müdaranı da gözləmək lazımdır.

Heç kəs xalqın içərisindən kənara çıxaraq ona möhtac olmaya bilməz. O, hətta yad, aşna, dost və düşmənlə də əlaqə saxlamalıdır: elə rəftar etməlidir ki, müxtəlif məzaclara müvafiq ola bilsin və düşmənin şərindən salamat qalsın.

Müdara qaydasının ən yaxşısı ağla və sədaqətə riayət etməkdir. Ağlın tələbi ilə başlanan iş xeyirlə nəticələnər. Məsələn, ağlın tələbinə müvafiq olan bir iş görsən, onu tamamlamağa vaxt müsaidə etməsə də, heç olmasa səni "iş bilən adam idi" – deyə yada salarlar. Əksinə, ağlın ziddinə iş görən adam bir nəticə əldə etmiş olsa da, camaat deyər ki, bəxti gətirdi, yoxsa bu iş onun işi deyildi.

Doğru demişlər: ağıllı adam həmişə möhtərəmdir. Düzlüyündə nəticəsi əzab deyil, xeyirdir. Düzlük heç vaxt ağıldan ayrılmaz. Çünki ağıl axırı pis nəticə verən işdən çəkindirər və nəticəsi xeyir olan düzlüyü tələb edər. Buradan məlum olur ki, saxtakarlıq axmaqlığa dəlalət edir. Əgər desələr ki, "saxtakar ağılsız olduğu halda insanı heyrətə salacaq vasitələri necə əldə edə bilir?" – cavab verərəm ki, alimlər və filosoflar ağlın yaxşını pisdən seçmək qüvvəsinə malik bir şey olduğuna, heyvanların isə ağıldan məhrum olduğuna hökm etmişlər. Halbuki, biz heyvan növündə elə hərəkətlər müşahidə edirik ki, o hərəkətlər insanın təəccübünə səbəb olur. Məsələn, tülkünü birə basdıqda ağzına bir dəstə ot götürərək, quyruğunu yavaşca suya batırır. Birələr sudan qorxub yuxarı sıçrayırlar. Əvvəlcə bədəninin bir hissəsini, sonra da tədricən hamısını bir qayda ilə suya batırır. Bədəndəki birələr ağzında sudan kənarda tutduğu ota yığılırlar. Tülki bu zaman birdən başını suya batırıb ayrı yerdən çıxır və beləliklə birələrin hamısı ot dəstəsi ilə suyun üzündə qalır. Bu cür hiylələr çox müşahidə olunmuşdur. Bunların hamısı ağıldan deyil, bacarıqdandır. Hiyləgərin işi də bu cürdür.

Əgər desələr ki, "ağıl hər bir halda işlənən bir alətdir və insanda nəfs tuğyan etdikdə nəfsin tələbi üzrə ağıl da ona sərf olunur." – ona cavab olaraq deyərəm ki, nəfs tuğyan etdiyi zaman ağla qalib gəlirsə də, bu qələbə anidir. Sonra yenə ağıl onun əməlinin pisliyini məlum edər və əməl sahibi tez peşman olar. Lakin saxtakarın əməli daimidir və onu özü üçün fəzilət sanır.

Əgər desələr ki, "saxtakar öz hiyləsini çox ustalıqla və məharətlə işlətdiyini güman edərək heç kəsin onu anlamayacağına inanıb, nəticəsinin *pisliyindən də qorxmaya bilər*" – *cavab verərəm ki, bu mətlə-*

bin özü axmaqlığa dəlalət edir. Ağılı özünə rəhbər bilən adam bu qədər adamın içində özündən bilikli heç bir nəfərin olmadığını necə təsəvvür edə bilər? Onun öz biliyinə inanması da cəhalət əlamətidir.

Xülasə, hər bir saxtakarın axmaqlığı sabit olduğu üçün, düzlüyün ağıldan ayrılmaz olduğuna şübhə qalmır.

*Sənai* deyir.

> "Sənin hiylənin yolgöstəricisi olan düşüncəni ağıl hesab etmə.
> O sənin nəfsindir.
>
> Ağlı nəfsdən seçib tanı,
> Ta ki köklüklə şişi bir-birindən seçə biləsən"

"Habelə, müdara qaydası hər kəslə onun istedadına görə rəftar etməyi tələb edir. Xalq arasında "Xalqın biri kimi ol!" – misalınca hamı ilə yola getmək lazımdır.

Biz əxlaqın hər növünə möhtacıq. Elə vaxt olur ki, nadan ağıllı adamdan artıq işə yarayır. Özünü heç kəsə möhtac olmayan kimi güman etmək yaramaz, heç bir düşməni həqir sanmaq olmaz. Elə vaxt olur ki, kiçik işdən böyük fitnə qalxır və güman edilməyən bir yerdən müşkül həll olunur. Cüzi işlərdə mümkün qədər özünü sadə və geniş ürəkli göstər. Lakin böyük işləri gizli saxla, hər kəsin əməlindən vaxtlı-vaxtında xəbərdar ol. İmtina et, zahirdə özünü elə göstər ki, guya ona etimadın var, lakin elə olmasın ki, səni tamamilə qafil bilsin və bəlkə bu üzdən öz inamını puç etsin və səni zərərə salsın. Öz işlərinin hamısını özün et və ya onun icrasında gözün olsun, onları tamamilə başqalarının ümidinə qoyma, çünki heç kəs sənin mənfəətini öz mənfəətindən artıq istəməz, hər kəs öz səliqə və biliyinə uyğun olaraq işlə özü istədiyi kimi məşğul olur. Ona görə də hər kəs sənin işini sənin istədiyin kimi görə bilməz.

Bununla belə, böyük işlərdə köməkçi hökmən lazımdır. Tək adam başqasının köməyi olmadan bütün işləri görə bilməz; əksinə, cüzi işlə məşğul olmaq səbəbindən böyük işlərdən qafil olar. İşlərin cüzi cəhətlərini ürəyin qızdığı adamlara tapşır, özün isə hamısına göz yetir. Əgər bir nəfər bütün işləri görə bilsəydi, onda əmir və sultanlara vəzir və vəkil lazım olmazdı.

Aləmi yaradan, özünün kamil qüdrətinə baxmayaraq, işlərin icrasını səbəblərin varlığına bağlı etmişdir. Lakin köməkçilərini elə özbaşına sərbəst buraxma ki, onlar təkəbbür və tuğyan edə bilsinlər: həm



də cüzi işlərdə o dərəcədə əlaqəsiz göstərmə ki, xəyanət və etinasızlıqla nəticələnib sənin peşmançılığına səbəb olsun.

İşlərin başlıcası adamların istedadını bilməkdir. Hər kəs adamları ləyaqətinə görə seçib işə təyin etsə, o işi şəxsən özü gördüyü kimi hesab edə bilər. "Filan iş filan köməkçinin hünəridir" deyəcəklərindən ar etməməlidir və hər bir yaxşılığı və gözəl xidməti əvəzsiz qoymamalıdır. Çünki bu, başqalarının da bu işə rəğbətinə səbəb ola bilər. Habelə, müqəssirləri də cəzalandırmaq lazımdır ki, başqaları görüb çəkinsinlər. Bütün işlərin yamanlığı sübuta yetməyincə onları yaxşılığa yoz və günahsızlığını isbat etmək üçün lazım olan hər bir vasitəni nəzərə al! Çünki çox vaxt olur ki, bir iş təhqiq edildikdə, o işin baş verdiyinə inanılır və sonra məlum olur ki, həmin məsələ başqa cür olmuş və təsəvvür edildiyi kimi deyilmiş. Ümumun xeyrinə zidd olmayan günahdan, sübut olunmuş olsa da, vaz keç! Xüsusən, düşmənə qalib gəldikdən sonra onun təqsirindən keç! Bu işin faydası çoxdur. Əvvələn, düşmən o halətdə səndən mürüvvət gördükdə sənin əxlaqının gözəlliyindən və özünün tərsliyindən utanar. İkinci, başqa düşmənlər də cəzadan əmin olaraq sənə qarşı müqavimət göstərmək fikirindən əl çəkərlər. Üçüncü, mürüvvətli adam xalq arasında əziz olar və yaxşı ad qazanar. İntiqam almaq istəyənə qalibiyyət haramdır. Bir adamın haqqında yaxşılıq etdikdə, yaxşılığı kinayə və məsxərə ilə aşkara çıxarma, çünki minnət qoymaqla yaxşılıq puç olar: xoşhallıq əvəzinə düşmənçilik əmələ gələr.

*Naməlum bir şair* demişdir:

> "Mərd odur ki, bir anbar qiymətli köhvər bağışladıqda
> Onun minnət yükü qarışqanın da belini sındırmasın"

Sənin başqaları haqqında etdiyini və başqalarının sənin haqqında etdikləri pisliyi danışmaqdan saqın: çünki danışdıqca o təzələnər.

Aqil adamlar "üzrü təzələmək, günahı yada salmaqdır" – demişlər. Hər kəslə danışdıqda danışmaq fürsətini ona ver, özün isə zərurət məqamında danış. Çox zaman ən hiyləgər bir adam söz danışan zaman səhv edərək ürəyində kini açıb deyər və səni işin keyfiyyətindən xəbərdar edər. Sən də çox danışsan, onun kimi olarsan.

*Baba Əfzəl* demişdir:

> "Əvvəldən sənə iki qulaq və bir dil vermişlər,
> Yəni iki dəfə eşit, bir dəfə danış!"

Hər kəslə görüşdükdə onunla məsləhətləş, lakin gizlədilməsi lazım gələn şey haqqında danışma. Sənin faydan ondadır ki, bəlkə ondan bir yaxşı söz eşidəsən. Çox vaxt olur ki, ağılsız adam ağıllı söz danışır və düşmənin sənin xeyrini söyləyir. İşin məsləhəti sənə məlum olsun deyə başqalarının dediklərini ağlınla ölç. Əgər məsləhətə müvafiq bir söz eşitməsən heç olmasa o adamın ağlının dərəcəsi və ya ürəyinin sirri sənə aşkar olar. Adamların söz və işlərinin onların istedad və bilik dərəcələri nəzərdə tutmaqla demək olmaz ki, filankos ağıllıdır, bu işi görməz və ya o, ağılsızdır, bunu bacarmaz. Çox zaman ağıllılardan elə bir iş baş verir ki, cahillər onu etməyi özlərinə ar bilərlər: eyni zamanda nadan adam bəzən elə bir iş görər ki, ağıllılar ona heyran qalarlar.

İnsanın təbiəti daima dəyişməkdə və təbəddülatda olduğundan belə hallar təəccübli deyildir. Düşmən haqqında yaxşı danışmağı özünə adət et, çünki düşmən onu eşitdikdə ədavətini azaldar, dostun da sənin əxlaqının gözəlliyinə inanar. Zərif təbli lətifə deyənlərin söhbəti hərçənd çox vaxt bəyənilir və zahirpərəstlərin meylini onlara tərəf çəkər, lakin xoşbəxtliyin mənasız zarafata və lətifəçiliyin məsxərəyə çevrilməsindən saqınmaq lazımdır, çünki bu xasiyyətlərin sahibi zərərdən başqa bir nəticə görməz. Bəzi adamlar xətirlərinə toxunulduğu üçün ədavət bəsləməyə başlarlar. Başqaları da onu yüngül, qədrsiz sanırlar. Dostlar arasında həcv və məsxərə olarsa, onların arasında həqiqi məhəbbətə inanmaq olmaz, çünki qılınc yarasından da yaman olan dil yarası hər iki tərəfin ürəyində tədricən yer tutar və onların saf dostluğuna xələl gətirər. Bununla da ünsiyyət kiçik bir bəhanə ilə pozulur. Hər halda işlərin tədbirini tələsmədən görmək və onları sürətlə başlamaq məsləhətdir. İşi nəfsin istəyinə görə deyil, öz qüvvə və istedadına görə görmək lazımdır. Çox vaxt artıq tələb etmək səni azdan da qoyar. Rahat olmaq istəsən özgələrin işinə qarışma! Keçmişlərin işini gələcəklərin ibrəti hesab et! Zərərə düşdükdə mərdcəsinə döz!

*Hafiz* deyir:

> "Səni Mənsur kimi dar ağacının ayağına apararlarsa,
> Mərdcəsinə davam gətir, çünki dünya davamsızdır".

Tələf olmuş bir şey haqqında heyfsilənməklə onu geri qaytarmaq olmaz. Zəruriyyət olmadan şikayətlənmək və ürəyinin dərdini demək zərərdən başqa bir fayda verməz, çünki düşmən yanında demiş olsan, onun sevincinə, tənəsinə və qüvvətinin artmasına səbəb olar; yad adamın yanında demiş olsan, səni onun gözündə alçaq və həqir göstərər; dost yanında demiş olsan, onun qəmlənməsinə və sənin münasibətinin təzələnməsinə səbəb olar. Hələ bunlar bir yana dursun, hanı o həqiqi dost ki, ona ürəyinin qəmini deyə biləsən?!



Birinci İmam Əli dünya əhli haqqında demişdir: "Varlı vaxtında onlar sənə dost, çətin vaxtında isə düşməndirlər".

Qüvvətli vaxtında elə iş gör ki, qüvvətsiz vaxtında işinə yarasın. Axırda tərk edilməsi lazım gələcək iş yolunda ömrünü puç etmə! Verdiyin hər bir vədə vəfa etməyə çalış!

İmam Əli yenə belə buyurur: "Kişi vəd edincəyə qədər azaddır". Vədini yerinə yetirmək vacibdir. Borclu adam özünü azad hesab edə bilməz. Vədəxilaf adam, insanlığın şərtlərini yerinə yetirməmək bir tərəfə dursun, böyük zərərə də düşə bilər. Zərərlər cümləsindən biri budur ki, heç kəs onun sözünə inanmaz və zərurət vaxtında lazımi vədlər versə də, heç kəsdən bir kömək ala bilməz. Hər cür yaxşılığı və vədləri hər kəsin əxlaqına və təbiətinin meylinə görə etmək lazımdır ki, ta onun artıq dərəcədə sevinməsinə və işə həvəslə girişməsinə səbəb ola bilsin. Çox vaxt bir nəfərin qəlbinə xoş gələn ən kiçik bir iş onun nəzərində başqa böyük işlərdən daha böyük görünə bilər. Ümumiyyətlə, insanın təbiətində, ömrünün müxtəlif vaxtlarına görə, bir xasiyyət başqalarına nisbətən qüvvətli olur. Məsələn, uşaqlarda inadcıllıq və kəsalət, cavanlarda özünü öymək və məhəbbət, yaşlılarda kin, saxlamaq və şan-şövkət axtarmaq, qocalarda rəhimsizlik və xəsislik xasiyyətləri sınanmışdır. Alçaq xasiyyətlərin çoxu sahibinə zərər yetirər, onu məqsədinə çatmağa qoymaz. Pis iş görən adam tez qüvvətdən düşüb işdən qalar. Rütbə axtaran hökmranlıq fikrilə nəfsinin qulu olar. Xəsis adam gələcəkdə maddi çətinliyin qorxusundan ağır günlər keçirər. Lovğa adam alçaqlığından qorxar və məzhəkə aləti olar. Təkəbbürlü adam izzət axtarmaqla özünü zəlil edər. Hirsli adam başqalarının günahından ötrü özünə əzab verər.

Xülasə, mərd o adamdır ki, öz eybini özgələrin eybindən artıq görsün, öz hünərini kiçik sansın, vaxtını başqalarının əməllərinə irad tutmağa sərf etməsin.

*Naməlum bir şair* demişdir:

> "Rədd və qəbul qeyb pərdəsinin arxasında olduğu üçün
> Çalış kimsənin eybini axtarma ki,"

Bir filosof demişdir ki, gözlü o adamdır ki, özünü görə bilsin.

## Doqquzuncu fəsil

## TƏVAZÖKARLIQ QAYDALARI HAQQINDA

Bu sifət insan vücudunun yaraşığı, zahiri və mənəvi mənfəətlərin mənbəyi ola bilər. Zahiri mənfəət odur ki, mərifətli adamlar bir nəfəri təvazökar gördükdə onu özlərinə dost seçərlər, özlərini bəyənən xudpəsənd isə ondan hörmət gördüklərindən və onların qüruruna toxunmadığından onunla mehriban olarlar. Bu surətlə onun dostları çox, düşmənləri isə az olar. Ehtimal ki, düşmənlərin özləri də onunla dost olmaq istərlər. Heç olmazsa, ona əziyyət verməkdə coşmaz və tələsməzlər. Bunun mənəvi mənfəəti ondadır ki, insan özünün nöqsan və acizliyindən xəbərdar olar və daha fəxr etməz. Beləliklə, təvazökar adam özünə gündən-günə fikir verər, naqis sifətlərini mümkün qədər düzəldər və bununla da Allahın dərgahında bəyənilər və tükənməz feyzlərə çatar. Doğurdan da, insan öz vücudundakı zəif hissəciyə belə ixtiyarı olmadığı halda, təkəbbür və lovğalıq etməyə nə haqqı vardır?

Maraqlı burasıdır ki, bir çoxları rütbə, mal, nəsəb və kamalına görə özlərini böyük hesab edirlər. Halbuki rütbə qayğıkeşlik və ehtiyacın çoxluğundan ibarətdir. Rütbə sahibinin vəzifədən kənar edildiyi zaman çəkdiyi qəm vəzifə başına keçdiyi zamanda etdiyi şadlıqdan artıq olar.

*Hafiz* deyir:

"Həsirin xoş nəqşi, yoxsulluq və arxayın yuxu,
Elə bir nemətdir ki, şahların əlinə düşməz".

Dünya malına gəldikdə, demək olar ki, o həmişə əldən ələ keçən və puç olan bir şeydir.

*Müəllif* deyir:

"Bunlar bir yana dursun, insan var-dövlətdən qudurduqda şərrə düşər. Nəsəbə gəldikdə eyb olsun o diriyə ki, ölüsü ilə fəxr edə, bu vəsitə ilə də özünün fəzilətsizliyini etiraf etməyə qalxmışa. Qabiliyyətli oğulun buna ehtiyacı, naxələf oğul isə öz ata-baba nəslinin ləkəsidir".

*Sədi* demişdir:

"Tutaq ki, atan fəzilətli adam idi,
Atanın fəzilətindən sənə nə?"



Kamaldan bəhs etdikdə demək lazımdır ki, diqqətlə mülahizə etsək, görərik ki, alim nə qədər elm öyrənsə, yenə də çox şeyi bilmədiyini etiraf edəcəkdir...

*Sənai* demişdir:

"O bilik çox yaxşıdır ki,
Onun vasitəsilə öz nadanlığını etiraf edə biləsən..."

İnsan öz nöqsan və acizliyinin həqiqətini bildikdə qürur və təkəbbürdən vaz keçər və özgəsinin eyib və nöqsanları onun nəzərində böyük görünməz. Bu səbəbdən də həlimliyi artar, qəzəbi azalar və qəzəbin əzabdan başqa nəticəsi olmadığını bilər. Çünki qəzəb insanı təbii halından çıxarar, çox zaman cürbəcür xəstəliklərə düçar edər. Bir də elə işə qurşanar ki, hər iki dünyada peşmançılıq çəkər. Burada bəyənilmiş etidal daha artıq tələb olunur.

Eyni zamanda həlimliyin acizlik, təvazökarlığın isə alçalmaq dərəcəsinə gəlib çıxmsından saqınmaq lazımdır. Hirs və vüqarı yeri gəldikdə bədəni qorumaq üçün alət etmək olar. Çünki bəzən bir çoxları birini aciz gördükdə onu incitməyə tələsirlər.

## Onuncu fəsil

## İNSAF HAQQINDA

Bu pakizə xasiyyət yaradılışının saflığından və qəlbin incəliyindən əmələ gəlir. İnsaf elə bir aynadır ki, insan öz işlərinin yaxşı və yamanını onda görə bilər. Bu sifətə malik olan adam sair əxlaqını da tədricən islah edə bilər, islah edə bilməsə də, tüğyan da etməz. Çünki insaflı adam hər zaman öz xasiyyət və işlərinin pis cəhətlərini tənqid edər, özündən baş vermiş səhv və nöqsanı düzəltməyə çalışar. Əməllərinin cəzası olaraq başqaları tərəfindən ona yetişən yamanlıq onun kin və ədavət bəsləməsinə səbəb olmaz. İnsaf qəlbin incəliyindən doğduğu üçün insaflı adam daşürəkli ola bilməz və ayağını etidal cızığından kənara qoymaz; çünki zülm etmək onun təbiətinə uyğun olmaz. Bu surətlə xoşxasiyyət olub, yaxşılığa çalışar. İnsaf özbaşına deyildir. O, əqlin dərketmə qabiliyyətinə möhtac olsa da, çox vaxt xalq arasındakı adətə bağlıdır. Yəni hər kəs hansı bir tayfanın içərisində yaşayırsa-

yaşasın, onların adətlərinin ziddinə hərəkət etməyi pis bilər və insafı buna razı olmaz. Lakin onun xilafına adət etmiş başqa birisinin insafı haman işi görməyə razılıq verməz. Məsələn, birisi hər hansı millətdən olursa-olsun, öz dini qaydalarına görə başqa dini təhqir etmək istəsə, onun insafı rəva görməz. Lakin başqa tayfalar təhqir etməməyi insafın ziddinə olan bir şey kimi bilirlər.

İnsafın lüğəti mənası ədalət deməkdir, çünki burada bölgü eyni dərəcədə hər iki tərəfə aid olur. Ədalət və insafın ikisinin də tələbi birdir. Yalnız ümumilik və xüsusilikdə təfavütü vardır, çünki ədalət fitri olmaya da bilər. İnsan ədalət və məsləhəti gözləmək səbəbi ilə zülümdən saqınar. Beləliklə, hər bir insaflı adam ədalətli olar; amma hər bir ədalətli adama insaflı demək olmaz. İnsaf fitri olsa da, əqli təhqiqatsız davamlı olmaz. Həvayi-nəfs, şübhə və tərəddüd onu puç edər. Çox vaxt insan adət dolayısı ilə pis işi bəyənər, zülmü yaxşılıq zənn edər.

Doğrudan da, insaf insan təbiətinin bəzəyidir, o, səlamətliyə və işin gözəl nəticə verməsinə səbəb olar. İnsanı bütün pisliklərin mənbəyi olan zülmdən saqındırar. Bil ki, hər bir pis iş insaf maddələrinin zəifliyi üzündən əmələ gəlir. İnsanın insafı kamal dərəcəsinə çatdıqda o, zülmü özünə və başqalarına rəva görməz. Demək, heç bir pislik də ondan baş verməz. Bütün şəriətlərin hökmləri və hüdudları, hər bir məmləkət qanunlarının möhkəmləndirilməsi zülmü dəf etmək üçündür. Elə bir günah tapılmaz ki, onda ya aşkar, ya gizli şəkildə zülmün bir növü olmasın.

*Hafiz* demişdir:

> "Hər nə edirsənsə et, lakin əziyyət vermək dalınca düşmə;
> Bizim şəriətimizə görə, Günah ancaq zülmdən ibarətdir".

Hər yamanlığın bir cəzası olduğu üçün başqasının haqqında edilən yamanlıq, şübhəsiz yamanlıq edən adamın özünə aid olacaq.

*Misra:*

> "Əməl və cəza hər yerdə yan-yana durur".

Çox vaxt olur ki, insan başqasının haqqında yamanlıq edərək onu özünə faydalı və salamatlığının səbəbi hesab edir, onun cəzasını unudur. Özünə bir yerdən yamanlıq yetişdikdə isə şikayət etməyə başlayıb, öz



günahsızlığını isbata çalışır, ancaq heç təsəvvür etmir ki, bəlkə bu cəza filankəsin haqqında etdiyim filan pis əməlin cəzasıdır.

Bütün aləm bir bədən misalında olduğundan, sənin bir adam haqqında etdiyin yamanlığın cəzasını başqası tərəfindən sənə veriləcəyinə təəccüb etmə! Hamının təbiəti birdir. Lakin əməlin cəzası maneələr və məsləhətlər səbəbindən gecikə bildiyi və keyfiyyəti də təğyir tapa bildiyi üçün insan bu həqiqətdən qafil olaraq çəkdiyi cəzanı başqa yerə yozur. Bəli, aləmin yaradılışı müddəasız olmadığı üçün adamların əməlləri də cəzasız olmayacaqdır.

Biz bu qədər eybli və nöqsanlı olduğumuz halda, gözəllik və çirkinliyi bir-birindən seçmək istəyirik, əməllərin cəzasını ədalətin tələbi bilirik. Necə olar ki, xudavənd-aləm öz kamal qüdrəti və gözəl hikməti ilə yaxşı və yaman arasında bir fərq qoymaya və insanlar üçün əməllərinin cəzasını bu dünyada və ya axirətdə müəyyən etməyə. Halbuki, bütün dinlərin nümunələri, hətta bütpərəstlər də əməlin cəzasını inkar etmirlər; çünki onsuz millətlərin şəriətləri qərar tuta bilməz və aləmin qanunları pozular.

Onbirinci fəsil

## QƏNAƏTİN ŞƏRTLƏRİ HAQQINDA

*Bu yüksək xasiyyət puç olmayan bir dövlət və sabit bir nemətdir.*

*Misra:*

> "Əbədi dövlət istəyirsənsə, qənaəti özünə peşə et!"

Qənaətcil adamın əldə edəcəyi saysız-hesabsız faydalardan ən başlıcası dörddür:

Birinci, qənaət edən adam xalq arasında əziz və vüqarlı olar.

İkincisi, bihudə zəhmətdən asudə olar. Məişət işində asudə olar, var-yox qəmi onu iztiraba salmaz, təhlükəyə düçar etməz, rüsvayçılığı və tay-tuşun tənəsini qəbul etməz.

Üçüncüsü, tamah zillətindən, asayişi pozan, yüksəlişə mane olan artıqtamahlıq müsibətindən azad olar. Doğrudan da, tamah müsibətlərin ən şiddətlisi olduğu üçün, tamahkar adam daim qəmgin olar; nə qədər varı olsa da, yenə deyər azdır. Həmişə varını artırmaq fikrində

olar. Öz mənfəətindən ötrü özgələrə ziyan vurmağa çalışar. Bu sifətdən uzaq olan adam həmişə xoşəxlaq olar və bəlkə də bu səbəbdən Allah yanında saleh adamlardan sayılar.

*Dördüncüsü, dinin və ürəyin xırmanına od vuran paxıllıqdan* salamat qalar. Doğrudan da, paxıllıq odundan yandırıcı od hələ ki, görünməmişdir. Paxıl adam heç bir zaman fərağət yaşaya bilməz. Özünün qəmi və başqalarının şadlığı onun küdurətinə səbəb olar. Aydındır ki, saysız tayfaların içərisində bir anda minlərlə insan yaxşı ömür sürə bilər. Paxıl adam bunların hər birinin sevincindən qəmlənər. Həqiqət gözü ilə baxsaq görəcəyik ki, paxıllıqdan məqsəd mənfəət deyildir. Paxıllıq batini çirkinlikdir ki, büruzə verilir. Paxılın məqsədi mənfəət olsaydı, o zaman fəzilətlərin başlıcası və xasiyyətlərin ən gözəli olan ağılda və dində də bu paxıllıqdan bir əsər görünmüş olardı. Halbuki, bunların heç birində paxıllıq yoxdur. Lakin hər kəs ağıllıqda özünü yeganə sanır və öz dinindən başqa dinləri əfsanə hesab edir.

*Sədi* demişdir:

"Ağıl yer üzündən götürülsə,
Yenə heç kəs öz nadanlığını etiraf etməz".

Paxıllıq həqiqətən qabiliyyətin yoxluğunu göstərir. Çünki hünərli adam əziz vaxtını bu murdar xasiyyətə sərf etməz, öz istedadına görə çalışar. Çalışar ki, özgəsində olandan artıq ələ gətirsin. Lakin hünərsiz adam öz istedadına inanmadığı üçün paxıllıq etməyə başlar və xalqın nemətinin puç olmasını istər. Daha orasını bilməz ki, özgələrin nemətinin puç olmasından ona bir fayda gəlməz.

*Müəllif* deyir:

"Hünərsiz adam hünərlinin nöqsanlı olmasını istər.
Bəs nə üçün özü ondan da yaxşı olmağa çalışmır?!"

Xəsis və paxıl yığdığı mal-dövlətdən həsrətdən başqa bir şey aparmaz. Çünki o dövləti ya bir hadisə məhv edər, ya varisinə qalar. Hər iki halda xəsisin işi peşmançılıqla nəticələnər. Malı yığmaqda məqsəd rahatlıq və şadlıqdır. Lakin xəsis üçün əksinə nəticə verər.

*Müəllif* deyir:

"Zəmanə əhli asayiş və kam ardına düşmüşdür,
Daha bilmir ki, dünyada boş işrət haramdır".



Çünki malı yığıb saxlamaq üçün rahatlığı özünə haram etmək lazım gəlir. Halbuki, qalan ömrünün darısqallıqla və ya rifahla keçəcəyi və ya ömrün lazım olan qədər davam edəcəyi kimsəyə məlum deyildir. Tutaq ki, ömrün davamı və çətinliyin olacı müyəssər oldu. Lakin malın puç olmayacağı nədən məlumdur? Dünya işlərinin Allahın qüdrəti ilə yoluna qoyulması hikmətsiz deyildir. Məsləhət dövlətli olmaqdadırsa, fağırlığın qorxusundan yeməməyə ehtiyac yoxdur. Əgər insanın dövlət əldə etməyə istedadı və nemətə haqqı olmazsa, o dövlət bir hadisə səbəbindən əldən çıxar, həsrət və peşmançılıqdan başqa ona bir şey qalmaz. Mal övlad üçün yığılırsa, bu da əbəsdir; çünki dəfələrlə təcrübə göstərmişdir ki, dövlətlinin övladı yoxsul, yoxsulların uşaqları isə dövlət və cah-calal sahibi olmuşlar.

Hər kəsin ruzisi bölünmüş və onu əldə etməyin müəyyən bir yolu vardır. Atanın varı özü üçündür və öz istedadı ilə yığılmışdır, o dövlətdən oğula pay düşmür. Varisə qalan mal da yadlar üçündür, çünki arvad öz hissəsini təzə əri ilə yeyəcək, qız ərinin evinə aparacaq, oğul yad qızına verəcəkdir. Özün insaf et: bundan sonra nə fayda? Desən ki, səndən ötrü ehsan və xeyrat verəcəklər, o da məlum deyildir; çünki sənə özgəsi səndən mehriban ola bilməz. Sən özün ehsan etmədiyin halda, özgəsi necə edə bilər? Tutaq ki, zahiri adət üzrə malından bir qədərini sərf etdilər. Onun da dünyada şöhrətindən və axirət savabından ibarət olan mənfəəti ehsan edən adamlar üçün olacaqdır. Demək, əziz ömrümüzü bu dünya malını toplamağa sərf etməyə və bəlkə də pulu özümüzə Allah qərar verməyə doyməz.

*Hafiz* demişdir:

"Cəmşid dünyadan cam hekayəsindən savayı bir şey aparmadı,
Saqın, ürəyini dünya malına bağlama!"

Madam ki, qənaət etidal dərəcəsini gözləməkdən ibarətdir, insan öz halal kəsbindən tamamilə əl çəkməməlidir; çünki etidal dərəcəsindən xaric olan adam aləmin ümumi nizamının əksinə çıxaraq öz varlığının xeyrini unudur.

Ümumi işlərlə məşğul olmaq lüzumu ayə və əxbardan anlaşılır. Lakin həddindən artıq ona qapılmaq pisdir. Aləmin nizamından ötrü cürbəcür peşə sahibləri çalışır və əməllərinin nəticəsindən çoxlu xeyir gözlənir. Lakin bir çoxları öz nəfsinin tələbi üzrə və zahiri mənfəətlər əldə etmək fikri ilə mal və rütbə axtarmaqdadırlar. Onlar bu təmən-

nanın şiddətindən mal yığmağın əsiri olurlar. Halbuki, əxbar və ayələrin çoxu bunun tərk edilməsinə işarə edir, ta ki, "dünyanı dost tutmaq bütün xətaların başıdır" – dedikləri kimi, daimi həlakətə düşməsinlər. Əgər onlardan bir çoxu dünya malından göz və halal kəsbdən əl çəksəydilər belə, hər halda xalqı işə təğrib edərlərdi. "Rahibliyi büdət etdilər" – ayəsinin məzmunu buna dəlildir. Yəni, işləməməklə özünü insanlıq dərəcəsindən çıxarmayasan.

Hünər odur ki, məşğul olduğun vaxtı özünü işdən kənar olmuş kimi görəsən, xalq üçün əlaqələr toru olan həşəmət vasitəsini izzət və iftixar mayəsi hesab etməyəsən. İşdən kənar olduğun vaxt çalış ki, özünü biçarə saymayasan və özünü başqalarının yanında xar etməyəsən. Allahın evi olan ürəyini mənasız arzularla fəsadların büdxanasına çevirməyəsən və dünyanın var-yoxunun fikrini çəkməyəsən...

İşdən uzaq olduğun zaman Allahın dərgahına üz çevirmək və fitnə səbəblərindən qorunmaq çətin deyil, bəlkə zəruridir.

*Nəziri* deyir:

"Zahid, gözəllərin cəfasına tabı olmadığından, bir küncdə daldalanmış və Allahdan qorxduğunu bəhanə etmişdir".

Mal kəsb etməkdə olduğu kimi, sərf etməkdə də ehtiyatı gözləmək lazımdır. İsraf da paxıllıq kimi pisdir. "İsrafçılıq şeytanın qardaşıdır" - hökmündən israfın zərəri məlumdur. Çünki insan israf etdiyi üçün gözəl nemətləri dadmaqdan məhrum olub, öhdəsində olan xeyir əməli yaddan çıxarır. Ehtimal ki, yersiz mal sərf etməklə şər işlətmiş və ümumi xeyrin ziddinə iş görmüş olar; çünki hər kəsə nə verilibsə, bir məsləhət üçündür və məsləhət də ancaq xeyir üçündür. Xeyir də ümumi mənfəətdən başqa bir şey deyildir. Belə olduqda dövlət ümumun faydasına sərf olunmalıdır. Onu puç edən özünə zərər vurur.

*Naməlum bir şai*r demişdir:

"Nəcib adam paxıllığı israfdan yaxşı hesab edər".

Dünya və axirətin həsrətini o bədəxt çəkəcəkdir ki, malı qazanıb puç edir, varisə tapşırır və başqası onu sərf etməkdən faydalanır. Alqış o xoşbəxt adama ki, yaxşılığı yerində edir və hər iki dünyanın dövlətinə sahib olur, belə adam hər zaman əziz olar, hər bir ehtiyacı rəf olunar və hər cür müşkül işdən nicat yolu tapar.

Bir *filosof* deyir:

"Səxavət bağlı qapıların açarıdır".



On ikinci fəsil

## TƏVƏKKÜL QAYDALARI HAQQINDA

Ey itaətsiz nəfs və ey özünü itirmiş ağıl, bu avaralıq nə vaxta qədər sürəcək və bu səhv düşüncələr nə vaxta qədər davam edəcəkdir? Təkəbbür və nadanlıq badəsinin xumarlığından huşa gəlmək vaxtı yetişmişdir. Küfr və üsyan içində olduğumuz halda, imandan dəm vurmaqdan həya edək!

*Sənai* deyir:

"Tövhid yolunda iki qibləyə üz çevirmək olmaz,
Ya öz nəfsini istəməlisən, ya dostun rizasını".

Əsl səbəblərdən qəflət edərək işlərin vaqe olmasını özümüzdən bilmək tamamilə cəhalət və avamlıq deyilmidir? Zərər və faydanın mənşəyini zəmanənin adamlarından görürük. Öz hünərimizə inamın küfr olduğunu, özgələrin qüdrətinə etiqadın Allaha şərik qərar vermək olduğunu nə üçün bilmirik?

İndi diqqətlə mülahizə edib görək biz öz-özlüyümüzdə nə qüdrət sahibiyik və işlərin icra edilməsində nə ixtiyarımız var? Şan və şövkət sahibi bildiyimiz adamların əhvalını yoxlasaq, hər birinin min müsibətə giriftar olduğunu və o müsibəti dəf etməkdə aciz qaldıqlarını görərik.

*Müəllif* deyir:

"Bir halda ki,ürək bu viranə (dünyada) bənddir,
Necə ola bilər ki, onun qəmi olmasın".

Özləri üçün bir şey edə bilməyənlər, özgələri üçün nə edə bilərlər? Çox zəhmətlərin səmərəsiz qaldığını təcrübə dəfələrlə göstərmişdir. Əsla xəyala gəlməyən bir iş birdən-birə düzəlir. "Tamahkar məhrum olar" – misalına görə, o, istədiyinə nail ola bilməz. Dünya əhlindən çoxunun gecə-gündüz rütbə dalınca düşdüyünü və həmişə zillət içərisində yaşadığını görmüşəm. İşdən kənar olub guşənişinlik arzusunda olan adamları ruzigar cürbəcür vaqiələr dolayısı ilə məmləkətin və xalqın işlərini görməyə məcbur edir. Yaxşı demişlər: ruzigar hər cür arzuya manedir. İşin həqiqəti bizə örtülü olduğu üçün, nə kimi

istəyi nə cür tələb etmək lazım loduğunu necə bilə bilərik? "Həddən artıq səy göstərən öz zərərinə işləyər" – məsəlinə görə çox vaxt zərərimizə olan işdən yapışırıq, halbuki, o işin baş tutmaması bizim xeyrimizədir. Belə olduqda hamıdan yaxşısı odur ki, işləri onların həqiqətini bilən və tutduğu xeyir işdə xəta etməyən hikmət sahiblərinə tapşıraq...

Riza sahibinə ismi-əzəmin (böyük adın) sahibi demək olar. Bəlkə elm ismi-əzəm rizanın və Allah sifətinin özüdür. Onun tərifi sonsuz olsa da, biz öz ağlımızın imkanı daxilində Allahın adını min bir hesab etmişik. Və "riza" sözü də əbcəd hesabilə min bir rəqəminə bərabərdir[1]. Deməli, bu söz də min bir adı özündə cəmləmiş olduğu üçün "ismi-əzəm" adlana bilər. Buna görə də hər şeyi yaradanın zatını dərk etmədən, onun camal və cəlal sənətlərinə inanmadan təvəkkül və riza məqamına çatmaq mümkün olmaz.

Hərçənd ki, biz bu yolda ağla tabeyik, lakin maddələrin ixtilafı səbəbindən ağılda olan şöbələr kamil və naqis ola bilər. Belə olduqda doğru yolun bələdçisi olmadan insan bu səhrada sərgərdən qala bilər və sükançısız, qiblənümasız gəmi kimi girdaba tez düşər.

*Hafiz* deyir:

"Xızrsız bu yolu getmə, zülmətdir,
Yoldan azmaq təhlükəsindən qorx!.."

İnsanın vücudu ruh və cism üzərində qurulmuşdur. Bunların birindən ağıl, o birindən nəfs doğur. Hər kəs nəfsin cürbəcür yaramaz hərəkət və günahdan ibarət olan istəklərindən saqınaraq ağılla maarifin zövqündən qida və qüvvət verərsə, özünü "biz insanı gözəl surətdə xəlq etdik" – dərəcəsinə çatdıraraq Allahın sifətlərini özündə əks etdirər və tükənməz feyzə yetişər. Şəhvətə qapılaraq nəfsinə qüvvət verən adamın heyvaniyyəti ruhaniliyinə qalib gələrək onu "ən alçaq dərəcə" məqamına sürükləyəcəkdir.

İnsaf gözü ilə baxsaq görərik ki, mövcudatın ən şərafətli növü olan insanlıq şərəfinə nail olduqdan sonra, nəfsani şəhvətlər üzündən

[1] Ərəb hürufatı ilə "riza" رصا sözü üç hərfdən ibarət olub, əbcəd hesabı ilə: ر=200, ص=800, ا=1 olduğu üçün bu rəqəmlər cəmləşdikdə 1001 olur (*M.S.*)



təzədən özümüzü heyvanlıq dərəcəsinə salmaqdan pis şey yoxdur; çünki heç bir heyvan öz vücudunun xeyrini istəmir. "Bütün şeylər onun həmdini zikr edirlər" – ayəsi mövcibincə şəriət hökmlərindən də xəbərdar olmalıyıq ki, zahidlik bizim yolumuzun üstündə tələ olmasın və sonin əməllərin riya və ya adət üzündən olmasın; çünki riya üzündən olan zahidlik Allaha gizlicə şərik qərar vermokdən və zahiri küfrdən bədtərdir. Büdpərəstlik bu cür zahidlikdən fəzilətdir; çünki o, etiqad üzündən, bu isə qərəz üzündəndir. Adət dolayısı ilə olarsa, o dəxi heyvaniyyətin tələbi üzrə olub, insanı məqsədinə çatdıra bilməyəcəkdir:

*Sənai* deyir:

"Dostdan uzaq düşdüyün zaman onun nə kafirliyi, nə mömünlüyü,
Yoldan uzaq düşdüyün zaman isə o yolun nə çirkinliyi və nə gözəlliyi?!"

Yaramaz işlərlə məşğul olmağın (fisqin) pisliyi məlum və ümumun yanında mənfur olduğuna baxmayaraq, yenə o, qərəzli zahidlikdən yaxşıdır. Bunu bir neçə dəlil ilə sübut etmək olar:

Birinci: zahidlikdə təkəbbür və iftixar, fisqdə isə peşmançılıq və zavallılıq vardır.

İkinci: zahidliyin xisləti daimi, fisqinki isə anidir.

Üçüncü: fasiq[1] adama nəsihət edənin məzəmməti təsir edər, zahid isə öz əməlindən fəxr edib, özgələrinə tənə vurar.

Dördüncü: Fasiq adam üçün yüz cür zərər, əzab və xar olmaq qorxusu vardır. Lakin zahid xalq arasında hörmətli hesab edilərək, məişətdə onların neməti ilə təmin olunar.

Beşinci: riyasız zahidliyə çox az təsadüf edilir, lakin fisqi isə gizli etmək lazım gəlir.

Altıncı: zahidlik xalqın gözəl zənni səbəbindən fisqin toru ola bilər. Lakin fasiqdə bu xasiyyət yoxdur.

Yeddinci: fasiq çox zaman haqqın köməyinə, zahid isə əməlinə arxalanar.

Zahidliyin lüğəvi mənası rəğbətin ziddi deməkdir. Əgər zahid adına mütabiq olsaydı və o hər şeyi buraxaraq Allahın zikr və itaətinə qapılsaydı, çox gözəl olardı. Çünki o bu vasitə ilə riza yolunu getmiş və fəna mənzilinə yetişmiş olardı...

[1] Yaramaz hərəkətlər edən şəxs (*M.S.*)

Xülasə, kamil adam odur ki, zahirdə zöhddən, gizlində isə fisqdən saqına və bunlardan heç birini özü ilə istəyinin arasında pərdə etməyə.

*Hafiz* deyir:

"Ey könül, sənə xeyir, nicat yolunu göstərirəm;
Fisqə qapılma və zahidlik satma!"

Bununla belə, "Töhmətdən saqının" – hədisini nəzərdə tutaraq töhmət məqamından çəkinməlidir. Çünki insan fisqdə bərkləşdikdə və şiddətli töhmətlərə davam gətirdikdə aşkar surətdə pis və alçaq işlərə qapılar və başqalarını yolundan azdıra bilər.

## Xatimə

## MAARİFİN RƏMZLƏRİ HAQQINDA

Mənaları izah etmək üçün sözdə iqtidar olmasa da, onu ancaq dilsiz şərh etmək olar.

*Şeyx Mahmud* deyir:

"Böyük dəniz qaba sığışmayan kimi,
Mənalar da heç vaxt hərfin içərisinə sığmaz".

Əqli təhqiqat və nəqli əsərlərdən belə anlaşılır ki, imkanın vacibdən (həqiqətdən) və çoxun təkdən doğulduğu müəyyən edilmişdir. "Vahiddən yalnız vahid doğular" – dəlilinə görə, dünyada elə bir vücud meydana gəldi ki, bu da şeyləri tamam əhatə etmək baxımından, Allahın əvvəlcə yaratdığı ağıldan ibarət oldu. İşləri nizama salmaq məqsədilə Allahın əvvəlcə yaratdığı şey qələm olmuşdur ki, bu da o vücudu göstərir. İlk və son olaraq yaratdığı nur ona işarədir. Bu kəlmələr müxtəlif olduğuna baxmayaraq, bir mənanı ifadə edir. O vücud bütün səbəblərin səbəbi olduğu kimi, hadisələrin təzahüründə kamillik və nöqsan ola bilər. Onun bu kamilliyi və nöqsanından bütün kəmiyyət və keyfiyyətlərə təzad doğur. Rədd və cəzb intizam üçün hasil olur. Çoxluğun olmasına baxmayaraq öz vəhdətliyi də qalır, dəyişiklik yalnız



onun zahiri təyinlərində olur, özü isə zaval tapmaz. "Onun özündən başqa hər şey məhv olacaqdır" – ayəsi onun hər şeyi əhatə edən varlığına dəlalət edir. Onun hökmü işlərin intizamı üçündür və "onun tərəfinə qayıdacaqlar" – ayəsi başlanğıcın və qayıtmanın mərtəbələrini bəyan edir. Varlıqda yoxluq yoxdur. Biz təğyir tapmağa və bir haldan başqa hala keçməyə "yoxluq" adı vermişik. Bütün şeylər bir şəkildən başqa şəklə girmək üçün həlak olur... Lakin bu dəyişiklik mütləq aləmin intizamı dairəsindən kənara çıxmaz. Münəccimlərdən bir parası bu əqidədədirlər ki, sabit ulduzların hamısı günəşlərdir. Onlardan başqa da kəhkaşanda sabit ulduzlar olduqca çoxdur. Deməк, o günəşlərin hamısının səyyarələri vardır. Hər syyarə bir aləmdir. Bizim aləmimiz də səyyarələrdən biridir. Bu fikri təsdiq etmək üçün belə hədis vardır: "Musa peyğəmbərə yetmiş min Tur (Dağı) və Musa göstərdilər " ki, onlar öz aləmində "Ey Allah, özünü mənə göstər" deməklə məşğul olmuşlar. İndi ki, biz hər aləmin bir nəfərlə bağlı olduğunu bildik, onda hər nəfərin də bir olduğu aydındır...

Ürək cinsiyyət etibarilə sair üzvlərlə bərabər olduğu kimi, müxtəlif maddələrin lətifliyi səbəbindən Allahın nurlarını əks etdirir... Bütün mövcudatın mənşəyi olan və aləmi idarə edən varlıq əslində ancaq öz zatına münhəsir qalmır, cüzə küllə həqiqi təsir edən də onun zatından başqa bir şey deyildir...

Lakin mahiyyət olmadıqda, keyfiyyət anlaşılmadığı üçün onun buna olan təsirini və bunun ona olan nisbətini bilmək olmaz. "Sənin Allahın hər şeydən pak və təmizdir..." – ayəsinə görə, ümumun qəbul etdiyi kimi, möminlərin bildiyi və kafirlərin olduğu hər cür sifətdən təmiz və uzaqdır. Bu səbəbə görə də bütün mövcudat öz acizliyini etiraf edib deyir: "Biz səni layiqincə tanımadıq".

*Sənai* deyir:

"Sənin qarşındakı yol ki, ondan o yanası yoxdur,
Sənin fikrinin sonudur, Allah deyildir".

Əsərin təsir edənə dəlaləti olduğu üçün "hər kəs özünü tanısa, Allahını da tanıyar" – cümləsindən məqsədi anlamaq olar. Bu hal dəxi əqli təhqiqat və nəqli tətbiqat olmadan mümkün deyildir. Nəfsani fəsadlar qüvvətli olduqca təhqiq və tətbiqin etibarı olmayacaqdır.

*Sənai* deyir:

"Azad olmadıqca bəndə olmazsan,
Dolu qabı doldurmaq olmaz".

Bu yolda addımbaşı min qorxu var və bəla sənin bilmədiyindən artıqdır.

*Mir Findərski* deyir:

"Ağıl gəmidir, arzu girdabdır, bilik yelkəndir,
Allah sahil, bütün aləm isə dənizdir".

Dəryadan sahilə çıxmaq, insan qüvvəsindən asılı olmayan küləyin əsməsinə bağlı olsa da, gəmisiz və yelkənsiz dərya üzündə üzmək mümkün deyildir. Bundan məlum olur ki, bu fırtınalı dənizdə ağıl gəmisi olmadan səfər etmək mümkün deyildir. Bu gəminin də elmlər və əsərlərdən yelkəni olmasa, sərgərdan qalar. Bunların hər ikisi toplandıqda haqqın feyzindən və kitabətin mütləq eşqindən hidayət nəsimi məsləhət üzrə əsməyə başlar və gəmidə əyləşənləri onların xəbəri və səyi olmadan nəfsin iztirab girdabından fəna aləminin ilk əlaməti olan səlamətlik sahilinə çıxarar.

*Hafiz* deyir:

"Ey səmt küləyi, gəmidə əyləşənlərik, qalx,
Ola bilsin ki, aşinaları bir də görək".

Bu mətləbi təsdiq üçün peyğəmbərin cismani meracı (göyə uçması) ruhani yüksəlişin mərtəbələrini izah edir. O həzrət-kamil insan, Cəbrail-şövqdən, Buraq-əqldən, yüksəliş kitabətdə olan bilik tərəqqisindən idi. Elə ki, o mələklərin son qərargahı olan Sədrəyə çatdı, hamı geri qaldı və o mütləq eşqə işarə olan Rəfrəf vasitəsilə o mövqedən yuxarı qalxıb özünün əsl təklik mənzilinə ki, ona Qabi-Qovseyn deyirlər, çatdı. Deməli, bu tərtiblə hər kəs öz səviyyəsinə görə merac edə bilir ki, onun şərhi vəcd və halə bağlıdır və bu barədə geniş izahata ehtiyacı yoxdur.

*Müəllif* deyir:

"Mərifət üçün eşqdən başqa həqiqi yol yoxdur;
Hər məqama ancaq bu yolla gedib çatmaq olar".



"Mən bir gizlin xəzinə idim, özümü tanımağı lazım bildim" – ayəsinə görə, ilk başlanğıcın səbəbi məhəbbət oldu, qayıdış səbəbi də yenə o olacaqdır. Bu surətdə bütün sadə və mürəkkəb varlıqlarda həqiqi rabitə eşqdir. "Bir çox şəxslər var ki, Allahı yada salırlar, ancaq mənasını qanmırlar" – ayəsi ona dəlalət edir. "Kaş onunla dost olmayaydım" – ayəsi də həmin mətləbi ifadə edir. Məhəbbət vasitəsilə öz cinsinə xas olmaq qəribə deyildir. İmkanın həqiqətə olan nisbəti də bu səbəbdəndir. Eşqin elə bir halı vardır ki, bəyana sığmaz. Əqli təhqiqatların da ona dəxli ola bilməz. Çünki ağıl hisslərin dərkinə möhtacdır. Hisslər isə təbiəbin maddələrindən doğar. Varlığın eyni və ya onun səbəbi olan məhəbbətin yeri ancaq ürəkdir.

*Mövləvi* deyir:

"Ey yoldan çıxaran, ağıl burada hərəkətsizdir;
Çünki ürək onunladır, ya da o özü ürəkdir".

Canda eşqin havası bədəndə ruh kimidir. Bu incəliklərin həqiqəti "Göylərin nuru allahdır" – böyük rəmzindən aydındır.

*Müəllif* deyir:

"Ürəkdə məhəbbətin nuru gözdəki işıq kimidir,
Canda eşqin havası bədəndə olan ruh kimidir".

Ürəyin aynası elə şəffaf və təmizdir ki, küdurətin pasından təmizləndikdə bütün şeylərin həqiqətini əks etdirən və haqqı göstərən bir güzgüyə çevrilir.

*Hafiz* deyir:

"İllər uzunu ürək bizdən Cəmşidin camını tələb edirdi;
Özündə olan şeyi özgəsindən umurdu".

Hisslər və üzvlər ürəyə tabedir, onun əmrindən çıxa bilməz. Ürək nəfsani pisliklərdən təmizlənsə, Allahın nurlarını əks etdirər və öz cinslərinin hamısını əhatə etdiyi üçün, öz hökmlərini icra etdirən bir müstəqil hakim kimi bir feyz verər...

Məmləkətin asayişini nizama salmaq siyasət işlərinin möhkəmlənməsinə bağlı olduğu kimi, maarifi təhsil etmək və əxlaqı təmizləyib safa çıxarmaq da ürəyin bədən riyasətində müstəqil olmasına bağlıdır.

Müəllifin *"Mişkatül-ənvar"* adlı məsnəvisindən aşağıdakı beytlər bu sözləri təsdiq edir:

Mən bir mötəbər hadisə görmüşəm;
Harada it olarsa, oraya mələk gəlməz.
İt ki, Əshabi-kəflə mağaraya girdi,
Onların ya dördüncüsü, ya də səkkizincisi hesab olundu.
Bəs nə üçün it olan yerə mələk gəlməz?
Bəlkə it insanın pozulmuş nəfsidir?!
Nəfs bütün dünyada ən pis şeydir.
O haqq nurunun ürəyə daxil olmasına yol verməz,
Ey Qüdsi, axı heç kəs gecə ikən günəşi görməmişdir.



## RƏHM EDƏN ALLAHIN ADI İLƏ BAŞLAYIRAM

Mən nə qədər axtardımsa uşaqların təlimi üçün elə bir kitab tapa bilmədim ki, o asan və anlaşılan bir dil ilə onların əxlaqının gözəlliyinə dəlalət etsin. Bəzi işlənməkdə olan kitablar o qədər qarışıq-dolaşıq ibarələrlə yazılmışdır ki, müəllimlərin özləri onları dərk edə bilmirlər. Bəzi kitablar isə o qədər uzun və pərakəndədir ki, onları anlamaq çox çətindir. Bu kitablarda "Uşaqlıqda öyrənilən elm daşa qazılmış şəkil kimidir" zərbül məsəlinin məzmunundan qəflət olunur. Uşaq yaşlarında hər zamandan daha artıq əxlaq gözəlliklərini onlara öyrətmək lazımdır. Pis xasiyyətlər təkrar olunduğu zaman adətə çevrilib uşaq təbiətinə daxil olduqdan sonra onlara elm və ədəb öyrətmək müşkül olar.

Beləliklə, hicrətdən 1252-ci il keçən bir zamanda[1] "Nəsayeh" adlı aydın və sadə anlaşılan müxtəsər bir kitab yazdım... ümid edirəm ki, bu əsər uşaqlara faydalı olub, onların tərbiyəsinə getdikcə daha artıq təsir etsin.

Uşaqlara üz tutub deyirəm:

Ey mənim əzizim! Sən insansan. İnsan dünyada hər şeydən üstün yaranmışdır. Görmürsənmi ki, heyvanlar o qədər böyük bədən və güc ilə insanın əlində əsirdirlər. Bu isə işi yaxşı bacarmaq səbəbindəndir. İnsanlar arasında hər kəs çox bilikli və iş bilən olsa, həmişə hörmətli olar. Deməli, gərək iş bilmək və yaxşılıq etmək qaydalarını o adamlardan öyrənmək lazımdır ki, onlar həyatda təcrübəli və qabiliyyətli olmuşlar. Belə adamların sözləri bizə nəsihətdir...

– Hər kəs vəzifədə, elmdə və yaşda səndən böyüksə ona hörmət elə ta ki, səndən kiçiklər də sənə hörmət etsinlər...

– Hər kəsi görən zaman ona salam ver. Əgər o sənə bir söz desə ədəb və təvazölə ona cavab ver ki, hamı səni sevsin.

– Elə adamlarla otur-dur ki, böyüklər onları yaxşı hesab edirlər, Əclaf və hərzə danışan adamlardan kənar gəz ki, sən də onlar kimi olmayasan.

---

[1] Miladi 1836-cı il

– Bir adamı ehtiyac içində görəndə nə qədər bacarırsan ona kömək et ki, sənin bir şeyə ehtiyacın olanda başqaları da sənə kömək etsin.

– Heç kəsin pisliyini başqasına söyləmə. Çünki əgər o şəxs sənə düşməndirsə bu sözləri haman adama çatdırar. Əgər dostdursa sənin haqqında pis fikrə düşər.

– Yalan danışmaqdan çəkin. Çünki hər kəs sənin bu xasiyyətini bilsə doğru sözünə də inanmaz.

– Hər kəs başqasının eybini sənə açıb desə ondan uzaq ol. Çünki o sənin də eybini başqasına söyləyər...

– İnsan qəzəbli olanda onun ağlı yerindən oynayar. Elə hallarda özünü hər şeydən çəkindir və hər işi acığın keçəndən sonra icra elə.

– Sənə tapşırılmayan işi görməyə çalışma. Çünki ondan xeyir görməzsən və işindən də geri qalarsan.

– Tənbəllikdən qorx ki, o bütün eyblərdən daha pisdir. Çünki, bu dünyada heç şey işsiz deyildir.

... Bir şey o biri şey olmadan yaşaya bilməz. Sən də onlardan birisən. Əgər işsiz qalsan daş və palçıq səndən daha yaxşıdır. Çünki onlar bir ev tikməyə yarayırlar.

– Elm və kamalı əldə etməyi hər şeydən daha əziz tut. Çünki hər şeyi onların vasitəsilə əldə edirlər.

– Başqasına pislik etməyə çalışan bir adama yaxşılıq eləmə. Bu pislərə yaxşılıq etmək, yaxşılara pislik etmək kimi bir şeydir.

– Hər sözə eşidən kimi inanma. Çox ehtimal o sözü deyən adamın bir qərəzi var və ya o özü işin həqiqətindən xəbərsizdir. Haman eşitdiyin sözün düzgün olduğunu başqa yerdən də öyrənməyə çalış!

– Unutma, çox olur ki, biz bir işin necəliyinə inanırıq, amma sonra məlum olur ki, məsələ başqa cürdür.

– Şuxluq və boş zarafatı özünə adət eləmə ki, nəzərlərdə yüngül görünərsən və istehza etdiyin mövqedə xalq səndən inciyər və haqqında pis fikirlərə düşər.

– Mübahisə zamanı əgər birisinə qalib gəlsən, elə etmə ki, onun nadanlığı orada oturanlara məlum olsun. Çünki belə olduqda o ürəyində sənə kin bəsləyər və intiqam almaq üçün fürsət axtarar.

– Söhbət zamanı başqalarının danışığına mane olma. Mümkündür hiyləgər bir şəxs səhv edib öz sirrini aça və düşmən sənin xeyrini deyə. Amma sən çox danışsan belə nöqsanlar sənin tərəfindən baş verər.



– Rahatlıq, vəziyyətin yaxşılığındadır, mal, dövlət və vəzifədə deyildir. Çox olur ki, bir kasıb zəhmətlə bir parça çörəyi tapıb rahatlıqla yesin, amma dövlət və cəlal sahibi öz işlərinin dolaşıqlığı üzündən möhnət və qorxu içində yaşasın.

– Sənə bir müsibət üz versə döz! Çünki əldən gedən bir də darıxmaq və təəssüflə geri dönməz. Amma iztirab üzündən gələcək işlərin tədbirindən də qafil olarsan.

– Öz dərdini başqalarına söyləmə ki, əgər düşmən olsalar sənə rişxənd edib qüvvətlənərlər, əgər biganə olsalar onların nəzərində hörmətdən düşərsən və əgər dost olsalar onların qəmlənməsinə səbəb olarsan ki, bu da sənin dərdini təzələr...

– Xəsis adam dolanacağın çətinliyi qorxusundan ağır həyat keçirər. Təkəbbürlü adam xalqın nəzərində xar olar və xudbin adam xəcalət çəkmədən qorxub başqalarının məzhəkəsinə alət olar. Qəzəbli adam başqalarının günahı üzündən özünə əzab verər.

– Paxıllıq qabiliyyətsizlik əlamətidir. Öz hünərinə inananlar başqalarından çox müvəffəqiyyət əldə edər. Hünərsiz tərəqqiyə çatmağı bacarmadığı üçün başqalarının tənəzzülünü arzulayar ki, onunla bərabərləşsin.

– Paxıllıqdan daha bədtər yandırıcı od yoxdur. Paxıl adamlar heç vaxt rahat yaşaya bilməz. Onun öz dərdi və başqalarının şadlığı hər ikisi ona müsibət olar.

– Həris adam həmişə kədərli olar. Çünki, o nə qədər dövlət qazansa elə bilər ki, azdır.

– Düşmənin təvazö və mehribanlığına inanma, ehtimal et ki, o səni aldadır və ya zəifdirsə fürsət vaxtını gözləyir.

– Başqalarının səni tərifləməsi ilə sənin istedadlı olduğunu zənn etmə, bəlkə onun bir məqsədi vardır və bu təriflə öz müddəalarını pərdələmək istəyir.

– Hər mənsəbdə olsan öz həddini bil ki, özünü olduğundan nə aşağı tut, nə də yuxarı.

– Xalq sənin əhvalının necə olmasından tez xəbər tutmaz. Sənin öz dilindən çıxan sözlərlə onlar sənin yaxşı və ya pis halda olduğunu öyrənirlər. Belə isə dilini yaxşı saxla və deyilməsi lazım gəlməyən sözlərdən özünü çəkindir.

– Hər işi öz ağlının təsdiqi ilə gör...

– Bilmədiyin bir işi inkar etmə!

– Bil ki, təvazökar və şirindil adamın dostları da çox olar.

– Dostu çox olan adamlar xoşbəxtdirlər. Dostun sənin dərdinə şərik olmağından yaxşı nə var. O sənin nöqsanlarını göstərər və ehtiyac zamanı kömək edər.

– Dünya malını sevən və mövqe axtarmağa həris olan adam dostluğa yaramaz. Çünki o həmişə öz xeyrini güdüb başqalarına ziyan verməyə çalışar.

– Hər işdə qərəz sahibi olmayan, özündən ağıllı adamlarla məsləhətləş. Tək adamın ağlı hərişin səlahını tam bilə bilməz...

– Çox yeməkdən özünü qoru ki, bədənin sağlamlığına və ağla ziyanı vardır.

– Hər ürəyin istəyəni eləmə, bəlkə ağlın istəyəni icra et. Çünki ancaq ağıl yaxşı və pisi bir-birindən ayıra bilər.

– Ağıldan və elmdən daha yaxşı bir dövlət yoxdur. Çünki onlar həmişə səninlə olar və heç kəs onları sənin əlindən ala bilməz.

– Bir adama nəsihət vermək istəyib onun işinin səlahını demək istəsən xəlvətdə de ki, xalq arasında qəbul etməz. Hələ bəlkə səndən inciyər də.

– Hər nə vədə vermişsənsə onu yerinə yetirməyə çalış ki, başqa vədə verəndə onun icra ediləcəyinə də inansınlar.

– Nə qədər imkanın varsa başqasının verdiyi şeyi qəbul eləmə. Çünki bu zaman sən onun yanında alçalarsan, o isə böyük görünər.

– Bu gün görəcəyin işi sabaha qoyma, bəlkə sən sabah onu edə bilmədin.

– Düzlüyü özünə şüar elə. Hər kim əyriliyə qurşansa onun həyası əldən gedər və xalq içində rüsvay olar.

– İnsanın şərafəti öz qabiliyyəti ilədir, nəslinə görə deyildir ki, qabil övladın ona ehtiyacı yoxdur. Naxələf övlad isə nəslinin adını batırar.

– Özünə rəva görmədiyin bir işi başqasına rəva görmə, onun əvəzində bir başqasından cəza alarsan...

– Hər bir sözü desən və ya işi görsən arxayın olma ki, sən xəlvətdəsən heç kəs ondan xəbər tutmaz. Çox olar ki, o söz və ya əməlin üstü açılar, belə ki, hər pis işi görən haman cür düşünürsə də çox çəkməz rüsvay olar.

– Heç kəsə zərər verməyə razı olma və öz hesabında pak ol, əmanətə xəyanət eləmə ta... xalq içindən qovulmuş olmayasan.



– Qohum-qardaşla və onlara bağlı olan adamlarla mehriban olub onlara kömək etməyə çalış ki, onlar da sənə mehriban olsunlar.

– Qonşularla və yerli əhali ilə yaxşı davran ta ki, səninlə də o sayaq müdara etsinlər. Bil ki, sən təksən onlar isə çoxdurlar. Birin çoxa ehtiyacı aydındır.

– Bədmezaclardan və bədməzaclıqdan həzər elə ki, bütün gözəl xasiyyətləri heçə endirər. Bədməzac adam öz xasiyyətindən əzab çəkdiyi halda, xalqdan nə gözləyə bilər?

– Bir adama yaxşılıq etdinsə ona kinayə edib boynuna minnət qoyma ki, bununla etdiyin yaxşılıq öz əhəmiyyətini itirər və xoşluq əvəzinə arada küdurət baş verər.

– Ağıllı adam odur ki, öz eybini başqalarının eyblərindən artıq görə və öz hünərini başqaların hünərindən az hesab edə...

– Heç kəsin ədavətini ürəyində saxlama ki, qəlb rahatlığını... pozar.

– Sənin haqqında bir kəsin pis danışdığını eşitdikdə tezliklə haman adama bunu çatdır ki, sözün düz və ya yanlışlığı onun öz hərəkət və sözlərindən məlum olar...

– Mal-dövləti sərf edərkən israfa yol verməməlidir. Çünki başqa daha vacib yerdə sərf etmək lazım gəldikdə əldə olmaz.

– Sən pis iş görəndə ondan heç bir mənfəət görməzsən, əvəzinə bədnamlıq sənə qalar.

– Yaxşı əməldən iki dəfə zövq alırsan, birincisi onu edəndə, ikincisi onun əvəzi sənə çatanda...

– Öz ömrünü elə bir işdə tələf etmə ki, axırda onu tərk etməli olasan.

– Bir işi görəndə əvvəlcə yaxşı düşün və sonra icrasında ehmallıq etmə. Çünki bir işi tərk etmək üçün çox vaxt lazımdır, amma icrası üçün fürsət qənimətdir.

– Kasıblıqdan və biçarəlikdən şikayətlənmə ki, səndən daha çox kasıb və daha çox biçarələr vardır. Onlar çox sevinərdilər ki, sənin vəziyyətində olsunlar...

– İnsanlar surət və səsdə müxtəlif olduqları kimi, elm və əxlaqda da biri birindən fərqlirdilər. Biz Allahı hakim bilirik və irad tutmaq olmaz ki, nə üçün o birini belə, digərini elə yaratmışdır.

– Hər istədiyin bir iş baş tutmazsa yaxşı fikirləş, bəlkə sən özün ona səbəb olmuşsan. Çox olmuş ki, biz işləri ağlımızın göstərdiyi kimi etmirik və sonra başqalarından şikayət edirik....

– Hər halda etidala riayət etmək lazımdır. Belə ki, hər fikirdə israfa yol versək xeyir görmərik. Mehribanlıq gözəl xasiyyət olsa da bəzən

qəzəb də öz yerində bəyənilir. Deməli, ağıllı adam odur ki, hər işdə orta vəziyyəti özünə adət etsin.

– Bir günahkarı ona verilmiş layiqli cəzadan xilas etməyə çalışma. Çünki belə olduqda başqaları da günah etməyə cürət edib yazıqlara əziyyət verərlər.

– Əgər bir günahsızı nahaq cəzalandırırlarsa, mümkün qədər çalış onu bəladan xilas et!..

– Bədbəxt o adamdır ki, başqasına yaxşılıq etmək əlindən gəlirsə onu etməyə...

– Hər işin varsa özün onun yerinə yetirilməsinə nəzarət elə. Çünki heç kəs sənin mənfəətini öz mənfəətindən üstün tutmaz. Bundan başqa səliqələr müxtəlif olduğu üçün çox çətindir ki, başqası o işi sənin sevdiyin dərəcədə hər cəhətdən yaxşı icra etsin.

– Köməksiz bir işi görmək mümkün deyildir. Çünki bir adam hər işi tək icra edə bilməz və bəlkə o işin xırdalıqları ilə məşğul olub mühüm cəhətləri unudar. Hər işi bir adama tapşıranda özün də onun necə icra olunmasına nəzər yetirəsən.

– Öz qüvvət və istedadının dərəcəsində boynuna iş götür, nəinki nəfsin istədiyi qədər. Məlumdur ki, adam çox dalınca qaçdıqda azdan da əli çıxar.

– Hər kəsə öz halına münasib yaxşılıq elə. Çox olmuş ki, cüzi bir şey böyük şeydən daha çox bir adamın karına gələr...





## ƏSƏRDƏN PARÇALAR

...Ağıllı adamlara gizli deyil ki, adəm övladı bu geniş dünyada yaşayış vasitələrini tədric ilə əmələ gətirmişdir

Qərinələr boyu yer üzü tədricən yaşayış üçün əlverişli bir hala salınmışdır. Ticarət yolu ilə quru və dənizlərin heyrətləndirici mühitini insanlar öyrənə-öyrənə dərk etmişlər. Əsrlərdən bəri aparılan tədqiqatlardan aydın olur ki, əvvəllər insanlar yalnız quruda yaşamışlar. Geniş okeanlar ölkələri bir-birindən ayırmış və lazımi vasitələrin olmaması üzündən insanlar çox əziyyətli, maneəli dənizlərdən yaşayış məntəqələrinin dörddə bir hissəsinə getməyi qeyri mümkün hesab edirdilər.

Əsrlər keçdikcə insanlar tədriclə yelkənlər və gəmilər düzəldib özlərini dənizlərin xatalı, tufanlı və güclü ləpələrinin ağuşuna atmış, dünyada baş verən hadisələri öyrənmək, insanların ehtiyac və vəziyyətindən xəbərdar olmaq üçün dənizçiliyi əlverişli bir yol hesab etmişlər.

İnsanlar bir yerin məhsulunu digər bir ölkəyə və ya bir tayfanın istehsal etdiyi məhsulu digər bir tayfaya çatdırmaq və bu qayda ilə onların bir-birilə əlaqədə olmalarını dünyada ən zəruri iş hesab edərək həyata keçirməyə başladılar.

İnsanlar bu yol ilə qarşılıqlı münasibət nəticəsində elm kəsb edirlər. Şəhərlərdə olan nüfuzlu şəxslərin bütün xalqın xeyrinə olan gündəlik adətlərini qəbul edərək bu adətlərin tərəqqisinə çalışdılar.

Belə nəql edirlər ki, ticarət məqsədilə dənizlə səfər etmək təcrübəsini ilk dəfə misirlilər etmişlər.

Fironilər dövründə misirlilər Xürrəm dənizindən Hind dənizinə gedib oranın əmtəəsini ətraf ölkələrə yayırdılar. Lakin bu tayfa bir məğrur tayfa olub, məişət vasitələrinə ehtiyaclarının olmaması və ölkələrinin abad bir ölkə olması üzündən başqa tayfalar ilə qarışmağı istəmir, nə özləri başqa ölkəyə gedirdilər nə də başqalarını öz ölkələrinə buraxırdılar. Buna görə də onların ticarət işləri lazımınca tərəqqi etmədi. Elə ki, misirlilərin dəbdəbələrinin bünövrəsi pozulmağa

başladı, başqa xalqlar da tədriclə özlərinə gəmi düzəldib hind, ərəb və başqa qərb dövlətlərilə ticarətə həvəs göstərərək, okeandan Əndəlis məmləkətlərinin qərb tərəflərinə və başqa qərb vilayətlərinə səfərə çıxmaq yolunu açdılar.

Keçmişlərdə dənizdə gediş-gəlişin indiki kimi olmaması üzündən böyük dənizlər lazımınca öyrənilə bilmir və müəyyən bir yol ilə dənizlə səfər etmək mümkün olmurdu. Bu səbəbdəndir ki, keçmişdə yazılmış kitablarda dənizlər haqqında çox səthi məlumat verilmişdir. Dəniz işində ən vacib olan (kompasın) qiblənümanın[1] ixtirasından sonra dənizçilik işində mühüm bir texniki tərəqqi yarandı. Nəhayət iş o yerə çatdı ki, insanlar okeandan keçib Yer kürəsinin bizim dünya kimi abad olan o biri yarısını kəşf etdilər.

Həmin dünyanın nə yol və nə üsul ilə kəşf olunması bizim aramızda o qədər də aydınlaşdırılmamışdır. Yalnız "Amerika" adlı bir ölkənin tapılmasını bilirlər. Bu ölkənin tapılması haqqında Fransa və İtaliya mənbələrindən fars dilinə tərcümə etmək və bu dünyanın əhalisindən məlumat vermək lazımdır. Buna görə də 1246-cı ildə[2] ikinci Mirzə Məhəmmədxan Bakılının oğlu həqir Abbasqulu ağa Qüdsi qabaqcıl adamlardan geri qalmamaq üçün bu maraqlı əsəri yazmağa başladı.

Buna görə də mən bir neçə ay tarix və coğrafiya kitablarının mütaliə və tərcüməsinə girişərək bu bir neçə səhifəni yazıb adını "Kəşfül-qəraib" qoydum. Ümid edirəm ki, alimlər bacarığımın və vaxtımın olmamasını nəzərə alıb bu yazdığımın xəta və nöqsanlarını islah etməyə çalışarlar...

* *
*

Xristofor Kolumbun yaşadığı ölkə və ya anadan olduğu yerin necə olması haqqında lazımınca məlumat olmasa da, bu qədər məlumdur ki, o, adlı-sanlı böyük bir familiyadan olmuşdur. Onun ata-babaları ictimai iğtişaşlar dövründə çox əzab və əziyyətlərə düçar olmuşlar.

[1] 1302-ci miladi ilində Neapol şəhərindən olan "Dorno" adlı bir şəxs onu düzəltmişdir (*müəllif*)

[2] Miladi 1830-cu ildə (*mütərcim*)



Kolumb 1447-ci miladi ilində anadan olmuşdur. O öz istedadına görə riyaziyyat, heyət (kosmoqrafiya), fəlsəfə, tarix, rəssamlıq elmlərini oxumuşdur. On dörd yaşında olanda gəmiçilikdə şöhrət qazanmış və bu sənətə olduqca böyük rəğbət göstərmişdir.

Bir neçə ildən sonra Kolumb bu sənətdə böyük şöhrət qazanaraq Portuqaliya ölkəsinin mərkəzi olan Lissabon şəhərinə getdi və dövlət xadimləri sıralarına daxil olub burada aristokrat ailələrin birinin qızı ilə evləndi...

O həmişə bu fikirdə idi ki, adlı-sanlı adamlar kimi özündə olan istedad və qabiliyyəti aşkara çıxartsın. Həmin bu əsrdə portuqaliyalılar dənizçilik işində bütün Avropa ölkələrindən qabaqda gedirdilər. Onlar Qərb dənizində o vaxta kimi məlum olmayan bəzi cəzirələr də tapmışdılar. Kolumb bir çox fənnləri bilməklə kifayətlənməyib qərb dənizlərindən şərq dənizinə bir neçə yol açdı. O zaman Avropalılar çox çalışırdılar bu dənizlərdə bir yol tapıb, bu yol ilə Hindistan və başqa tayfalarla əlaqəyə girərək onlardan nəfis və qiymətli mallar alsınlar.

Əlli il müddətində Portuqaliya və başqa ölkələrin adamları bu yolda çox əmək sərf etdilər. Lakin yolun uzaqlığı, qərb ilə olan yolların bağlılığı üzündən, bu yollardan ekvator xəttinə keçmək qeyri mümkün olduğu üçün, onlar əsl məqsədə çata bilmirdilər.

Bu zaman Kolumbun qardaşı arvadı Mavir cəzirəsinin qərb tərəfində, suyun üzündə bir ağac gövdəsi tapmışdı. Bu ağacın Hindistana məxsus olduğunu güman etdikləri üçün Kolumba yeni bir ərazinin tapılması ümidini verib, onda inam yaratdı.

İnsanın təbiəti elədir ki, hər hansı bir şeyi bilmək istədikdə onu daha geniş və daha ətraflı öyrənməyə səy edir... Bu zaman alimlər arasında belə fikir yayıldı ki, az bir müddətdə İspaniya sahillərindən Hindistana getmək mümkün olacaqdır...

Xülasə, Kolumb qabaqkı alimlərin yazdıqlarına və özünün tədqiqatına görə yeni ərazinin tapılması fikrinə düşdü...

Xristofor Kolumb 1484-cü miladi ilin axırlarında İspaniyaya gəldi. Kastil və Araqon vilayətləri şahlarından Ferdinanda və onun arvadı İzabellaya[1] öz təmənna və arzusunu ərz etdi...

Bu zaman İspaniyada yerli ərəblər ilə arası kəsilmədən daxili vuruşmalar davam edirdi. Nəticədə, Ferdinand bu işi Kolumba tapşırmağı

[1] Bakıxanov bu adları "Ferdinan" və "Zabella" şəklində qələmə almışdır (*M.S.*)

münasib görmədi. İzabella bu kimi işlərdə ərindən artıq çalışsa da, ərinin məsləhəti olmadan işə ciddi girişmədi.

Ferdinand və İzabellanın ərəblər ilə müharibə etmələrinə baxmayaraq onlar Kolumbun fikrini rədd etməyib ona dedilər:

– Madam ki, ərəblərlə muharibə davam edir, biz belə qorxulu işə girişə bilmərik.

Kolumb bu sözü açıq rədd etmək kimi hesab edərək çox məyus oldu və ömrünün beş ilini hədər yerə sərf etdiyi üçün təəssüfləndi...

Bu vəziyyətdə Kolumb tamamilə İspaniya ölkəsindən ümidini kəsib İngiltərə sarayına getmək fikrinə düşdü. Buna görə arvadını dostlarından birinin himayəsində qoyub yola düşməyə hazırlaşdı.

Kolumb keşiş Juvan Prislə görüşdü. Bu adam bir çox elmləri, o cümlədən riyaziyyat və coğrafiyanı yaxşı bilirdi.

Juvan Kolumbun uşaqlıq dostu olub, bir sinifdə oxumuşdular. Juvan İspaniya padşahının arvadı İzabellanın da yaxın dostu idi. Bu səbəbdən Kolumba dostcasına məsləhət etdi ki, bir neçə gün qalsın və tələsik bu səfərə getməsin.

Juvan riyaziyyat elminə bələd olan bir doktoru öz yanına çağırdı. Məsələni və Kolumbun nəzəriyyəsini bir yerdə təfsilən öyrəndilər. Ciddi yoxlamadan sonra onlar Kolumbun nəzəriyyəsi haqqında İzabellaya yazılı surətdə bir məqalə göndərdilər.

İzabella öz növbəsində dövlət başçılarının xüsusi yığıncağına Juvan Prisi də dəvət etdi. Bu haqda çoxlu müzakirələr olduqdan sonra, axırda İzabella Kolumbun nəzəriyyəsindən xatircəm olub Kolumba mehribançılıq göstərdi və işlərdən ötrü ayrılmış puldan bir hissəsini Kolumbun layihəsinin icrası üçün ayırdı... Səfərdən ötrü lazım olan gəmilərin və başqa şeylərin hazırlanmasına əmr verdi.

Kolumb, İspaniya ölkəsinin 8 illik zəhmətinin nəticəsi olan layihəsinin qəbul edilməsindən çox şad oldu və o bu yolda çəkdiyi əziyyətləri də tamamilə unutdu və olduqca böyük həvəslə səfərə lazım olan şeyləri hazırlamağa başladı. Kolumbun işə rəhbərliyi və onun qabaqcadan etdiyi təklif və şərtləri yazılıb 1492-ci miladi ilində qəbul olundu...



## KOLUMBUN BİRİNCİ SƏFƏRİ

Kolumbun köhnə dostu Juvan Prisin köməyi sayəsində yerli adamlardan bir çoxu Kolumbla səfərə çıxmağa həvəsləndilər. Gedənlər arasında dənizçilik işində böyük bilik və məharəti olan adamlar da vardı.

Məlikə İzabellanın və başqalarının göstərişlərinə baxmayaraq, gəmi hazırlığı istənilən nəticəni vermədi. Onların hazır edə bildikləri yalnız üç gəmi oldu ki, bunların biri böyük və ikisi kiçik gəmilər idi.

Gəmi heyəti bir neçə muzdur, İzabellanın adamlarından olan zadəganlar və bir də öz razılığı ilə gedən adamlardan idi. Kolumb səfərə çıxan 90 nəfər üçün 12 aya çatacaq lazımi ərzaq və digər ləvazımat götürdü, özü isə dəryabəyi və komandir olaraq böyük gəmidə yerləşdi...

Yolda gəmilərdən birinin sınmış sükanını düzəldib düz yol ilə Kanariya cəzirələrindən keçərək qərb tərəfə hərəkət etdilər. Kolumbun gəmiləri nəhayət heç kəsin ayağı dəymədiyi bir yerə gəlib yetişdi.

Gəmidə onlar cürbəcür fikirlərə düşürlər. Onlar dəhşətli dalğalardan coşmuş dənizin qorxulu təlatümündən elə iztiraba düşmüşdülər ki, salamat qalmaqdan əl üzüb ağlayıb fəryad edirdilər.

Kolumb isə müxtəlif yollar ilə onları sakit etməyə çalışır, yeni tapılacaq ərazidən alınacaq faydalar ilə şirnikləndirirdi...

Xülasə, Kolumb bir dərəcə ərz dairəsilə qərbə doğru hərəkət edərək bir yerə yetişdi ki, burada külək arası kəsilmədən Şərqdən qərbə doğru əsirdi...

Kanariya cəzirələrindən 400 mil məsafədə o, suyun üzərində bitki ilə örtülmüş səhraya bənzər bir yer gördü. Bəzi yerlərdə bitkinin çoxluğu gəminin hərəkət etməsinə mane olurdu.

Belə heyrətli səhnəni gördükdə Kolumbun adamlarının içərisinə yeni bir vahimə düşdü, dedilər: bu yer adamların son gedişidir, artıq buradan keçib getmək insan qüvvəsinin xaricindədir və bundan sonra da arası kəsilmədən daş, girdab və səddlər olacaqdır. Kolumb onları sakit edərək deyirdi: bu əlamətdən siz gərək şad olasınız, çünki bu hallar sahilə yaxınlaşmağın əlamətidir. Bu zaman güclü külək əsməyə başladı və gəminin ətrafında müxtəlif quşların uçmasını gördülər.Bu vəziyyəti görən Kolumbun adamları bir qədər aram olub bu fəlakətdən qurtarmaq ümidində oldularsa da, bir qədər keçdikdən sonra yenə qorxu və vahiməyə düşdülər...

Nəhayət, Kolumbun adamlarının arasında şikayətlər o dərəcəyə çatdı ki, onlar açıq-açığına... geri qayıtmaq qərarına gəldilər. Lakin gəminin uzun müddət ləpələrin zərbəsinə məruz qalıb zədələndiyinə görə, sahilə çatmadan sınmasından qorxur, digər tərəfdən küləyin arxa tərəfdən əsməsi də gəmi heyyətinin əksəri nəyin bahasına olursa olsun Kolumbu geri qayıtmaq yolunu tapmağa məcbur etmək qərarına gəldilər. Hətta onlardan bəziləri, daha çox iztirab çəkdikləri üçün, Kolumbu dənizə ataraq geri qayıtmaq fikrində idilər ...

Birdən cənub-qərb tərəfə uçan çoxlu quşlar göründü, bu isə sahilə yetişmək əlaməti olduğu üçün, Kolumbun adamları bir az sakitləşdilər. Onlar gəmilərin sükanını quşlar uçan tərəfə çevirdilər. Bir neçə gün də belə, getdikdən sonra yenə sahildən heç bir əsər görünmədi.

Bütün əlamətlər gözdən itdi, gəmidə olan adamlarda əvvəlkindən daha artıq qorxu oyandı və yenə narazı səslər ucaldı. Adamlar öz vəzifələrindən əl çəkib gəminin göyərtəsinə toplaşdılar. Onlar bir ağızdan Kolumba geri qayıtmağı təklif etdilər. Kolumb hakim ilə təbəələrin arasında olan inzibati qanunların aradan götürüldüyünü aydın gördü. Üsyan etmiş dəstəni sakit etmək mümkün deyildi. O dedi: mən sizin təklifinizə bu şərt ilə razı olaram ki, siz daha üç gün mənimlə yoldaşlıq edib tapşırdığım hər hansı bir işi itaətlə icra edəsiniz. Bu müddət qurtardıqdan sonra əgər istədiyimiz məqsədə çatmasaq, o vaxt heç bir söz və şərt olmadan geri qayıdarıq.

Gəmidəkilər səbr kasalarının dolmasına baxmayaraq, Kolumbun bu təklifini rədd edə bilmədilər. Hər kəs öz vəzifəsinə başladı...

Bir qədər getdikdən sonra birdən suyun üzündə hələ də üstündə meyvəsi olan bir ağac budağı göründü. Gün batan vaxt idi...

Kolumb özünün sahilə yaxınlaşmasını duyaraq, limanı bilmədiyi üçün, gəmilərin sınmasından qorxub gecə vaxtı sahilə çıxmaq istəmədi. Ona görə yelkənlərin salınmasını əmr etdi. Gəmiləri yavaş-yavaş sürdülər. Adamlar bütün gecəni oyaq qalıb ümidlə səhərin açılmasını gözləyirdilər...

Səhərçağı iki mil məsafədə, göyərtili və çoxlu meyvə ağacları ilə bəzənmiş bir cəzirə Kolumbun gözünə göründü.

Gəmidə olanlar böyük şadlıqla Kolumbun ayağına düşüb dönə-dönə bağışlanmalarını xahiş etdilər.

Kolumb qoşun bayrağını gəminin ucuna vurmağı əmr etdi. Portuqaliya əhalisinin adəti üzrə onlar muzik çala-çala sahilə gəldilər. Kolumb



qiymətli libas geyinib hərbi qayda üzrə qılıncını əlinə alaraq, öz qoşun dəstələrini sıraya düzdü. Bütün cəzirə əhli buraya toplanıb ispaniyalıların geyimlərini, silahlarını, muzik səslərini, ildırım kimi çaxan topların atəşini böyük heyrətlə seyr edirdilər.

Yerli əhali arasında qorxu o qədər şiddətli idi ki, ispaniyalıları bəşər cinsindən yüksək tutub onları yerə enmiş günəş övladları zənn edirdilər. İspaniyalıların da təəccüb və heyrətləri onlardan az deyildi. Çünki ispaniyalıların gördükləri bu yer olduqca ürəkaçan, göyərtili və ağaclı idi...

Bu ölkənin təbiəti isti olduğuna görə adamları lüt, rəngləri sarımtıl-qara ilə qarışıq, boyları qısa, bədənlərinin üzvləri tüksüz-hamar, saçları parlaq olub çiyinlərinə tökülmüşdü. Saqqalları yox idi.

Birinci görüşdə onların ispaniyalılara nifrət etmələrinə baxmayaraq, çox keçmədən yaxınlaşıb dostluq və alver etməyə başladılar. İspaniyalıların verdikləri şeyləri onlar böyük məmnuniyyətlə qəbul edib əvəzində isə pambıq verirdilər. Çünki bundan başqa ayrı malları yox idi.

Axşamüstü Kolumb gəmisinə qayıdarkən yerli əhalidən bir çoxu, onların dilincə Kanoy adlanan qayıqlara minib Kolumbu yola saldılar. Onların qayıqları içi yonulmuş böyük bir ağac parçasından ibarət olmasına baxmayaraq onlar qayıqları yaxşı və iti sürürdülər.

Birinci dəfə köhnə və təzə dünyanın adamları arasında bu vasitə ilə dostluq yolu açılıb və hər iki tərəf şad oldu. İspaniyalılar öz bilik və qabiliyyətləri sayəsində yeni tapılmış Salvador çayı kənarında olan ölkədə müxtəlif faydalı şeyləri ələ gətirmək fikrində idilər. Əslində cəzirə sakinləri üçün köləlik, əziyyət, fəlakət və bədbəxtliklər hazırlanırdı...

İkinci gün Kolumb bu cəzirənin ətrafını, sahillərini nəzərdən keçirtdi və məlum oldu ki, onun istədiyi sərvəti burada əldə etmək mümkün olmayacaqdır. Amma bu tayfanın burun deşiklərindən qızıl asıldığı üçün Kolumb işarələrlə onların qızılı haradan ələ keçirdiklərini soruşdu. Onlar da işarələrlə cənub tərəfi göstərərək orada qızılın çox olduğunu anlatdılar.

Kolumb cənub tərəfdəki ölkələrdən daha çox fayda almaq ümidi ilə o tərəfə yola düşdü. İspaniya dilini az-çox bilən Salvador əhalisindən bir neçə nəfəri özü ilə bələdçi götürdü. Bu biçarə, ürəyitəmiz adamlar, bu cür xidməti özünə şərəf sayaraq Kolumba böyük qayğı göstərirdilər. O, yolda çoxlu cəzirələr gördü, ancaq iki cəzirəyə yaxınlaşaraq birinə Ferdinand, o birisinə isə İzabella adı qoydu.

Adını çəkdiyimiz cəzirələrin adamları və məhsulatı Salvador cəzirələrində olduğu kimi idi.

Kolumb bu cəzirələrdə dayanmayıb qızıl tapmaq ümidi ilə cənub tərəfə hərəkətini davam etdirərək dağlıq, ağaclıq və çoxlu çayları olan böyük bir yerə yetişdi.

Kolumb, belə xəyal etdi ki, bu yer, cəzirə olmayıb, geniş əraziyə yapışıq bir ölkədir.

Gəmidə olan salvadorlular buranı Kuba adlandırırdılar, amma Kolumb bu yerə Juvan adını qoydu. O, çayın mənbəyinə yetişən kimi yerli əhali dağlara qaçdılar. Kolumb bu sahənin ətrafını yoxlamaq üçün bir neçə nəfər ispaniyalı ilə Salvador adamlarından ibarət bir dəstə göndərdi. Altmış mildən artıq ölkənin içərisinə gedəndən sonra onlar geri qayıdıb bu yerin bütün yeni tapılmış başqa ərazidən daha faydalı və yaxşı olması xəbərini verdilər.

Bu yerin adamlarının lüt olmasına baxmayaraq, bilikdə, qanacaqda, fəzilətdə Salvador əhalisindən daha üstün idilər...

Sonra təqribən min nəfər ailəsi olan bir yerə təsadüf etdilər. Bunlar komalarda yaşayırdılar, yedikləri də şabalıda bənzəyən ot kökündən ibarət idi.

Çörəkləri isə olduqca lətif, öz dillərində Mayıs deyilən buğda unundan idi. Bu elin itdən başqa ev heyvanları yox idi. Onların itləri də adi itlər kimi olmayıb siçovula oxşar və ondan da bir qədər kiçik idi. Heç vaxt hürmürdülər, boyunlarında qızıldan qayrılmış zəncir asılmış idi. Bu tayfa ispaniyalıları vəziyyətlərinə, görünüşlərinə və işlərinə görə insan övladı deyil, göydə yaşayan mələk və ya ona oxşar ilahi bir qüvvə kimi təsəvvür edirdilər...

İspaniyalılar yerli əhalidən bir neçəsini təbliğat vasitəsilə özlərinə cəlb etdilər. Safürəkli cəzirə əhli bunlara inanıb tabe oldular və qızılları Kubadan gətirdiklərini bildirdilər.

Onların dilində “Kubatan” Kuba cəzirəsinin ortası demək idi. Kolumbun əsas məqsədi Hind Şərqini axtarmaq olduğundan belə xəyal edirdi ki, bu ölkə Hindistan cəzirəsinin bir hissəsidir...

Bu diyarın adamları ispaniyalıların qızıl toplamaq üçün bu qədər səy etmələrindən təəccüblənirdilər...

İspaniyalıların zahiri görünüşləri, rəftarları yerli əhalini şirnikləndirir, bəzək şeylərindən düzəltdikləri sərgi onları valeh edirdi. Kolumbun adamları iynə, qayçı, ayna və bu kimi digər şeyləri verib əvəzinə



onlardan bir neçə qat artıq dəyəri olan qızıl alırdılar. Qəribədir ki, bu alverdə həm ispaniyalılar, həm də yerli əhali özünü faydalanmış hesab edirdilər...

Bu zaman cəzirə sakinlərinin Qasiq adlandırdıqları hakim ki, özünəməxsus şan-şövkət sahibi, eyni zamanda əhalinin rəisi idi, Kolumbun görüşünə gəldi.

O, balaca taxt üzərində əyləşmişdi. Onu dörd nəfər çiyninə götürüb gətirir, bir çox qulluqçuları isə onu müşayiət edirdilər. Öz adamları ilə çox az danışır, amma ispaniyalılara çox mehribançılıq və məhəbbət göstərirdi.

O, Kolumba çoxlu qızıl hədiyyə verdi. Kolumb da aldığı hədiyyənin müqabilində qiymətdə az, amma Qasiqin gözündə zərif və keyfiyyətcə az olmayan hədiyyələr verdi.

Kolumbun qızıl toplamaqdan başqa ayrı bir məqsədi yox idi. Yerli əhalinin hər biri ilə görüşdükdə onu yalnız qızıl mədəninin harada olması maraqlandırırdı. Onlar ölkənin şərq tərəfində olan və dəniz sahilindən o qədər də uzaq olmayan Sibau deyilən dağlıq yeri Kolumba göstərdilər...

Kolumb yubanmadan həmin cəzirəyə yola düşdü. Fami körfəzindən keçdikdən sonra məlum oldu ki, bu cəzirə həmin diyar hakimlərinin beşincisi, daha zəkalı Qasiq Xaqanqarı adlı şəxsə aiddir. Bu şəxsin tərəfindən nümayəndələr gəlib Kolumb üçün qulaqları, dişləri xalis qızıldan, böyük sənətkarlıqla qayrılmış bir adam başı hədiyyə gətirdilər və Kolumbu şahların yaşadığı məkana dəvət etdilər. Kolumb dəvəti qəbul edərək öz sahibmənsəblərindən bir neçəsini onun yanına göndərdi.

Onlar geri qayıtdıqdan sonra padşahın mehribançılığından və ölkənin vəziyyətinin yaxşılığından Kolumba nəql etdilər.

Bu xəbərdən sonra Kolumbun şahı görməyə meyli daha da artıb Fami limanından yola düşdü. Çox işlədiyinə görə Kolumb iki gün yatmamışdı. Gecəyarısı istirahət etmək məqsədilə öz postunu buraxmamağı və gəminin sürülməsində çox ehtiyatlı olmağı kapitana əmr etdi.

Kapitan isə dənizin sakit və qorxusuz olduğuna əmin olduğu üçün gəmi işçilərindən birini öz postuna qoyub istirahətə getdi. Birdən gəmi öz düz yolundan çıxıb Daşa dəydi. Gəminin qeyri-adi çalxalanmasından oyanan Kolumb özünü dişarı atdıqda gəmi heyətinin təşvişdə olduğunu gördü.

O, işçilərdən bir neçəsinə gəmini bir qədər geri çəkməyi və lövbərlərin götürülməsini əmr etdi...

Amma gəmi ağır surətdə zədələndiyi üçün su ilə dolub dəniz səthi ilə bərabər olmuşdu. Batan gəminin işçiləri başqa gəmilərə gedib dənizdə boğulmaqdan xilas oldular.

Cəzirə sakinləri bu hadisəni bilib öz rəisləri Xaqanqarıya xəbər verdilər və gəlib sahilə toplaşdılar. Fürsətdən istifadə edib ispaniyalıları tələf etmək əvəzinə sadə ürəkli yerlilər onlara mehribançılıq göstərdilər.

Dənizə çoxlu qayıq salıb gəmidə qalan şeyləri bir yerə topladılar. Xaqanqarı ispaniyalılara lazımi köməklik edib onların mühafizəsi üçün çoxlu müsəllah keşikçi qoydu...

İkinci gün Xaqanqarı özü gəmiyə–Kolumbun görüşünə gələrək üz vermiş hadisə münasibətilə ona təsəlli verib, hərtərəfli kömək edəcəyini vəd etdi.

Mən yerli tayfanın Kolumba göstərdiyi bu mehribançılığı və insanpərvərliyi haqqında Kolumbun İspaniya şahı Ferdinandın və onun xanımı İzabellanın ünvanına yazdığı məktubun tərcüməsini eynilə burada qeyd etməyi lazım bildim:

"...Bu diyarın əmiri nəhayət dərəcədə təəssüf ediləcək bir halda olan gəminin sınmaq xəbərini eşitcək öz adamlarını dənizin kənarına topladı. Lazım olan şeylərin hamısını qayıqlarda gəmidən sahilə gətirib bir yerə topladılar. Onun səyi və zəhməti sayəsində, qardaşları, qohumları ilə birlikdə şeylərin sahilə çıxarılması, onların mühafizəsi elə icra edildi ki, hətta İspaniyanın özündə belə bizə bu kömək edilmədi. Bütün şeyləri öz imarətinin yaxınlığında toplayıb gecə–gündüz mühafizə üçün müsəlləh keşikçilər təyin etdi. Arası kəsilmədən öz dost və qohumlarını mənim yanıma göndərib nəvaziş və mehribanlıq etməklə bərabər hər növ köməklik vəd edirdi. Sizi inandırıram, adını çəkdiyim şah o qədər yaxşı, o qədər xoş rəftara malikdir ki, həqiqətən öz adamları içərisində ürək dostu olmağa layiqdir. Bu şəxsin hakimiyyəti altında yaşayanların təbiətində insanlığa yaraşan mehribançılıq və məhəbbət nişanələri vardır. Bunlar zahirən lüt və çılpaq olmalarına baxmayaraq daxilən onları səxavət, tərifə layiq qonaqpərəstlik kimi gözəl və ləyaqətli sifətlər bəzəyir.

And olsun o əlahəzrətə ki, bu tayfa insanlıqda hamıdan yüksək, ölkələri isə dünyanın bütün başqa ölkələrindən daha gözəldir."



* *
*

Kiçik gəmilərdən birinin kapitanı olan Martın Penison neçə vaxtdan bəri Kolumbdan ayrılmışdı.

Kolumbun fikrincə o hiyləgər, qədir bilməyən Penisonun Kolumbdan qabaq İspaniyaya qayıtmaqdan məqsədi bu qələbəni həmişəlik öz adına çıxmaq idi. Bu səbəbdən Kolumb işin keyfiyyətini öz məsləkdaşlarına məlum etmək istədi. Gəmi kiçik olduğundan və onun adamlarının hamısını götürə bilmədiyindən, adamlarından bir neçəsinin həmin cəzirədə saxlanmasını məsləhət gördü ki, bu müddət ərzində bunlar cəzirə sakinlərinin dillərini öyrənərək əkib-biçmək işləri ilə məşğul olub, eyni zamanda qızıl mədənləri də axtarsınlar, həm də Avropadan gətiriləcək adamlar üçün yaşayış yeri hazırlasınlar.

Kolumbun yoldaşlarından çoxu qızıl ələ gətirmək tamahı ilə və həm də gəminin kiçikliyindən qorxaraq cəzirədə qalmaqlarına razılıq verdilər. Lakin Xaqanqarının bu işdə razılıq və meyli lazım idi.

Kolumb fürsətdən istifadə edərək öz fikrini Xaqanqarıya bildirib bu işdə ona kömək etməsini xahiş etdi.

O isə Kolumba belə cavab verdi: Bu bədbəxt və adsız ərazinin yaxınlığında adamyeyən, şücaətdə, döyüşdə şöhrətə malik tayfa vardır; onlar həmişə gəlib bu diyarı çalıb–çapırlar. Biz onların müqabilində dayana bilməyib dağlara, cəngəlliklərə qaçıb özümüzü müdafiə edirik. Belə olan halda ispaniyalılar üçün burada qalmaq mümkün olmaz.

Kolumb cavabında dedi: Siz mənim xahişimi qəbul ediniz, mən də elə bir qala tikərəm ki, sizin və ispaniyalıların sığınacaq yeri olsun və düşməndən müdafiə üçün bir qədər öz qoşunumdan, top–tüfəngdən də qalada qoyaram.

Sadədil şah Kolumbun dediyinə razı oldu və belə xəyal etdi ki, ispaniyalılar onu himayə etmək üçün göydən gəlmiş bir dəstədir. Kolumb on gün içərisində kiçik bir qala tikdirib adını Milad qoydu. Qalanın ətrafında dərin xəndəklər və ağac hasarlar ilə əhatə olunmuş, bir istehkam düzəltdirdi. Sınmış gəmidə olan böyük topları həmin qalaya gətirtdi. Cəzirə əhli də sadəqəlblikdən qalanın qurtarmasına can–başla çalışırdılar. Onu başa düşmürdülər ki, onların əsir olması üçün bu birinci binadır.

Bundan sonra Kolumb ispaniyalıların döyüş biliyini və rəşadətlərini cəzirə əhlinə göstərmək istədi.

Cəzirə sakinlərindən bir dəstə hazır olan kimi Kolumb məşq etmək bəhanəsilə bir müharibə planı tərtib etdi. İspaniyalılar qılınc və nizəni işə saldılar.

İspaniyalıların dəmir əsləhələr işlətməsi cəzirə əhlini heyrətə saldı, çünki onların qılınc və oxları ağacdan qayrılmış, uclarına isə balıq sümüyü bərkidilmişdi. Ucu yandırılmış, itiləşmiş uzun ağacları nizə əvəzinə işlədirdilər. Belə bir vaxtda cəzirə əhli ispaniyalıların qılınc və nizə ilə vuruşmada olan çəldliklərinə təəccüb edirdilər. Birdən top-tüfəngin gurultulu partlayışı yerə lərzə saldı. Qara tüstü göyün üzünü bürüdü. İldırımın çaxmasından əmələ gələn od kimi parlaq şölə tamaşaçıların gözlərini qamaşdırdı. Yerlilərin hamısı bu dəhşətli mənzərədən gözlərini və qulaqlarını tutub yerə yıxıldılar. Onlar yəqin etdilər ki, bir nəfər də olsun bu tayfanın zərbəsinə davam gətirə bilməz. Bunlar göy adamlarıdırlar, partlayış və od da öz əllərindədir...

* *
*

Kolumb, döyüşdə işlətdiyi məharəti və özünün cəzirə sakinlərinə göstərdiyi ehtiram və məhəbbəti onlara bildirdikdən sonra zadəganlardan olan Diqu-Arad adlı bir şəxsi qalanın naziri təyin etdi. Qalanın mühafizəsi üçün nazirin ixtiyarına daha 37 nəfər verərək, öz rəislərinə hər bir cəhətdən qulaq asmalarını; cəzirə əhli ilə yaxşı münasibətdə olmalarını onlara tapşırdı və dedi: "Xatircəm olun, mən sizin sədaqətli və yaxşı xidmətlərinizi İspaniya şahı və onun arvadına yetirib iltifat göstərməsini xahiş edəcəyəm.

Əgər sizin üzərinizə düşmən hücum edərsə onunla müharibə edin, amma ixtiyarı tamamilə Xaqanqarının əlinə verib özünüzü fəlakətə salmayın. Mən İspaniyaya gedib çoxlu tədarük, qoşun və gəmi götürüb tezliklə qayıdaram"...

Kolumb 1493-cü miladi ilində gəminin yelkənini qaldırıb Milad qalasından şərq tərəfə yola düşdü. Hərəkəti zamanı Kloumb cəzirənin şimal tərəfində olan limanları bir-bir nəzərdən keçirərək hər birisinə bir ad qoydu.

İki gün sonra Martın Penisonun gəmisi Kolumbun gəmisinə rast gəldikdə o, Kolumbdan üzr istədi.

Kolumbdan qabaq və icazəsiz olan hərəkətini o belə izah etdi: "Dənizdə fırtına qopduğundan əks istiqamətə əsən külək sizin ardınızca getməyə mane olub, bizi başqa tərəfə apardığı üçün bu müddət ərzində sizdən ayrı düşdüm".



Kolumb düşüncəli adam olduğundan, bu vəziyyətdə onunla başqa cür rəftar etmək münasib olmadığını məsləhət bilib, yersiz üzrə əhəmiyyət vermədi və ona qarşı olan keçmiş münasibətini davam etdirdi. Kolumbdan ayrı düşdüyü altı həftə içərisində Martın Penison həmin cəzirənin bir neçə körfəzini keçmişdi. Olduğu yerlərin sakinləri ilə müamilə və mübadilə yolu ilə aldığı qızıldan başqa qiymətli bir iş görməmişdi. Kolumb yanvar ayının 11-də bu cəzirənin içərisindən çıxaraq sürətlə böyük okeana üz qoydu.

Gəmi zədələnməsin deyə və gəmidə olanların tələsməsini nəzərə alaraq gəmini böyük sürətlə sürürdü, belə ki, heç bir zərər görmədən fevral ayının 14-nə kimi 500 mil məsafə qət etdi. Bu zaman birdən hava pozuldu, qorxulu tufan qopdu, şiddətli iti külək əsdi. Dənizdən qalxan fırtına elə şiddətli idi ki, gəmidə olanlar özlərini itirib nalə və fəğan edir, əllərini qaldırıb Allaha dua edərək kömək istəyirdilər.

Əcəl tufanı onların həyatını ucsuz-bucaqsız dənizdə tələf etməyə hər dəqiqə hazır idi. Kolumbun ağıllı, bilikli və hünərli olmasına baxmayaraq, qorxu onu xilas olmaq ümidini itirib çətin bir vəziyyətə düşmək dərəcəsinə gətirdi. Kolumb öz işinin aqibətini hiss edərək, yeni tapılmış ərazinin necəliyini və necə tapılmasını ceyran dərisi üzərində müxtəsərcə yazaraq möhkəm bir qutu içərisinə qoyub dənizə atdı. Bunu etməkdə onun məqsədi dünyaya məlum olmayan və heç bir kitabda qeyd edilməyən bu qəribə işi xalqa bildirmək idi. Bu qutunun sahilə çıxacağı və elm üçün onun çəkdiyi bu qədər zəhmətin puç olmayacağı və xalqın ondan istifadə edəcəyi ümidində idi.

Bir qədərdən sonra fırtına sakitləşdi. İkinci gün axşamçağı quru bir yer göründü. Amma Kolumb harada olduğunu müəyyən edə bilmədi. Bir qədər yaxınlaşdıqdan sonra məlum oldu ki, bu yer qərb dənizində Portuqal dövlətinə məxsus Mərimiyyə cəzirəsidir.

Kolumb bu cəzirədən ərzaq və başqa lazım olan şeyləri əldə etdi. Martın Penisonun gəmisi şiddətli tufanda Kolumdan ayrı düşdüyü üçün Kolumb gəminin qərq olduğunu və ya İspaniyaya gedib özündən əvvəl bu qəribə hadisəni onlara xəbər verəcəyi və qazanılan şöhrətə şərik olacağı haqqında düşünürdü. Buna görə getməyə tələsdi və bu cəzirədən İspaniya sahilinə tərəf getmək üçün gəminin yelkənini qaldırdı. Sahilə yetişən vaxt ikinci şiddətli tufan başladı. İki gün tufan

gəmini o tərəf bu tərəfə qovdu. Nəhayət Kolumb bu tufandan xilas olmaq üçün Naqa çayının dəhnəsinə pənah gətirdi.

Portuqal şahı Kolumbun gəlməsini eşidən kimi onu Lissabon şəhərinə çağırdı.

Portuqaliya dövlət başçılarının qəflət və nadanlığı üzündən bu şöhrət İspaniya dövlətinə qismət olduğuna baxmayaraq, Kolumba öz iltifat və xoş münasibətini göstərdi. Kolumb öz səfəri və yeni tapdığı ərazi haqqında ona məruzə etdi. İspaniyaya getməyə tələsdiyinə görə 5 gündən artıq Lissabon şəhərində dayanmayıb yola düşdü.

Martın 15-də ilk dəfə yola düşdüyü Palus limanına qayıtdı. İspaniya əhalisi Kolumbun gəlməsini eşidərək ölkənin hər tərəfindən dəstə-dəstə axışıb onun görüşünə gəlir, şadlıqla onu salamlayırdılar.

Bilik, bacarıq və elmdə özünə qədər və özündən sonra olanların hamısından üstün olduğu üçün, onun şərəfinə kilsələrdə zənglər çalınır, qalalarda bürclərdən atılan topların səsi minalı günbəzlərdə guruldayırdı.

Kolumb şahlığa layiq dəbdəbə və cəlal ilə gəmidən çıxıb sahilə gəldi. Adamlar onu görməyə tələsirdi, onlar heç bir gözün görüb, qulağın eşitmədiyi yeni dünya adamlarına, müxtəlif heyvanlara, quşlara və başqa əcaib şeylərə tamaşa edirdilər. Xülasə, Kolumb öz qoşunu ilə bir baş kilsəyə getdi. Allahın hədsiz iltifat və mərhəmətinə qarşı lazım olan şükrü yerinə yetirdi.

Axşamüstü Martın Penisonun gəmisi də gəlib çıxdı.

Kolumb bütün vəziyyəti və başına gələn hadisələri təsvir edib, bu zaman Barselonada olan şaha və onun zövcəsi İzabellaya göndərdi.

Şah və İzabella bu fövqaladə və əcaib hadisəyə həddindən artıq təəccüb edərək, Kolumbun ərizəsinə böyük zövq və həvəslə cavab yazıb onun gördüyü işlərin gedişini ətraflı dinləmək məqsədilə yanlarına çağırtdırdılar. Barselona gedən yolda adamlar hər tərəfdən dəstə-dəstə Kolumbu görməyə gəlir, öz bacarıq və biliyi sayəsində dünyada belə bir şöhrət və ad qazanmış şəxsə tamaşa edirdilər.

Ferdinandın və İzabellanın əmrilə Kolumbun gəlməsi münasibətilə şəhər bəzəndi. Şəhər əhalisi Kolumbun şəninə layiq geyinib bəzənərək onu təntənə ilə istiqbal edirdilər.

Kolumb öz adına məxsus bir vüqarla onların qarşısından keçirdi. Yeni dünyadan gətirilmiş çox qəribə və maraqlı cəzirə adamlarını, heyvanları, quşları və digər şeyləri təntənə ilə qabaqda aparırdılar.



Xülasə, elə ki, dəstə sıraya yetişdi Ferdinand və İzabella hörmət əlaməti olaraq Kolumba xüsusi libas geyindirib ona qarşı lazım olan izzət və ehtiramı göstərdilər. Kolumb rəsmiyyəti yerinə yetirmək üçün onların qarşısında diz çöküb dua etdi, onlara öz təşəkkür və minnətdarlığını bildirdi.

Kolumbu qabaqcadan hazırlanmış taxtın üzərində oturdub səfərin gedişi və baş verən hadisələr haqqında ona müxtəlif suallar verməyə başladılar. O, şahlara məxsus bir dillə, lovğalanıb faktları şişirtmədən, bütün işin gedişini və hadisələrin cərəyanını düzgün və doğru olaraq, necə ki lazım idi, onlara nağıl etdi. Ferdinand və İzabella həqiqi vəziyyəti bildikdən sonra diz çöküb şükür etdilər ki, Allah belə bir səadəti İspaniyaya bəxş etmişdir.

Şah və onun zövcəsi tapılan ərazini zəbt etmək və yeni ölkələr tapmaq məqsədilə Kolumbu ikinci səfərə hazırladılar. İşin başlanğıcında qoyulan şərtlərin qüvvədə qalmasını yenidən təsdiq və imza etdilər.

Bu maraqlı və heyrət doğuran xəbər bütün Avropaya yayıldı. Bu iş haqqında müxtəlif danışıq və təsəvvürlər var idi və eyni zamanda yeni dünyanın tapılmasına çox şad idilər. Qızıl mədənləri, müxtəlif quşlar, cürbəcür ədviyyatın o zaman Hindistana məxsus olduğuna əsaslanaraq Kolumb bu yeni ərazinin Hindistanın bir hissəsi olduğu nəzəriyyəsini irəli sürdü. Başqaları da Kolumbun bu nəzəriyyəsini təsdiq etdilər. Buna görə də yeni dünyanı Qərbi-Hind və onun əhalisini də hindli adlandırdılar. Bu yerin Hindistana heç dəxli olmadığı sonralar məlum olmasına baxmayaraq, birinci dəfə verilən ad qalaraq bu yeni dünyaya indi də Qərbi-Hind deyilməkdədir.

## KOLUMBUN İKİNCİ SƏFƏRİ

Ferdinand, İzabella və Kolumb səfərə lazım olan şeylərin hazırlanması üçün çox çalışırdılar.

Əhalidən bir çoxunun həvəsi və arzusu Kolumb ilə bir yerdə getmək idi. Xülasə, az müddət ərzində səfərə çıxmaq üçün 17 böyük gəmi və 1500 nəfər hazır oldu.

Yeni dünya sakinlərinin ehtiyaclarını nəzərə alaraq müxtəlif peşə sahiblərinin yaşamasına və əkinçiliyə lazım olan istehsal vasitələrini özləri ilə götürdülər...

Səfərə lazım olan şeyləri hazırladıqdan sonra Ferdinand və İzabella məsihi dininin xəlifəsi və özünü yer üzündə ixtiyar sahibi bilən Roma papasından Kolumbun səfərə getməsi haqqında icazə istəməyi lazım bildilər.

Bu haqda öz zəmanəsinin xəlifəsi VI Aleksandra yazdılar. VI Aleksandr insanlığa layiq olmayan hər cür nöqsan və eybdən ari deyildi. Papa Portuqaliya dövlətinə Kastil hökuməti üçün ərazi kəşf etmək icazəsi vermişdi. Bu icazəyə görə kəşf olan ərazi, tapan ölkəyə aid olmalıdır. Həmin icazənin eyni də Kolumb üçün verildi. Papanın həqiqətən belə bir şeyə ixtiyarı yox idi. Hətta o bu yerlərin dünyada olmasından belə xəbərsiz idi.

Lakin məsihi dinini yeni dünyada intişar etdirmək niyyətilə o, Kastil ölkəsinin baş keşişi Babla və bir neçə nəfər rəhbanların da Kolumb ilə getmələrinə icazə verdi. Kolumb yeni dünyadan gətirdiyi bir neçə nəfəri İsa dinini qəbul etməyə təşviq etdi. Onlar da Ferdinand və onun oğlunun əlilə məsihi dinini qəbul etdilər.

1493-cü iyul ayının 25-də Kolumb böyük tədarük ilə Kaviks limanından gəminin yelkənini qaldıraraq hərəkət etdi və Qamir cəzirələrini keçəndən sonra cənuba tərəf yollandı.

Bu yürüşə külək müsaid olduğundan Kolumb bir çox cəzirələri görməyə müvəffəq oldu. 26 gün müddətində Qamir cəzirələrindən keçib Kərribi cəzirələrindən birinin sahilinə yetişib bu yeri Ferirdi adlandırdı. Bundan sonra şimal-qərb tərəfə gedən zaman bir çox cəzirələrə təsadüf etdi. Daşınqa, Marılandıya, Quvandanub, Antiqu, Partu, Riku və qeyriləri o cümlədəndir.

Bunların hamısında Xaqanqarının tərif etdiyi xarani əhalisi yaşayırdı.

İspaniyalılar bu tayfanın yaşadığı hər hansı bir yerə gəldikdə onlarda olan şücaəti, yaşayış uğrunda olan mübarizələrini görürdülər. Kolumb İspaniyol cəzirəsinə yetişməyə və orada qoyduğu qala adamlarının vəziyyəti ilə tanış olmağa tələsirdi. Bunun üçün də xarani tayfasının yaşadığı yerləri öyrənməyə vaxt sərf edə bilməyib əsas məqsədi olan tərəfə üz qoydu.

1493-cü il oktyabr ayının 22-də Milad limanına gəldi. Qalada qoyduğu ispaniyalılardan və qaladan heç bir əsər görməyib təəccüb etdi, nəhayət sahilə çıxdı. Cəzirə sakinləri bunları görcək qaçmağa üz qoydular. Qalanın dağılmasından, topların və başqa hərbi ləvazımatın sınmasından məlum oldu ki, ispaniyalılar həlak olmuşlar.



Kolumbun qoşunları öz vətəndaşlarına təziyə tutub ağladıqları zaman cəzirə əmiri Xaqanqarının qardaşı Kolumbun yanına gəlib ona dedi: "Siz gedəndən sonra qalada qoyduğunuz ispaniyalılar arasında intizamsızlıq əmələ gəldi. Onlar öz başçılarına itaət etməkdən boyun qaçırtdılar. Sibau əhalisinin malını, dövlətini orada olan çoxlu qızıl yerlərini talayıb arvadlarının namusuna təcavüz etdilər".

Cəzirə əhli ispaniyalılara qaynayıb qarışdıqdan sonra ispaniyalıların da bəşəriyyət qəbilindən olub cəzirə sakinləri kimi yoxsul, möhtac və şəxsi mənfəət ardınca gedən adamlar olduğunu bildilər. İspaniyalıların göy adamları olduqları fikrindən daşındılar. Qasiq Sibau tayfasının İspaniya əhalisinin zülmündən cana gəldiyini görərək çoxlu adam toplayıb, ispaniyalıların top-tüfənginə baxmayaraq, qalaya hücum etdilər. Qalanın ağacdan qayrılmış divarlarını yandırdılar. Qaladakıların bəziləri öldürüldü və bəziləri də qaçıb özlərini dənizə ataraq həlak oldular. Xaqanqarı öz adamları ilə qaladakıların köməyinə gedərək yaralanıb geri qayıtmağa məcbur olmuşdu. Amma bu Xaqanqarının günahsız olmasına bir dəlil deyildi.

Kolumb ilə olan komandirlərin əksəriyyəti Xaqanqarının həbs edilməsini və cəzirə sakinlərindən də intiqam alınmasını tələb edirdilər.

Kolumb öz fərasət və bacarığı sayəsində işi yoluna qoymaqla cəzirə sakinlərini özünə düşmən etmək niyyətində deyildi, əksinə, onlar ilə xoş rəftar edərək, lazım olan ehtiyatı əldən vermədi.

Böyük körfəzin sahilində olan düzənlikdə əvvəlkindən daha yaxşı bir şəhərin binasını qoyub, onun tikilməsini sürətlə başa çatdırılmasına böyük səy və qüvvə sərf edildi. Bu şəhər yeni dünyada avropalıların yaratdığı birinci şəhər idi. Kolumb bu şəhərə İspaniya məlikəsi İzabellanın adını qoydu.

Asanlıqla qızıl ələ gətirmək ümidi ilə buraya gəlmiş ispaniyalılar şəhəri tikdikləri zaman əziyyət və zəhmətdən cana gəlmişdilər, xüsusən zadəganlar torpaq və daş işlərindən daha artıq inciyib şikayətə başladılar. Əvvəlcədən qeyd olunduğu kimi, ispaniyalılar belə xəyal edirdilər ki, Sibau deyilən yer Marqulanın yazdığı haman Sipanf və ya Afirdir. Guya Süleyman peyğəmbər öz səltənəti dövründə bu yerdə çoxlu nəfis mallar ələ keçirmişdir. İspaniyalılar istədikləri qızılı asanlıqla ələ keçirə bilmədikləri və tamahlarının odunu söndürmək üçün topladıqları bir qədər qızıl da onları qane etmədiyindən Kolumbu tələf etmək üçün gizlicə ona qarşı sui-qəsd hazırladılar. Kolumb bu işdən

xəbər tutaraq onların bezilərini tənbeh etdi və bezilərini də İspaniyadan sursat və digər ləvazımat gətirən 23 gəmilə geri göndərdi. Göndərdiyi adamların başqa bir dəstə ilə əvəz edilməsini İspaniya hökumətindən xahiş etdi. Bundan sonra işsizlikdən fitnə-fəsadla məşğul olmasınlar deyə, Sibau ətrafında olan cəzirələrin içərilərini yoxlamaq məqsədilə Alanzajidın başçılığı ilə bir dəstə göndərdi və özü də yerdə qalan qoşun ilə onların ardınca yola düşdü.

Kolumb cəzirə sakinlərini qorxutmaq məqsədilə böyük dəbdəbə və təmtəraq ilə gedirdi. Bayraqlar asılmışdı, musiqi hərb havası çalırdı. Bir neçə nəfər atlı və piyada arxadan və qabaqdan onu müşahidə edirdilər.

Cəzirə sakinləri belə iti gedən qüvvətli heyvanların ispaniyalılara ram olmasına təəccüb edirdilər, çünki bu yeni dünyada at yox idi. Kolumb cəzirə sakinlərini qorxutmaqla yanaşı, bir hiyləyə də əl atdı: cəzirə sakinlərinə qarşı hər yerdə lazımi ədalət və məhəbbət göstərdi.

Sibau ölkəsində həqiqətən, cəzirə sakinlərinin dediyinə görə, yağış yağan zaman dağlarda toplanmış xırda və iri danələrdən ibarət olan qızıllar sel ilə çayın axarına tökülürdü. Bu ölkə sakinləri tənbəllik və nadanlıq üzündən... qızıl mədənlərinin qazılmasına o qədər də girişmirdilər. Onlara lazım olan qızılı hazır halda yerin səthindən yığırdılar.

Kolumb bir kiçik qala tikdirib adını da Fami qoydu. Qızıl tapmaq məqsədilə qazıntı işləri aparmaq üçün bu qalaya bir dəstə adam təyin etdi. İspaniyadan gətirilən azuqə getdikcə azalmağa başladı. İstinin şiddətindən azuqənin bir hissəsi çürüyüb zay oldu. Cəzirə əhli tənbəllik və bacarıqsızlıq üzündən yalnız məişətlərinə kifayət edəcək qədər taxıl əkirdilər. İspaniyalılar da vaxtın azlığından əkin işləri ilə məşğul olmağa vaxt tapmırdılar. Buna görə də yemək cəhətdən çox əziyyət çəkirdilər. Bundan başqa isti yerlərə məxsus olan müxtəlif xəstəliklər ispaniyalılar arasında günbəgün artırdı.

Qoşun əhli... Kolumbu danlayaraq deyirdilər: “O özünə şöhrət qazanmaq üçün bu ölkənin tərifini həddindən artıq şişirdərək biz yazıqları fəlakətə salmışdır”.

Xüsusən özünü hurilər canişini hesab edən Babla adlı (rəhbən) iztirab, həyəcan və həyasızlığa başladı.

Kolumb cəzirə sakinlərini sakit etmək üçün əlindən gələni əsirgəmədisə də, heç bir fayda vermədi. Yalnız Sibau qızıl mədənlərinin tapılması onları sakit etdi.



## BAŞQA ƏRAZİNİN TAPILMASI HAQQINDA

Kolumb öz adamlarını sakit etdikdən sonra bu ölkənin başqa bir ölkə ilə birləşib və ya özü özlüyündə ayrıca yeni bir aləm olduğunu bilmək istəyirdi. Bu niyyətlə şəhərin ixtiyarını öz qardaşı Viyaqoya, qoşun başçılığını isə Partir Marqaritaya verdi.

Bundan sonra cəzirənin bütün yerlərini gəzib əhalisini İspaniya dövlətinə tabe etmək qərarına gəldi.

Kolumb təyin etdiyi adamlara bir-birilə rəftarı, işdə qanun və qaydalar haqqında tapşırıq və nəsihətlər verdi. 1494-cü miladi ilində o, aprel ayının 24-də, bir böyük və iki kiçik gəmilə yola düşdü.

Beş ay ucsuz-bucaqsız dənizdə üzərək müxtəlif əziyyət və zəhmətlərdən sonra İmayaqa cəzirəsindən başqa heç bir yeri görə bilmədi.

Kolumb Kuba tərəfə yola düşdü. Bir çox böyük və kiçik cəzirələri keçərək, bunlara Kraliyə və Pertoqrad adını verdi. Bu ərazidə onun gəmisi daşların arasına düşdü. Əks istiqamətdə əsən külək gəminin irəliləməsinə mane oldu. Dəhşətli tufan, göy gurultusu və ildırım çaxmağa başladı.

Kolumbun qoşunu səfərin əziyyətindən, azuqənin azlığından təngə gəlmişdi. Ona görə Kolumbu öldürmək üçün üsyan etdilər.

Ağır zəhmətli və məşəqqətli səfər, öhdəsinə götürdüyü vəzifənin gecə-gündüz icra edilməsi, adamların ağılsızlığı üzündən əmələ gəlmiş ziddiyyət və düşmənçilik Kolumbun şiddətli qızdırma xəstəliyinə mübtəla olmasına səbəb oldu. Qızdırmanın şiddətindən o, çox vaxt bihuş olurdu.

Sentyabr ayının 27-də onlar İzabella şəhərinə qayıtdılar. Özü kimi hünər və istedada malik, on üç il bir yerdə yaşadığı, indi Ferdinand və İzabella tərəfindən buraya azuqə gətirən üç gəmi ilə göndərilmiş qardaşı Varfulamı gördü. Onun gəlməsi Kolumbu çox sevindirdi və xəstəliyinin az müddət ərzində tamamilə sağalmasına səbəb oldu.

## İSPANİYALILARI DƏF ETMƏK MƏQSƏDİLƏ HİNDLİLƏRİN ÜSYANI

Varfulamın buraya gəlməsi, azuqənin yetişməsinin Kolumba böyük bir dayaq olmasına baxmayaraq, işdə olan intizamsızlıq o dərəcəyə çatmışdı ki, onu islah etmək mümkün deyildi, çünki Kolumb gedəndən sonra ispaniyalılar Marqaritaya tabe olmaqdan boyun qaçırmışdılar.

Bunlar dəstə-dəstə gedib cəzirə ətrafına yayılıb hindlilərin mal-qaralarını qarət etmiş, arvadlarının namuslarına toxunmaqla bərabər onları incitmişdilər.

Ölkənin ab-havasının pis olması hindliləri bədəncə zəif etmişdi. Hindlilər əkin işlərilə az məşğul olub götürdükləri cüzi məhsulla kifayətlənirdilər.

İspaniyalılar, ümumiyyətlə, az yeyən hesab olunurdular, amma hindlilərin arasında belə deyilirdi ki, guya bir hindlinin bir ayda yediyi xörəyi, ispaniyalı bir gündə yeyir. Ona görə də bunlar hindlilərdə elə bir təsəvvür oyatmışdılar ki, guya ispaniyalılar yalnız aclıqdan, azuqə tapmaq məqsədilə dünyanın hər tərəfinə yayılmışlar.

Hindlilər ispaniyalıların zülmünə və pis rəftarlarına səbr edərək deyirdilər: Bəlkə, ispaniyalılar səyahətə gəlmişlər. Hətta bu məqsədlə də onları məhsul çox olan yerlərə aparırdılar. Amma bunların şəhər, qala tikdirmələrini və burada həmişəlik yaşamaq niyyətində olduqlarını bildikdə, bütün cəzirə sakinləri birləşərək ispaniyalılara hücum edib onları məhv etmək qərarına gəldilər.

Kolumb öz kəşfiyyatından geri döndükdən sonra ispaniyalıların tərəfini saxlayan Xaqanqarıdan başqa, bütün cəzirə sakinləri və onların Qasiqləri (başçıları) ispaniyalıların əleyhinə çıxdılar.

Onların topu, tüfəngi olmamasına baxmayaraq, sayca çox olmaları ispaniyalıları qorxuya salmışdı. Hindlilər bu vəziyyətdən çox pərişan olduqları üçün dilbir olub Kolumbun himayəsində olan əraziyə hücum etdilər: Kolumb, qan tökmək istəmədiyi halda, onların hücumunu dəf etməyə məcbur oldu.

Havanın istiliyindən bu günə kimi ispaniyalıların üçdə iki hissəsi tələf olmuş, yerdə qalanlarının da çoxu bədəncə zəiflədiyindən döyüş bacarıqlarını itirmişdilər.

Kolumbun bütün qoşununun sayı 200 nəfər idi. Bunlardan təqribən 10-20 nəfəri atlı idi...

İspaniyalılar üzərində qələbə qazanmaq üçün hindlilər dağlarda vuruşmalı idilər, amma onlar strateji cəhətdən bacarıqsız olduqlarına görə Viqriyal adlanan düzənlikdə vuruşmalı oldular...

Kolumb cəldlik göstərib cəzirə sakinlərinin vuruşa girməsinə aman vermədi. O, qəflətən gecə hücuma keçdi. Müharibə meydanında top və tüfəngin ildırım kimi səpilən şöləsi qaranlıq gecəni gündüzə çevirmişdi. Müharibə meydanından qalxan alov yanan bir xərməni xatırladırdı.



Hindliləri vəhşət bürüdü. Kolumbun qoşununun qarşısında dayana bilməyib qaçmağa üz qoydular. Onların bir dəstəsi qılınc və nizədən keçirildi, başqa böyük bir dəstəsi də əsir alındı. Bu böyük məğlubiyyətdən sonra onlar heç bir müharibə haqqında daha düşünə bilməzdilər...

Bu cəzirələr istiqlaliyyət baxımından ispaniyalıların ixtiyarına keçdikdən sonra Kolumb hindlilərə xərac təyin etdi. Hər bir tayfadan 14 yaşına çatmış kişinin hər biri 4 ayda iki ovuc qızıl ovuntusu verməli idi. Qızıl mədənləri olmayan yerin sakinləri qızıl əvəzinə çoxlu pambıq əkməli idi. Nəticədə az bir müddət ərzində yerli əhalinin üçdə biri tələf oldu.

Əvvəllər hindlilər üçün təyin edilmiş xərac öz qaydası ilə davam edirdi, amma sonralar bu xərac o dərəcəyə çatdı ki, xərac verməyə onların daha gücü çatmadı.

Hindlilər üçün qoyulan bu xərac Kolumbun xasiyyətinə zidd olsa da o belə bir xəracı qoymağa məcbur idi.

Kolumbu istəməyənlərdən Marqarita, Babla və başqaları dövlət sarayında onun əleyhinə işləyirdilər. Kolumbun xidmət və şöhrətlərini qiymətləndirmirdilər, xüsusən hindlilərin işinə baxan keşiş (rəhban) Qunsaq Kolumbu istəməyənlərdən biri idi. O, Kolumbun haqqında eşitdiyi hər sözü yoxlamadan və əldə sübut olmadan onun əleyhinə həll edirdi.

Bu kimi işlər Kolumbu hindlilərə verdiyi güzəşt və vədlərindən əl çəkməyə və eyni zamanda, onda olan insanpərvər, nəcib xasiyyət əleyhinə olaraq, öz tutduğu xətti-hərəkətdən vaz keçməyə məcbur etdi.

O, günü-gündən hindlilərdən daha çox qızıl tələb etməyə başladı. Bunun nəticəsi olaraq özü əleyhinə olanların dilini bağladı, eyni zamanda Ferdinand və İzabellanın da meyillərini özünə cəlb etdi.

Həmişə azad həyat keçirən hindlilər bu qədər xərac verməkdən təngə gəlib, belə bir vəziyyətdən çıxış yolu axtarır, eyni zamanda müharibə yolu ilə düşmənə qalib gələ bilməyəcəklərinə də əmin idilər.

Nəhayət onlar əkin əkməkdən boyun qaçırdaraq düzənliklərdən keçib dağlarda və keçilməsi qeyri-mümkün olan yerlərdə məskən salmağa məcbur oldular. Onlar çox yeməyə adət etmiş ispaniyalıların taxılın azlığından tələf olacaqlarını güman edirdilər: lakin İspaniyadan göndərilən azuqə onların salamat qalmalarını təmin etdi.

Əksinə hindlilər özləri öz düşüncəsiz və bacarıqsızlıqlarının nəticəsində, taxılın yoxluğu üzündən, dağlarda və cəngəlliklərdə həlak olmağa başladılar...

## İSPANİYADA FERDİNAND VƏ İZABELLANIN KOLUMBA QARŞI MÜNASİBƏTLƏRİNİN DƏYİŞMƏSİ

İspaniyul adlanan cəzirədə havanın pisliyindən ispaniyalıların müxtəlif xəstəliklərə, çətinliklərə düçar olmasını, cəzirə sakinlərinə edilən zülm və işgəncələrin hamısını Kolumbun onlara qarşı amansız və pis rəftarı ilə izah edirdilər.

Kolumbu istəməyənlər hər cür sözlər danışırdılar. İş o yerə çatdı ki, Ferdinand və İzabella işi öyrənmək və yoxlamaqdan ötrü öz yaxın və xüsusi adamlarından biri olan Axvad adlı bir şəxsi Kolumbun olduğu cəzirəyə göndərdilər. Bu şəxs Kolumbun düşmənləri ilə əlbir idi. Axvad İspaniyul cəzirəsinə gəldikdən sonra işin nə yerdə olduğunu yoxlamaq əvəzinə Kolumbun əleyhinə pis sözlər danışmağa başladı. O belə böyük işləri yoxlayıb məruzə şəklində təqdim etmək qabiliyyətinə malik olmadığından, Kolumbun bədrəftarlıq və etdiyi zülmü yalnız sözlə deməklə kifayətləndi. İspaniyalılarla cəzirə sakinləri arasında olan bütün ziddiyyətlərin, çətinliklərin, hər növ bədbəxtliklərin hamısını Kolumbun boynuna qoyurdu.

Kolumbun haqqında cürbəcür iftiralar Ferdinand və İzabellaya xəbər verilirdi.

Kolumb işlərin tamamilə dəyişdiyini və adamları arasında qarışıqlığı gördükdə dayanmadan İspaniyaya gedib vəziyyət haqqında Ferdinand və İzabellaya məlumat vermək qərarına gəldi. O, qardaşı Varfulamı öz yerində, Fransiqa Roldani də şəhər hakimi təyin edərək yola düşdü.

## KOLUMBUN İSPANİYAYA QAYITMASI

Bu dəfə Kolumb əvvəllər getdiyi yol ilə səfər etməyib, yolun yoxlanılmamasına baxmayaraq, şərqə tərəf yola düşdü. O bu yeni yolun cənub-qərb küləyi vasitəsilə şimala doğru ən yaxşı yol olduğunu düşünürdü. Bu dəfə də əks istiqamətdə əsən küləyin təsiri nəticəsində o, çox çətinliklərə düçar oldu.

Dənizin üzündə üç ay sərgərdan qaldı. Azuqələri qurtarmaq üzrə idi. Belə bir vəziyyətdə gəmi əhli azuqəsiz qalmalarından qorxaraq ən az yeməyə qane olurdu.

Nəhayət ordu nəfərlərinin bəziləri özləri ilə apardıqları hindlilərdən bir neçəsini öldürüb yemək qərarına gəldilər. Ordu nəfərlərinin başqa bir hissəsi isə hindliləri dənizə atmaq yolu ilə ərzaq mallarına



qənaət etmək niyyətində idi. Amma Kolumbun insanpərvərliyi buna yol vermədi və o, hər iki təklifi rədd etdi.

İspaniyalıların azuqələri hələ qurtarmamışdı ki, İspaniyanın sahili göründü və onlar fəlakətdən xilas oldular. Kolumb Ferdinand və İzabellanın görüşünə gedib hədiyyə alaraq özü ilə gətirdiyi qızıl, cəvahirat, qiymətli daş-qaş, pambıq və qeyri şeyləri onlara təqdim etdi. Onlar da bədxahların iftirası nəticəsində Kolumba etdikləri pis rəftardan peşman olub ona layiq ehtiram və məhəbbət göstərdilər. Kolumbun arzusuna əsasən İspaniyul cəzirəsinin nizam-intizamı
üçün lazım olan hər şeyi hazır etdilər. Cəzirələrin abadlaşması üçün çoxlu arvad, kişi, sənətkarlar, əkinçilər və lazım olan ərzaq malları göndərdilər. Göndərilən ispaniyalıların hər birinin istedadına və göstərdiyi xidmətinə görə dövlət xəzinəsi hesabına vəzifə təyin etdilər ki, ispaniyalılar əkinçiliklə məşğul olub, özlərinin keçinəcəyinə lazım olan hər bir şeyi hazırlaya bilsinlər və asudə vaxtlarında da qızıl və başqa şeylərin toplanmasına çalışsınlar.

Ayrı yerlərin arayıb tapılması üçün Kolumbun ixtiyarına hər cür ərzaq və digər ləvazımat ilə dolu daha bir neçə gəmi verdilər.

İspaniyul havasının isti və pis olması üzündən, çoxlu ispaniyalı tələf olduğundan, heç kəs öz razılığı ilə ora getmək istəmirdi. Kolumb həbsxanada olan bütün müqəssirləri və gələcəkdə də təqsiri olanları mədən qazmaq üçün İspaniyula göndərmək qərarına gəldi. Eyni *zamanda Kolumb bu müqəssirlərin öz pis tərbiyə və bədəxlaqlarına* görə yeni dünyada fitnə və ixtişaşla məşğul olub, yenə də onu müxtəlif bəlalara və çətinliklərə sala bilmələri haqqında düşünürdü.

Ferdinand və İzabella Kolumbun səfərə çıxması üçün əllərindən gələni əsirgəmirdilər. Amma buna baxmayaraq, bir tərəfdən ispaniyalıların tələsməmək adəti, digər tərəfdən həmin ildə ərəblərlə olan müharibə Ferdinand və İzabellanın oğlunun toy xərci və bunlardan başqa da Kolumbun əleyhdarları tərəfindən onun işlərinin təxirə salınması Kolumbu elə bir vəziyyətə gətirmişdi ki, əgər onun yerinə başqası olsaydı çoxdan səbri tükənib bu işdən əl çəkmişdi.

Hindlilər içərisində nazimlik vəzifəsini daşıyan Quzek adlı rəhbən da müqəssirlərdən bəzilərinin daşınması üçün təyin edilmiş iki gəminin hazırlanması işində səhlənkarlıq edirdi.

Beləliklə, səfərə lazım olan şeylərin hazırlanmasını gecikdirərək Kolumbun səfərini təxirə salırdılar.

## KOLUMBUN ÜÇÜNCÜ SƏFƏRİ

Hər cür lazımi və lazımsız ərzaq və digər şeylərlə dolu olması üzündən baş verə biləcək təhlükəni nəzərə almadan, 1498-ci miladi ilində Kolumb üç gəmi ilə yenə yola düşdü. O, Kanariyyə cəziresindən birbaşa cənub tərəfə gedərək müəyyən xətti keçdikdən sonra qərb tərəfinə dönmək istəyirdi.

Kolumb Kanariyyə cəzirəsinə yetişcək, ləvazımatla dolu üç gəmini İspaniyula göndərərək özü Misxəzradan cənub tərəfə hərəkət etdi. Kolumb dənizlə gedən zaman heç bir yer və ya bir hadisə onun nəzərini cəlb etmədi. Ekvatora yetişən kimi şiddətli istinin təsirindən özləri ilə apardıqları su və şərabın keyfiyyəti dəyişilərək azuqələri də çürüməyə başladı.

Gəmi heyəti qədimdə yazılanlara əsaslanaraq ekvator xəttindən keçməyin qeyri-mümkün olduğunu deyirdilər. İstinin şiddətindən gəmilər az qalırdı ki yansın. Bu əsnada güclü yağış gəmini yanmaqdan xilas etdi...

Gəminin heyəti Kolumbdan geri qayıtmağı tələb edirdi. Kolumb gecə-gündüz çəkdiyi zəhmətdən, dözülməz hərarətin nəticəsində taqətdən düşdüyündən, malyariya xəstəliyinə mübtəla olduğundan, onların təklifini qəbul etməyə məcbur oldu. Olduğu yerdən şimal-qərb tərəfə, yəni Kərrbi ölkəsinin sahillərindən birinə yanaşmaq üçün istiqamət aldı.

## KOLUMBUN GERİ QAYIDARKƏN PERU ƏRAZİSİNƏ GƏLMƏSİ

Kolumbun gəmisi avqustun əvvəlində bir cəzirəyə yetişdi. O həmin cəzirəyə Təslis adını verdi (indi də həman adla adlanır). Bu cəzirə Qəvayyanın sahilinə yaxın, Arıniq çayının ağzında yerləşmişdir. Adını çəkdiyimiz çay yeni dünyada ən böyük çay hesab olunur. Deməк olar ki, bizim dünyamızda da bundan böyük çay yoxdur. Suyunun çoxluğundan, xüsusən sel zamanı okeana tökülən yerdə qorxulu bir gurultu qopararaq bir neçə mil məsafəyə səs salır.

Kolumb bu çayın keyfiyyətindən xəbərsiz idi. Elə ki, gəmilər çayın axarına girdi suyun çaxnaşması və ləpələrin dalğalanmasının şiddətindən az qala gəmilər batacaqdı. Onlar böyük əziyyət və zəhmətdən sonra bu bəladan qurtara bildilər.



Bir çox yoxlanışdan sonra məlum oldu ki, bu yer çayın dəhnəsidir. Kolumb belə güclü bir suyun geniş bir ölkədən axdığı qərarına gəldi, çünki cəzirədən belə böyük çay axa bilməzdi. Kolumb bu vaxt Peru və Qumani adı ilə məşhur olan ölkənin qərb sahilində yerləşdi. Dəfələrlə sahilə çıxıb burada yaşayanların sifət, qiyafə və yaşayış tərzi etibarilə İspaniyul sakinlərinə bənzədiklərini müəyyən etdi. Onların boyun və qulaqlarında xalis qızıl dənələrindən qayrılmış sırğa və şaha layiq mərcanlar vardı.

Bu yerin sakinləri diqqətlərini cəlb edən və xoşlarına gələn ən cüzi Avropa şeylərini qızıl ilə həvəslə mübadilə edirdilər. Onların ölkəsində hər cür heyvanat, quş və çoxlu müxtəlif meyvələr var idi. Gözəl əraziyə, təmiz havaya, bol meyvə və çoxlu başqa məhsulata malik olmasından bu yerin cənnət olacağını güman edirdilər. Amma gəmilərin zədələnməsi, azuqənin azalması, özünün bədəncə zəif düşməsi Kolumba kəşfiyyat işləri ilə məşğul olmağa imkan vermirdi. Nəhayət o, İspaniyul cəzirəsinə qayıtmağa məcbur oldu və yolda Qubaq və Marqarit cəzirələrini tapdı. Bir müddət keçdikdən sonra bu cəzirələr öz mirvarisi ilə məhşur oldu.

Bir az sonra Kolumbun xəstəliyi şiddətləndiyi üçün gəmi heyəti arasında böyük intizamsızlıq baş verdi. Belə bir intizamsızlıq Kolumba istirahətə və özünü müalicə etməyə imkan vermirdi.

## KOLUMBUN İSPANİYAYA GEDİB QAYITMASI MÜDDƏTİ ƏRZİNDƏ İSPANİYUL ŞƏHƏRİNİN VƏZİYYƏTİ

Kolumb İspaniyul şəhərindən getdikdən sonra burada böyük dəyişikliklər üz verdi. Bu dəyişikliklərdən biri də onun qardaşı Varfulam, İzabella şəhərini cəzirənin ayrı və yaxşı yerinə köçürdərək onun yerində Daminqa adlanan başqa bir şəhər salması idi.

Bu şəhər uzun müddət yeni dünya şəhərləri arasında ən məhşuru olmaqla bərabər, eyni zamanda Avropa gəmiləri üçün də liman olmuşdu. Bundan sonra o, Kolumbun getmədiyi cəzirənin başqa yerlərinə də səfər etmişdi. Bu səfər zamanı o, hindliləri özünə tabe edib, onlara xərac təyin etmişdi. Bu səfərdən Varfulamın əsas məqsədi ispaniyalıların bikar qalıb fitnəkarlıq və araqarışdırmaq ilə məşğul olmamaları üçün onlara iş tapmaq idi. Hindlilər əvvəldən onlara təyin edilən

xəracın verilməsindən təngə gəlmişdilər. Onlar ispaniyalıların müharibədə göstərdikləri bacarıq və igidliklərini nəzərə almadan elliklə üsyan edirdilər. Bu üsyanda hindlilər əsləhə yoxluğu və müharibə taktikasını bilmədiklərindən məğlubiyyətə uğradılar.

## ROLDANIN ÜSYANI

Kolumbun qardaşı Varfulamın səfərdə olduğu müddət Roldan Kolumb tərəfindən şəhər hakimi təyin olunmuşdu. Bu müddət içərisində Roldan vaxtdan istifadə edərək üsyan etdi.

Roldanın fikrincə bu üsyanın törəməsinin səbəbi guya Kolumb və qardaşının təkəbbür və bədrəftarlığı ilə ispaniyalıları gücdən salıb özlərinə tabe etmək və yeni dünyada müstəqil hakim olmaq iddiasına düşmələri idi...

Belə yersiz sözlər nəticəsində ispaniyalıların da bir çoxu onlarla əlbir olub üsyana qoşuldular. Əvvəlcə onlar şəhərdə olan azuqə ambarını zəbt edərək, qalaya hücum etdilər. Kolumbun qardaşının ağıllı tədbiri nəticəsində qalanın tutulmasına müvəffəq olmadılar.

Üsyançılar qalanı tutmaqdan ümidlərini kəsərək, çöllərə üz qoydular. Kasaraqu vilayətində yerləşib, hindliləri də Kolumbun qardaşı əleyhinə qaldırdılar.

Gəmi işçilərinin bacarıqsızlığı üzündən Kolumbun Kanariyyə cəzirələrindən göndərdiyi üç gəmi dənizdə sərgərdan gəzdikdən sonra Kasaraqu vilayətinə gəldilər. Roldan da öz adamları ilə burada idi. O, Kolumbun qardaşına qarşı olan düşmənçiliyi gizlədərək, gəmi işçilərinin sahilə çıxmalarını təklif edib yeni əraziyə dəniz yolu ilə deyil, yalnız qurudan getmək mümkün olduğunu dedi.

Gələnlər burada dincəlmək niyyətilə sahilə çıxdılar. Gəmi kapitanı işdən xəbər tutub yanında qalmış adamlarla Daminqa qalasına doğru yola düşdü. Bunlar Kolumbun Daminqaya gəlməsindən bir neçə gün sonra gəlib buraya çatdılar. Yolun uzaqlığı üzündən azuqənin çox hissəsini yemişdilər, yerdə qalan az bir hissəsini də Kolumba təhvil verdilər.

Öz pis hərəkət və rəftarı ilə məşhur olan İspaniya məhbuslarının buraya gəlməsindən sonra Roldan öz həyasız işlərini əvvəlkindən daha artıq davam etdirdi.

Bu yaramazın öz hərəkət və pozucu işlərilə böyük qorxu yaratmasına baxmayaraq, vuruşma hər iki tərəfin gücdən düşməsinə səbəb olub, onları cəzirə sakinləri qarşısında zəif salacağı üçün, nəticədə



Kolumbun bütün səy və zəhmətləri zay ola bilərdi. Buna görə də o, Roldanla vuruşmağa tələsmir, hər cür vəd və nəvaziş göstərərək, fitnə-fəsad törədənləri sakit etməyə çalışır və İspaniyaya qayıtmaq istəyənlərə də icazə verirdi. Kolumb eyni zamanda Roldanı və onun yoldaşlarını əfv edərək, onları əvvəlki vəzifəsində saxlayacağına söz verdi.

Bu yol ilə fəsad törədənlər tədriclə Kolumba tabe oldu, qarışıqlıq aradan götürülüb əvvəlki kimi nizam-intizam bərpa edildi.

İspaniyalıların hər cür dəstəsi üçün ətraf yerlərdə əkin sahələri ayrılması razılığına gəldilər. Hindli dəstələri onların işləməsi üçün ayrılan əkin yerlərində də yaşamalı idilər.

Qərara görə hindlilər hər il əkin işləri ilə məşğul olmalı idilər. Bu vəziyyətin ispaniyalıları təmin etməsinə baxmayaraq, keçmişdən irs qalmış zülm və təzyiq hindlilərin getdikcə tələf olmasına səbəb olurdu.

Üsyan nəticəsində ispaniyalıların yerli əhaliyə zülm və işgəncəsi ispaniyalıların xeyrinə qurtarmadı. Əksinə yeni ərazi tapmaq məqsədilə başqa yerlərə getmək artıq Kolumba nəsib olmadı. Xülasə, o, gəmi işçilərindən bir hissəsini bir neçə gəmi ilə İspaniyaya yola salmalı oldu.

Kolumb özünün səfəri zamanı baş verən gündəlik hadisələr haqqında qeydləri, o cümlədən kəşf etdiyi yerlərin xəritələrini, tapdığı yeni sahilləri yazaraq bir qədər qızıl, qaş-daş və digər qiymətli şeylərlə birgə Ferdinand və İzabellaya göndərdi. Öz raportunda Kolumb müxalifətçilərin üsyan səbəbini də qeyd etmiş, nizam-intizamın bərpa edilməsi üçün hökm və qanunların daha da qüvvətlənməsi və müdafiəsi üçün onlardan təlimat istəmişdi.

Roldan da bir şikayətnamə yazaraq öz yaxın adamları vasitəsilə həmin gəmi ilə şaha göndərdi. Bu məktubda o, Kolumbun özündən və qardaşından çoxlu şikayət yazmışdı. Təsadüfən Ferdinand və İzabella Roldanın yazdıqlarına daha çox inandılar...

## YENİ ƏRAZİNİN KƏŞF EDİLMƏSİ ÜÇÜN BAŞQA DƏSTƏLƏRİN SƏFƏRLƏRİ

Kolumbun dövlət xəzinəsi hesabına yeni dünyada bəzi yerlərin kəşf edilməsinə müvəffəq olması, burada çoxlu qızıl və cəvahirat toplayıb İspaniya ölkəsində şöhrətlənməsindən sonra bəzi ispaniyalılar şaha müraciət edib öz xərclərilə hələ kəşf edilməyən yerləri tapmaq qəsdi

ilə səfərə çıxmaq üçün onlara icazə verilməsini xahiş etdilər. Belə bir kəşfiyyat işinin aparılması üçün İspaniya dövlətində artıq vəsait yox idi. 1492-ci miladi ilində Kolumb ilə bağladığı müqavilə üzrə, onun fikrini və razı olub olmamasını nəzərə almadan, daha yeni ərazinin kəşf edilməsi üçün müraciət edən ispaniyalılara səfərə çıxmağa icazə verildi.

Eyni zamanda onlar bildirmişdi ki, hər kəsin ələ keçirdiyi qiymətli şeylər onların şəxsi malı olacaqdır.

Əvvəllərdə Kolumbun səfər yoldaşı olan Avida böyük həvəslə ikinci dəfə olaraq səfərə çıxmağı qət etdi.

O, Savili tacirləri arasında böyük hörmət və etibara malik idi.

Bu tacirlərdən biri dörd gəmi və səfərə lazım olan hər şeyi hazırlayıb Avidanı yola saldı.

Məlumat almaq üçün Kolumbun bütün xəritə və gündəlikləri Avidaya verildi. O, üçüncü dəfə Kolumb ilə getdiyi yol ilə gedib Peru sahilinə yetişdi. Bu yerin adamları ilə alver etdikdən sonra qərbə doğru yollandı. O, Kolumbun getmədiyi sahil boyu ilə gedib bəzi yeni-yeni yerləri gördü və yenə İspaniyaya qayıtdı. Mədaxilin xərcdən az olmasına baxmayaraq yeni ərazi tapdığı üçün o da şöhrət qazana bildi.

## YENİ DÜNYANIN AMERİKA ADLANMASI HAQQINDA

Avida ilə səfərə gedənlərdən birisi də Filorenti zadəganlarından Ameriqo adlı bir şəxs idi. Rütbədə məşhur olmamasına baxmayaraq o, dənizçilik işində mahir idi. Buna görə də səfər yoldaşları dənizçilik işində onu daha üstün tuturdular. Onun səyi və hünəri sayəsində bu səfər daha müvəffəqiyyətlə başa çatdı. Ameriqo özü də İspaniyaya qayıtdıqdan sonra kəşf edilən yeni dünyanın vəziyyəti, əhalinin dolanışığı, adət və ənənələrinin bütün təfərrüatını səyyahlara məxsus dil ilə rəng-rövnəq verərək bəyan etdi.

Düzgün olmayaraq, yeni dünyanın kəşfini Ameriqoya istinad edib bu yeri Amerika adlandırdılar. Bu ərazinin əsl kəşf edən, böyük istedada malik olan Kolumb isə belə bir şöhrətdən məhrum edildi.



## ALANZA-NİZNANIN SƏFƏRİ

Kolumb yeni dünyanın kəşf edilməsində, dənizçilik işində yalnız ispaniyalıları deyil, hətta onunla birlikdə səfərə çıxan adamların əksəriyyətini həvəsləndirdi.

Bunlar dənizçilik işini tam məharətlə mənimsəmişdilər. O cümlədən Alanza-Nizna üç dəfə Kolumb ilə səfər yoldaşı olmuşdu. O, Xristofor adlı şirkətdə bir gəmi düzəltdirib Peru ölkəsinə doğru yola düşdü.

Zülmkarların həddsiz tamahkarlıq, özbaşınalıq etmələrindən və belə işdən faydalanmaq yolunu tutduqlarına baxmayaraq şöhrət qazanmaq işində İspaniya dövləti heç bir fayda əldə edə bilmədi.

Alanza-Nizna yeni bir ərazi tapa bilməyib İspaniyaya qayıtdı. Onların ələ keçirdikləri qızıl və qiymətli daş-qaşların çoxluğu bütün ispaniyalılarda yenə səfərə getmək həvəsi oyatdı.

## PENSONUN SƏFƏRİ

Birinci dəfə Kolumb ilə səfər yoldaşı olan üç qardaşdan biri də Yans-Penson idi. O, 1500-cü miladi ilində Palus limanından yola düşdü. Müstəqil yol ilə cənub tərəfə yollandı. Ekvator xəttini birinci dəfə keçən Yans-Penson olmuşdur. Səyyahların hamısı yeni ərazinin Şərqi-Hind ilə həmhüdud olması barədə Kolumbun fikrinə şərik oldular.

## BRAZİLİYA ÖLKƏSİNİN KƏŞFİ

Həmin il Penson yenə yola düşdü. Yer kürəsinin yarısının vəziyyəti və yeni dünyanın Şərqi-Hind ilə bitişik olması fikri yayılmışdı.

Bunun müxtəsər icmalı aşağıdakından ibarətdir:

Hamının Şərqi-Hind xəyalı ilə olan səfəri nəticəsində yeni ölkə tapmaq fikri Portuqal dövlətini əvvəlkindən daha artıq cəlb edirdi. Bu məqsədlə çoxlu gəmi hazırlayıb, böyük tədarük gördü. Yeni ərazi tapmaq və ona sahib olmaq məqsədilə Petr Alversinin başçılığı altında nəzərdə tutulan həmin yerə göndərildi.

Afrika sahillərində bəzən şiddətli əsən küləklərdən, bəzən də küləyin heç olmaması səbəbindən Petr Alversinin səfərdə gecikməsi nəzərdə tutulmuşdu. Buna görə də o, yuxarıda deyilənləri nəzərə alaraq gəmiləri cənuba doğru, olduqca uzaq məsafəyə, yəni on dərəcə ekvatorun digər tərəfinə sürmüşdü. Burada o özünü naməlum bir yerin sahilində gördü.

Petr Alversin bu yeri dənizin qərb tərəfində kəşf edilməyən cəzirələrdən biri bilib, sahillər boyu bir neçə gün gəzərək bu yeri təyin edə bilmədiyindən, buranın geniş bir ölkənin hissəsi olduğunu yəqin etdi. Bu təsəvvür həqiqətə uyğun idi.

Hal-hazırda Cənubi Amerikada olan bu yer Braziliya ölkəsi adı ilə məşhurdur.

Bundan sonra Alversin sahilə çıxıb oranın geniş sahəyə malik olduğunu, təbiətini, bol məhsulunu və bu yerin necə kəşf olunduğunu bütünlüklə yazdı.

Portuqal dövlətini bunların haqqında xəbərdar etmək məqsədilə o bir poçt gəmisi yola saldı.

Portuqal əhalisi yeni dünyanın kəşfilə ispaniyalılara həsəd aparırdı, çünki Kolumbun bu kəşfi həddindən artıq ispaniyalıların şadlığına səbəb olmuşdu.

Həqiqətən Amerikanın kəşfi yalnız Kolumbun möhkəm iradə və bacarığının nəticəsi idi. Əgər Kolumbda möhkəm iradə və mətinlik olmayıb yeni dünyanın kəşfi üçün doğru və düzgün yolu ayırıb tapmasaydı, başqaları da belə böyük müvəffəqiyyətlərə nail ola bilməz, Yer kürəsinin ikinci yarısı olan bu parça bu günə kimi də bizə məlum olmazdı.

Alversinin Cənubi Amerikada Braziliyanı tapmasını təsadüfi bir hadisə hesab etmək olar, lakin belə bir təsadüfi hadisəyə də Kolumb ilə yoldaşlığın nəticəsi kimi baxmaq lazımdır.

## KOLUMBUN ADAMLARININ İTAƏTSİZLİYİ VƏ ONA QARŞI OLAN BƏDGUMANLIQLARI HAQQINDA

Kolumb Roldan ilə barışandan sonra fitnə odunun bir qədər sönməsinə baxmayaraq, ara-sıra ispaniyalıların bir dəstəsi itaət etməkdən boyun qaçırıb kömək axtarırdılar.



Nəhayət, Kolumb bir müddət öz qardaşı ilə cəzirənin ətrafını gəzməyə çıxdı.

Səfərdə olduğu zaman üsyançı ispaniyalıların olduğu yerlərə gəlib onları nəsihət və cəza yolu ilə tabe olmağa məcbur edirdi. Onun belə işlərlə başı elə qarışmışdı ki, bu hadisələri ərizə və ya məktublar vasitəsilə Ferdinand və İzabellaya bildirib, onların köməyi ilə bu cür üsyançı adamların şərindən xilas olmağa fürsət tapa bilmirdi.

Kolumbdan narazı qalan ispaniyalıların bir hissəsi işdən azad olub İspaniyaya getmişdi. Kolumbun özünün və qardaşının bədrəftarlıqlarından və digər hallardan iftiralar uydurub, şikayətlər edirdilər. İş o dərəcəyə çatmışdı ki, onlar Ferdinand və İzabellanı küçədə görərgörməz qabağını kəsib həyasızcasına qışqırmağa başlayırdılar. Başlarına gələn bədbəxtliklərin, çəkdikləri zərər və çətinliklərin hamısını Kolumbun etdiyi zülmkarlıqla bağlayır və onlara edilən zülmlərin əvəzini tələb edirdilər.

Şahın sarayına yaxın olan Kolumbun bədxahları belə şikayətləri dəstavüz edərək onun haqqında mənfi fikirlər uyduraraq Kolumba qarşı yaxın münasibəti olan Ferdinand və İzabellanı tamamilə yoldan çıxartdılar.

## KOLUMBUN VƏZİFƏDƏN GÖTÜRÜLÜB HƏBS EDİLMƏSİ

İftiraçı və qərəz sahiblərinin dediklərinə əsaslanaraq Ferdinand və İzabella Kolumbu tənbih etmək qərarına gəldilər. Onlar 1500-cü milad ilində Bevadila adlı bir şəxsi İspaniyul cəzirəsinin vəziyyətini təhqiq etmək məqsədilə oraya göndərdilər. Ona tapşırılmışdı ki, əgər Kolumb müqəssir isə onu işdən xaric edib özü onun yerinə otursun və ölkəni idarə etmək işini öz öhdəsinə götürsün.

İş heç bir vəziyyət nəzərə alınmadan Kolumbun müqəssirləndirilməsi, Bevadilanın hökümət başçısı olması ilə bitdi.

Kolumb bu günə kimi cəzirədə yaşayanlarla olan hər bir ixtilafı dəf etmişdi. İspaniyalılar və cəzirə sakinləri lazımınca ona itaət göstərərək mədənlərin axtarılıb tapılması və nəfis şeylərin ələ keçirilməsi işində çalışırdılar.

Bevadila İspaniyula gələn kimi heç bir vəziyyəti nəzərə almadan və heç bir iş təhqiq etmədən ölkənin başçılığını öz əlinə alıb Damınqa qalasında olan Kolumbun qərərgahında yerləşdi. Bu vaxt Kolumb səfərdə idi.

O bundan istifadə edərək Kolumbun bütün əmlakını zəbt və onun həbs etdiyi adamların hamısını azad etdi. Öz təyinatı haqda olan şah fərmanını Kolumba göndərib, ona geri qayıtmağı təklif etdi. Kolumb Ferdinand və İzabellanın ona qarşı olan belə münasibətini qədirbilməzlik kimi qiymətləndirdi ki, bu da onun böyük kədərinə səbəb oldu. Amma bu vəziyyət Kolumbun gözəl xasiyyət, mərdlik və düşüncəsini dəyişdirə bilmədi. O, dayanmadan yeni hakimin, daha doğrusu can düşməninin hüzuruna gedərək itaətkar başını şahın yazdığı fərman üzərinə qoydu.

Bevadila onu öz hüzuruna gətirtməyərək həbs edilib İspaniyaya göndərilməsini əmr etdi.

Belə nəql edirlər ki, Bevadila Kolumbun istedad, hünər və bacarığını nəzərə almadan onun haqqında zülm və həyasızlığı əsirgəmədi. Onun və qardaşının ayaqlarına qandal vurdu. Belə qəmli və pis gündə həmsöhbət olub bir-birinə təsəlli verməsinlər – deyə onları ayrı – ayrı gəmilərdə yerləşdirdi. Heç bir əsası olmadan bir çox iftiraları da Kolumbun adına bağladı.

Gəmilər İspaniyuldan uzaqlaşdıqda, Kolumbu aparan gəminin kapitanı, insanpərvər, gözəl əxlaqa malik olan şəxs, Kolumbun yanına gəlib ona çox hörmət və ehtiram göstərərək ayağının qandalının açılmasını təklif etdi.

Kolumb dedi: – "Mənim ayağım şahın əmrilə bağlanıbdır, bu vəziyyətdə də şahın qulluğuna gedəcəyəm, mənim hər bir vəziyyətdə ona itaət etməyə hazır olduğumu qoy bilsinlər, fərmanın əksinə heç bir şeyi caiz bilmirəm".

Bir neçə müddətdən sonra Kolumb İspaniya ölkəsinə gəldi. Ferdinand və İzabella Kolumb haqqında etdikləri bədrəftarlıq və onun gördüyü işləri qiymətləndirməmələrinin nəticələrindən qorxurdular. Kolumb kimi şöhrət qazanmış adlı- sanlı şəxs haqqında bu cür təhqir, pis rəftar və başqa kimi xəbərlərin ətrafa yayılaraq Avropa dövlətlərinin narazılığından, nəhayət, Kolumbun tənəli sözlərindən baş verə biləcək hadisələrdən qorxaraq və bunların əvvəlcədən qarşısını almaq məqsədilə onun qandalını açmağa əmr etdilər.



Şahın hüzuruna gəlmədən əvvəl qiymətli libas almaq üçün Kolumba bir qədər pul da göndərdilər. Kolumb şahın hüzuruna gəlcək şah və onun arvadı İzabella Kolumbun şəninə layiq bir tərzdə ona ehtiram, məhəbbət və nəvaziş göstərdilər.

Bir neçə gündən sonra təyin edilmiş vaxtda cəzirədəki vəziyyət, araqarışdıranlar və quldurların etdikləri fitnəkarlıq haqqında Kolumb olduğu kimi geniş surətdə izah etdi. Onlar isə deyirdilər: "Əsasən, Bevadilanın bu cür rəftarına biz razılıq verməmişik".

Əvvəldə olduğu kimi yenə də bir çox vədlər verərək Kolumba sonsuz iltifat və məhəbbət göstərdilər. Öz təqsirlərini yumaq məqsədilə Bevadilanı işdən azad etdilər, amma əvvəldə Kolumb ilə bağladıqları şərtlərin ziddinə olaraq, onun İspaniyula getməsinə icazə verməyib öz yanlarında saxladılar. Müxtəlif bəhanələrlə Nikolay Avanı İspaniyulaya getməyə vadar etdilər.

Onların belə hərəkətlərinə görə Kolumbun səbr kasası daşdı, indiyə kimi öz dost və düşmənlərindən gizli saxladığı qəm-qüssəni artıq gizlətməkdə aciz idi. Hər yerdə Ferdinand və İzabellanın qədir bilməzliyindən, pis rəftarından danışmağa başladı. Kolumb haqqında edilən ədalətsizliyə qarşı camaat şaha hər cür tənə və narazılıqlarını bildirdilər. Qiymətli xidmətləri müqabilində ona edilən hər cür zülm və işgəncənin nişanı olaraq ayağına vurulmuş dəmir qandalı Kolumb evində saxlayırdı.

Kolumb belə zülmkar şahın tarix kitablarında bədnamlıqla yad edilməsi üçün vəfat edərkən haman dəmir qandalın onunla bir yerdə dəfn edilməsini vəsiyyət etdi...

Bevadila öz cahilanə hərəkətləri və yersiz qayda-qanunların tətbiqi ilə cəzirənin işində həddindən artıq qarışıqlıq törətmişdi. Buna görə də onun işlərində heç bir nizam-intizam yox idi. İspaniyalıların tikdikləri binalar xarabalığa çevrilirdi.

Bevadila Kolumba qarşı olan rəftarının pis olmasını başa düşüb, cəzirədəki həmvətənlərini özündən razı salmağa çalışırdı. O bu yolla Kolumb haqqında etdiyi zülm və işgəncəni öz üzərindən atmaq və bununla da yaxşı ad qazanmaq fikrində idi. Cəzirə işlərini inzibati nöqteyinəzərdən möhkəmləndirmək və onlara lazımınca diqqət yetirmək əvəzinə fitnəkarlardan, məhbuslardan heç birisinə təqsirinə görə müəyyən cəza tədbirləri görmürdü. Ölkənin vəziyyətini yaxşılaşdırmaq yolun-

da, Kolumbun qoyduğu qayda-qanunları dəyişə bilmədi. Biçarə hindlilərin haqqında isə heç bir ədalətə riayət etmədi. Onları bir qul kimi ispaniyalılar arasında bölüşdürdü. İspaniyalılar isə tətbiq etdikləri zülmdən başqa hindliləri gecə-gündüz başqa işlərlə yanaşı mədən qazmağa da məcbur edirdilər.

Bir tərəfdən ağır zəhmət, digər tərəfdən yeməyin azlığı və bədəncə zəif düşdükləri üçün hindlilərdən hər gün çoxlu adam tələf olurdu...

## NİKOLAY AVANIN İSPANYULA GƏLMƏSİ VƏ YENİ QANUNLAR QOYMASI

İspaniyula sakin olmaq məqsədilə 1500 nəfərin mindiyi 42 gəmilə yeni hakim həmin cəzirəyə gəldi.

Bu ölkə üçün İspaniya dövləti tərəfindən tərtib olunmuş qanun və qaydalar yerli hökumətə təqdim olundu.

Qoşunun köməkliyilə Bevadila öz hakimlik vəzifəsindən xaric edilərək araqarışdıran fitnəkarlarla birlikdə cəzalandırılmaq niyyətilə İspaniyaya göndərildi.

Avan ispaniyalıların həyatını və digər qayda-qanunları yoluna qoydu. Bundan başqa gələcəkdə onların mülkünə sahib olmağa heç kəsin ixtiyarı olmadığını hindlilərə elan etdi.

Qul vəziyyətində olan cəzirə sakinləri quldurluq əsarətindən azad edilərək İspaniya dövləti təbəəsi kimi elan olundular. Artıq zəhmətə düşməmək üçün onlara tapşırılan işin də miqdarını xeyli azaltdılar.

Çıxarılan qərara görə ispaniyalıların topladıqları qızıl dövlətin zərrabxanasına verilməli idi. Qızıllar təmizləndikdən sonra onun yarısını xəzinə götürəcəkdi...

1492-ci miladi ilində Kolumbun yeni dünyanın valiliyi haqqında bağladığı müqavilə və onun tətbiqi üçün etdiyi səylər puça çıxdı. Ferdinand Kolumb haqqında bir çox bəhanələrlə deyirdi: "Get-gedə vüsət tapan belə bir geniş ölkənin ixtiyarını əgər Kolumba versəm o, müstəqil şah olub İspaniya dövlətinə itaət etməkdən imtina edər".



Buna görə də Ferdinand Kolumbun hakim olmasına razılıq vermirdi. Buna oxşar İzabellanın Kolumba olan münasibəti də dəyişildi. Kolumb bir il bunların yanında qaldı. Kolumba aydın oldu ki, işi haqqında etdiyi bütün səylər faydasızdır.

Tamahkar və işə qiymət verə bilməyən bir şahdan heç bir şey gözləmək olmazdı.

## KOLUMBUN DÖRDÜNCÜ SƏFƏRİ

Ferdinandın Kolumba qarşı olan pis münasibəti və ya xidmətlərinin qiymətləndirilməməsi heç də onu yeni ərazi axtarmaqdan çəkindirmirdi.

O, qocalıq, xəstəlik və zəif düşməsinə baxmayaraq dördüncü dəfə dəniz səfərinə çıxmaq istədi. Kolumb bu dəfə Uzaq Şərqə, Peru və Hind Şərqi ölkələrinə portuqaliyalıların tapdığı yoldan daha asanını və yaxınını tapmaq isteyirdi. Bu arzusunu o, Ferdinand və İzabellaya məlum etdi. Onlar böyük məmnuniyyətlə aşağıdakı səbəblərə görə razılıq verdilər:

I Kolumb həqiqətən hörmətə layiq bir adam idi, onlar tərəfindən qiymətləndirilməyib bu iltifatdan məhrum edilmişdi. Eyni zamanda o, bir tərəfdən sarayın xidmətində qalıb, digər tərəfdən öz arzu və xahişi yerinə yetirilmiş olurdu.

II Kolumbu saraydan uzaqlaşdırmaqla onun tədbirlərindən asudə olurdular.

III Portuqaliyalılar Hindistandan avropalılar üçün çoxlu əmtəə malları gətirməklə, əməli olaraq ticarətin əsasını qoymuşdular və heç olmazsa asan yol tapmaqla portuqaliyalılara ispaniyalıların üstünlüyünə nail olmaq.

Bu səfərdən gözlənilən faydaya baxmayaraq Kolumb üçün dörd balaca gəmidən artıq gəmi hazırlana bilmədi. Kolumbun özünün də belə böyük vəzifədən o qədər də qorxusu yox idi, hər bir çətin işi öz bacarığı ilə asanlıqla həll edə bilirdi.

Kolumb səfərə lazım olan şeylərin azlığına əhəmiyyət verməyərək Varfulam və bir də ikinci oğlu Ferdinand ilə birlikdə 1501-ci miladi ili may ayının 9-da Qadiksdən yola düşdü. Qanariya cəziresindən keçdikdən sonra Peru ölkəsinə tərəf istiqamət aldı. Gəmilərindən

heç biri belə səfər üçün yararlı olmadığından İspaniyul cəzirəsinə gedib yeni hakim Avanın gəmilərindən birilə əvəz etmək qərarına gəldi. Daminqa limanına yetişən kimi 18 gəminin İspaniyaya getmək üçün hazır olduğunu gördü. Özünün sahilə gəlməsini, öz gəmisini buradakı gəmilərdən birilə əvəz edilməsi haqqında xahişini məktub vasitəsilə Avana bildirdi.

Kolumb nücum elmi vasitəsilə və uzun müddət gördüyü dəniz təcrübəsi nəticəsində yaxın günlərdə dənizdə tufan olacağını əvvəlcədən hiss etdiyi üçün, özünü bir tərəfə çəkməklə səlamət qala biləcəyini bilirdi. Buna görə də səfərin bir neçə gün təxirə salınmasını o, bəylərbəyi Avana da məsləhət gördü.

Avan inad edərək onun məsləhətini qəbul etməyib, onu yalançı və əfsanəçi adlandırdı. O deyirdi: Əhalinin işlərindən Kolumbun ətraflı xəbəri yoxdur və heç kəs də gələcəkdə nə olacağını deyə bilməz. Həmin saat gəmiləri yola saldı və Kolumbun sahilə çıxmasına icazə vermədi.

Kolumb hər hansı vasitə ilə olsa da özünü tufandan mühafizə etdi. Lakin İspaniyaya gələn gəmilərin yalnız üçü xilas ola bildi. Qalan gəmilər isə o dəhşətli tufandan xilas olmayıb fəlakətə uğradılar.

Bevadila və Roldan əsil fəsad törədənlər olub, biçarə hindlilərə müxtəlif yollarla zülm edirdilər. Özlərini İspaniya şahına yaxınlaşdırmaq üçün çoxlu qızıl və qiymətli mallar götürmüşdülər: Lakin onlar çərxi-fələyin hadisələrində öz əməllərinin cəzasını gördülər.

Kolumbun zəbt olunmuş malları da İspaniyaya göndərilən və xilas olan üç gəminin içərisində idi. Avam adamların çoxu Kolumbu, özünün xasiyyət və əxlaqına görə, bütün elmlərə sahib olmaqda bəşər cinsindən olanların arasında istisna təşkil edib öz düşmənlərindən intiqam almaq məqsədilə də onun bu tufanı cadugərliklə yaratmış olduğu fikrində idilər.

## BİHUDƏ AXTARIŞ VƏ KOLUMBUN HİND TƏRƏFİNƏ SƏFƏRİ

Kolumb İspaniyula cəzirəsinin vəziyyətini yoxladıqdan sonra başqa bir ərazinin tapılması fikrinə düşdü. Çox qorxu və çətinliklə Qandrus cəzirəsinin yaxınlığındakı Quvanay ölkəsinə yetişdi.



Bu yerin sakinlərindən bir neçə nəfəri gəmi ilə Kolumbun yanına gəlib ona öz nəvaziş və qonaqpərvərliklərini göstərdilər. Bunların güzəran və iş bacarıqları yeni dünyada olan tayfaların hamısından yaxşı idi.

Boyunlarında xalis qızıldan qayrılmış boyunbağılar asılmışdı.

İspaniyalılar öz təbii adətləri üzrə həmişə qızıl ardınca yüyürürdülər. Yerlilərdən qızıl mədənlərinin yerini soruşduqda, onlar qərb tərəfə işarə edərək deyirdilər: orada istədiyin qədər qızıl tapmaq mümkündür.

Kolumb, Meksikaya getmək və oradakı faydalı yerləri öyrənmək əvəzinə, buradan Hindistan ölkəsinə yol tapmaq məqsədilə şərqə doğru, Daryan körfəzinə tərəf yola düşdü. Gedərkən zəngin təbiətli, saf havalı bir ölkəyə təsadüf etdi. Buna görə də bu yeri Plu-visuya limanı adlandırdı.

Kolumb axtardığı yolu tapmaq üçün çox gəzib, çalışdısa nə yolu tapdı nə də Cənub dənizilə birləşən Meksika körfəzinə gəlib çıxa bildi.

Nəhayət qızıl mədənlərinin çox olması haqqında yerlilərin verdikləri məlumata əsaslanaraq o, qardaşını bir dəstə ispaniyalılar ilə burada qoyub, özü qoşun və başqa ləvazımat gətirmək məqsədilə İspaniyaya qayıtmaq istədi. Lakin qulluqçularının itaətsizlik və intizamsızlığı onun getməsinə mane oldu.

Qüvvə və hünərdə başqalarından üstün olan bu ölkə sakinləri ispaniyalıların həddindən artıq bədrəftar və tamahkarlıqlarına davam gətirməyib onlarla vuruşmağa məcbur oldular. Nəticədə ispaniyalıların çoxu qırıldı, yerdə qalanları isə müqavimət göstərə bilməyib qaçmağa üz qoydular.

Kolumbun keçirdiyi kədər üstünə bir neçə qəmli hadisələr də əlavə olundu. Azuqə azlığı, şiddətli küləklər, bərk tufan, bunlar hamısı ispaniyalıları həlak olmaq qorxusu qarşısında qoyurdu. Xülasə, gəmilərdən biri zədələndi, ikincisi isə getməyə davamsız olduğundan Kolumb onu aparmadı. Qalan iki gəmilə İspaniyaya yola düşdü.

Şiddətli külək onun sahilə çıxmasına mane olub gəmilərini Kuba cəzirəsindən uzaqlaşdırdı. Ləpələrin şiddətindən gəmilər zədələndi. Onlar böyük zəhmət və əziyyətlə İmayqaya gəlib yetişdilər. Gəmiləri təmir etməkdən ötrü sahilə çıxartdılar. Gəmilər həddindən artıq zədələndiyi üçün təmir edilməsi mümkün deyildi. Öz vəziyyətlərini

İspaniya əhalisinə bildirmək üçün vasitə tapa bilmədiyinə görə Kolumb cəzirə sakinlərindən kömək istədi. Safürəkli, mərhəmətli, təmiz və sadə adamlar olan cəzirə sakinləri onlara yazığı gəlib 40 mil məsafəsi olan İspaniyaya getməkdən ötrü gəmi hazır edib onlara verdilər.

Bu gəmilər sahili gəzmək məqsədilə qayrılmış içi yonulmuş böyük ağaclardan ibarət idi. Bunlar böyük səfər üçün davamsız idilər. Amma Kolumbun dəstəsində ona qarşı sədaqətli, adlı-sanlı ispaniyalılar da var idi. Bunlardan Məndis və Feixayda bu vəzifəni öz öhdələrinə götürüb min cür çətinlik və qorxu altında beş gündən sonra haman gəmilərlə İspaniyulaya yetişdilər. Doqquz ay burada qaldılar. Bu müddət ərzində Kolumb və onun yoldaşları xilas olmaq üçün heç bir yol tapa bilmədilər. Zülmkar Avan çətin vəziyyətə düşən belə bir şəxsin qayğısına qalmaq əvəzinə, öz hökmü altında olan bir ölkəyə belə onların gəlməsinə icazə vermədi.

Uzun müddət keçdi, amma İspaniyaya gedən yoldaşlarından heç bir xəbər olmadı. Gəmi heyəti böyük iztiraba düşərək özlərinin həlak olacaqlarını düşünürdülər.

Bu qorxulu girdabdan xilas olmalarını qeyri-mümkün hesab edən ispaniyalıların hamısı Kolumbu danlayıb, məzəmmət edirdilər. Nəhayət onlar böyük həyəcanla həlak olmalarına səbəb olan Kolumbu öldürmək fikrinə düşdülər. Bu zaman gəmi heyətindən bir dəstə bu diyarın əhalisindən alınmış on gəmiyə oturub İspaniyaya tərəf yola düşdülər. Bundan sonra Kolumbun vəziyyəti daha da ağırlaşdı. Yerli əhali ispaniyalıların burada uzun müddət qalmasından cana gəlib onlarla çəkişməyə başladılar. İspaniyalıların ehtiyacı üçün onlara verilən ərzaq və digər malları azaltdılar. Hətta ispaniyalıları tutduqları yerlərdən xaric etmək və ya onları tələf etmək qərarına gəldilər Əgər cəzirə sakinləri ispaniyalıları göydən gəlmə müqəddəs adam hesab etməyib Kolumb haqqında istədiklərini icra etmiş olsaydılar, o zaman Kolumbun vəziyyəti daha da qorxulu olardı.s

Kolumb nücum elminin köməyi ilə sabah gecə Ayın tutulacağını bildiyi üçün ikinci gün yerlilərin başçılarını öz yanına dəvət edib, onlara müraciətlə dedi: – "Biz göy adamlarıyıq, sizin bizə qarşı etdiyiniz bədrəftar və üsyan göyün qəzəbinə səbəb olmuşdur. Bu da onunla isbat olunur ki, bu gecə Ay öz bərəkətli işığını sizdən gizlədəcək və qəzəb əlaməti olaraq qırmızı üzünü sizə göstərəcək".



Gecə Ayın tutulması zahir olan kimi o sadəürəkli adamları həddindən artıq qorxu bürüdü. Canlarının qorxusundan özlərini Kolumbun ayaqlarının altına salaraq bu bəlanın dəf edilməsini ondan xahiş etdilər.

Kolumb onları bağışlayacağına söz verdi. Onlar hər bir cəhətdən Kolumba itaət edəcəklərini bildirdilər.

Bundan sonra Kolumbun tapşırdığı hər hansı bir vəzifəni onlar canlabaşla icra edirdilər...

## İZABELLA VƏ KOLUMBUN VƏFATI

İzabellanın ölüm xəbəri Kolumba yetişdi. O bu xəbərdən çox qəmli və pərişan oldu, çünki İzabella həmişə onu müdafiə edirdi. Təbiətində insaf və mürüvvət olmayan Ferdinand isə Kolumba qarşı mehriban deyildi.

Kolumb artıq İzabelladan sonra Ferdinandın köməkliyi ilə məqsədinə çata biləcəyi ümidini itirərək məyus oldu. Xülasə, Ferdinand Kolumbun xəstəliyini və ömrünün son günlərini yaşadığını nəzərə alaraq, onu müxtəlif yalan vədlərlə avara qoyur, səbəbsiz üzr və bəhanələrlə Kolumbun ərizəsinin cavabını təxirə salırdı.

Ferdinandın Kolumbun son günlərini yaşaması haqqında olan fikri həqiqətə çevrildi. Müxtəlif xəstəliklər, şahın onun xidmətlərini qiymətləndirməməsi üzündən aldığı kədərli təəssürat, məşəqqətli dəniz səfərlərindən çəkdiyi əziyyət və əzablar nəticəsində nəhayət Kolumb 1506-cı il may ayının 20-də Vladolid şəhərində vəfat etdi.

## AMERİKA QİTƏSİNİN DİGƏR YERLƏRİNİN KƏŞFİ

Kolumbdan sonra başqaları tərəfindən tapılan yeni dünyanın ayrı-ayrı ölkələri haqqında geniş yazmış olsaydıq bu, oxucuların yorulmasına səbəb ola bilərdi, ona görə biz burada bunlar haqqında çox müxtəsər məlumat verməklə kifayətlənirik:

1525-ci miladi ilində geniş əraziyə malik olan Meksika ölkəsi kəşf edildi.

1533-cü miladi ilində Peru ölkəsi kəşf olundu... Nəfis şeylərlə dolu olan bu bərəkətli və dövlətli ölkənin kəşfindən ispaniyalılar xəbərdar oldular.

Fransa, İngiltərə, Hollandiya, Portuqaliya və başqa dövlətlər müxtəlif əsrlərdə Amerikanın qalan cəzirə və yerlərini də kəşf etdilər[1]...

[1] A.Bakıxanov "Kəşfül-Qəraib" əsərinin ikinci hissəsini Şimali və Cənubi Amerika ölkələri haqqında – Peru, Meksika, Kanada, Florida, Panama, Amozon, Braziliya, Praqvay, Çili. Yeni Şotlandiya, Yeni Britaniya... ölkələrinin ərazi səthi, əhali miqdarı, körfəzlər, dağlar, çaylar, ab-hava və s. haqqında olduqca qısa məlumat verir. Onun verdiyi rəqəmlər XIX əsrin birinci yarısına qədərki dövrü əhatə etdiyi üçün ancaq coğrafiya mütəxəssisləri üçün maraqlı ola bilər (*mütərcim*).





...Əmma bəd pabəsteyi-səlasili-möhnət və giriftari-zindani-məhəbbət.*

## FƏRD

Bəsteyi-dami-aləm, pamali-ənduhi-məlal,
Bülbüli-gülüzari-möhnət Qüdsiyi-şuridəhal

bu rəsmi dilaviz ilə firqeyi-ülul-əlbabə bəyani-mafilbal etmiş və əlvahi-zəmairi-ərbabül-bəsairə bu şiveyi-zövqəngiz ilə qələmi-əlam yürütmüş ki, çün məzmuni-hikmət məşhunil-ərvahi-cünudi məcənnədə təarifi-minha etmədən və "Ma təkərrümiha" ixtilafi-dəlalət ilə xələti-xilqəti -işbah geymədən rəqabeyi-zənciri-məhəbbət çəkmişlər və riyazi-vücudi-bəşəriyyədə və "həmdəhül-insanü fəkanə zülmən cəhulən" misdaqincə nihali-möhnət əkmişlər. Labüdd aləmi-surətdə iqtizayi-təbiəti-bəşəri oldur ki, hər kimsə gərək bir növ mənzur ilə cilabəxşi-dideyi dil olub, ovqati-şərifi zaye və bihudə keçirməsin və bəzmi-həvadisdə cami-qəflətdən təbi-talibi-hüşiyarə badeyi-cəhl içirməsin.

Hər dildə ki, yox nişaneyi-eşq,
Arayişi-qəm, fəsaneyi-eşq,
Əlbəttə deyil kəmalə qabil,
Ovqati keçər, vəli nə hasil?
Bibəhrə qalar bu müddəadən,
Təhsili-ləzayizi-səfadən.
Ey dil, duta gör xəyal zövqin,
Ta dərk edəsən vüsal zövqin.
Eşqilə cahanda biniyaz ol,
Amma rəvişinlə pakbaz ol!
Ol vəchilə ki, qılıbdır Əsgər,

[1] Ulduz (*) işarəsi qoyulmuş misra və mətnlər kitabın axırında şərh edilmişdir.

Meyli-həvəsi-liqabi-dilbər.
Dəhr etsə əgər cəfa iradə,
Sindan kimi səxtdir vəfadə.
Vər başına çalsa dəsti-matəm,
Çakuc kimi çərx, çəkməz ol qəm.
Ah ilə olur dəhən yolu bənd,
Ləbrizi-şərarə kurə manənd

Məzkur olan aşiqi-sadiqi-suxtəcan və məztur olan dərd-məndi-müstəməndi-hali pərişanın təlxisi-bəyani-hali və izhari-süluki-möhnətü məlali olur ki, Quba şəhərində Ahəngərzadə Əsgər adlı bir cavani-növrəsü şirin şəmaili-dilfirib olub ki, hüsnü bəyani-məqaldə və səbahəti-surətdə camalda ədimül-misal idi.

Bir çeşmi siyahü afəti-dil,
Bir qaməti sərv, çöhrə gülnar,
Bir kəc külahi ki, zülfü kakil,
Boynuna salıb misali-zünnar.
Hər ləhzə qıya baxanda çeşmi,
Asari-qiyamət eylər izhar.
Bülbül kimi sovtü ləhni dilkəş,
Xoş ləhcə, sənəmlər içrə sərdar,
O, qönçə dəhəndə cəm olubdur,
Təsiri-sədavü hüsni-rüxsar.
Zülmə xəti etirafnamə,
Küftarı fünuni-mehrə inkar.

Əlqissə, ol cavani-suxtəcan həmişə rüəsi-mənabirdə və məcməi-əkabirdəvü əsağirdə mərsiyəxan, bəlkə kəndisinin əvaqibi-ümurin yad edib həmqərini-naləvü əfqan olurdu. Və bu fənndə ustad olan bir yeganeyi-ruzigardan ki, növhəxanlar sərxeyli idi, kəsbi təəllüm edərdi və gah-gah hərəmsərayi-iclalına məhrəmiyyət yolu ilə gedərdi. İttifaqən ol şəxsin sədəfi-ismətdə bir gövhəri-şahvari və gülşəni-iffətdə bir laleyi-novxiz gülüzari var idi ki, zülfi-girehgiri sərgəştə aşiqlər mürği-ruhin seyd etmək üçün türreyi-dam tək xəmdərxəm, xali-cansitani ol dam içrə danə idi. Və çeşmi-kafər-nigahi-siyahi xəncəri-müjgan əldə dutub şiveyi-xunrizlikdə mütərəssidi-bəhanə idi.



Bir dilarami-cahan seyrəti-hur,
Afitabi-fələki-hüsnü sürur.
Dilbəri-məhvəşi-şirinhərəkat,
Buti-siminbədən hur süfat,
Qəddi bir sərvi-rəvan, mayeyi, naz,
Ki bülənd ondan olur payeyi-naz
Vəh nə qamət, nə qiymət, nə füzun!
İstiqamətdə əilf tək mövzun*.
Bəlkə sərriştəyi-ərbabi-nicat.
Vəh nə zülfü nə səvadi-giysu!
Sünbüli-pürşikənü ənbərbu,
Mərhəba əbrüyi-xəm şəkli-hilal,
Zibibəxşi-şəfəqi-arizi-al.
Vəh nə qaş! – sərxəti-məhbubeyi-naz,
Lacərəm guşeyi-mehrabi-niyaz.
Vəh nə göz! bəlkə qəzali-vəhşi,
Nigəhi-şuxi, misali-vəhşi.
Müjələr hər biri bir xəncəri-tiz,
Qətli-uşşaq üçün olmuş xunriz,
Dutub ol qədr cəmali zivər,
Ki, deyil hövsələyi-hüsni-bəşər.

Əlqissə, ol iki atəşparə bir-birə yetmək ilə atəşi məhəbbət nairə-əfruz olub xərməni-dilü dini yandırdı.

Ol iki əsiri-zarü məhcur,
Bir camdən oldu məstü məxmur,
Eşq ilə tutub kəmal peyvənd,
Zənciri-bəladə oldular bənd.
Sərriştəyi-əqlə tab düşdü,
Canü dilə iztirab düşdü.

Gün-gündən asari-ülfətü cəzabati-məhəbbət ziyadə olub rəsmi-iştiyaq bir məqamə yetdi ki, zövqü aləmdə güya iki cismdə bir ruh oldu. Bu əsnada müəllimi-mövsuf aləmi-həvadisdən qəti-rəvabəti-əlayiq edib, həmağuşi-ərayisi-hura və neşəyabi-sağəri-şərabən təhura oldu (rəhmətullahi-əleyh) və əhli-beyti-naşünasın, xüsusən Hüseynü Abbasın və müxəlləfatdan əmmamə, pustin və əbasin, cübbə, şanə,

misvak və ridasin, küləcə, şali-kəmərbənd və qabasın ol cəvanə vagüzar edib yerində canişin etdi. Ol dəxi kəmali-iftixarü nişatü nəhayət sürurü inbisat ilə məhrəmeyi-hərimi-visal olub zövqilə-ruzigarın keçirirdi.

Xoşa ol aşiqi-dilxunə kim zövqü sürur ilə,
Nigari-gülüzarı lütf üzündən mehriban olmuş.
Deyib məşuqi kim tərk eyləyim cövrü cəfa rəsmin,
Edib bir dəm tərəhhüm kim, yazıqdır bağrı qan olmuş.

Ta ki, müruri-zaman ilə firqeyi-eybcu və taifeyi-tənəcu yəni əğyari-dilazarü sitəmşüar bu halə vaqif olub zəbani-təərrüz açdılar. Çün növgüli-çəməni-ahəngər aşiqi-dilxun Əsgəri-müztər gördü ki, surəti-haldan xəlayiq müttəle olub məcali-visal imkanı məhal oldu və minbəd bəhanəsiz ol yerə getmək mütəəzzirdir, dəmbədəm ahü nalələr çəkib deyirdi:

Ah, kim dövri-fələkdə ixtiyarım qalmadı,
Aləmi-dunpərvər içrə etibarım qalmadı,
Ruzigarım xoş keçirdi dövləti-dildarilə,
Ayrılıq həngamıdır, ol ruzigarım qalmadı.

Bir gün əğyardan məxfi özünü ol şuxi-gülgun üzarə yetirib dedi:
– Ey yari-mehriban! Ey arami-dilü can! Vey nazikbədən, gülpirəhən! Ey şəkərləb, şirinsüxən! Ruzigari şöbədəbaz və zəmaneyi-hiyləsaz fitnələr ağaz edib, dövləti-vüsalə möhnəti-fəraq yetirmək istər. Nə çarə edim?

Dövrani-fələk nədir ki, bilmən,
Bivəch bizimlə oldu düşmən.
Təfriq üçün ah kim dəmadəm,
Təmhid qılır vəsaili-qəm.

Ol, şəkərləb, şirinzəban bu sözləri eşidib, çaki-giriban edib, üzünü atasının qəbrinə tutub, şivən ilən səsləndi: – Ya əkəllülhələvat! Ey atacan! Bir baş qəbirdən götür! Biz pərişanruzgar, tirəbəxtlərə nəzər qıl! Bivəfa ərdəbillilər əlində necə zarü sərgərdan qalmışıq!



Dilxun qəribi, bizə bir yar tapılmaz,
Qəmxar tapılmaz.
Bir həmdəmü həmrazü həvadar tapılmaz.
Ənsar tapılmaz.
Düşmənlər edər tənə, dutar rəsmi-cəfasın,
Bu dərdi-nihani,
Yoxdur bizə bir rəhm qılan sahibi-namus,
Səd ah, səd əfsus!
Bu şəhridə bir mömini-dindar tapılmaz,
Gər var, tapılmaz.
Dil qanə dönüb təneyi-əğyar qəmindən,
Xəlqin sitəmindən.
Şərhi-qəm üçün fürsəti-izhar tapılmaz,
Didar tapılmaz.

Ah, bunları bu hal ilə görüb və dəsti-müsibət başa vurub kim gəldi?

BEYT

Hüseyn! Hansı Hüseyn! Dudmanın şərəfi,
Desəm dürüstünü əhli-zəmanə naxələfi,

dedi:
– Bacıcan! Nə əmri-hadis bu ənduhə bais olubdur?
Dedi:
– Ah! Qardaş, kaş sənin kimi naxələf ölə idi, bu günləri görməyə idi:

Nə tab edim belə bidadə ya əxul-idbar,
Alıb qərarımı dövri-sipehri-gəcrəftar.
Nəvayi-eşqilə ney tək dolub quru cismim,
Zaman-zaman çəkərəm bəs ki, ahi-ətəşbar.

Qərəz, onlar ağlayıb nalə edirdilər. Əsgəri-biçarə gəlib qolların məşuqəsinin boynuna salıb və üzündən öpüb dedi:
– Ey arami-canım! Fikr elə ki, atandan qalan əmmaməni başıma qoyub, əbasın çiynimə salub və qəbasın qucağıma alıb bir nifrin elərəm ki, düşmənlərimizdən biri də yer üzündə qalmaz.

Çün eşq odu əgər dutuşa canı yandırar,
Bir şölədir ki, cümleyi-dünyanı yandırar,
Məzlum aşiqin əgər ahi bülənd ola,
Yeddinci göydə xərməni-Keyvanı yandırar.

Xülasə, ol məzlumə dedi:

– Ey aşiqi-mehribanım! Bu sözlər fayda verməz. Bir fikir elə ki, sən bu yerə gəlmək üçün əlində bəhanə olsun və xalq bəd güman etməsin.

Dedi:

– Ey yari-mehribanım! On şahi pul sənə verim, amma məni rədd etmə, hər vaxt gəlib ol məbləği mütalibə eyləsəm bir bəhanə ilə təxir et. Bəlkə bu vəsilə ilə bir-birimizi görmək müyəssər ola.

Cümləsi bu rəyi-dürüsti qəbul edib, bir müddət dəxi ovqat keçirdilər:

Aşiqdə gərək fünuni-hiylə,
Ta eyləyə vəsl üçün vəsilə.

Nagah bir ğəmmaz süxənçin bu sürəti-macəranı əla macəra varıb ol məhəllə rəisinə məlum etdi. Ol rəis dəxi müvəkillər təyin etdi ki, hər yerdə ol aşiqi-dilxuni görsələr tutub şikonceyi-siyasətə yetirsinlər. Əsgəri-müztərdən nəqldir ki:

- Çun rahi-çarə hər tərəfdən məsdud oldu və rəis ilə saziş etməkdən başqa çarə görmədim və dedim:

Zülmü gör kim, ayrılıqdan canə yetdim aqibət,
Çarəsiz qaldım varıb əğyarə könlüm bağladım.

Axirül-əmr bir gün əlimə bir parə nan alıb üstündə rovğəni-kərə tışrə çıxdım. Rəisi-məzkur mənə düçar olduqda təarif ilə ona verib dedim:

– Əgər həqqi-neməti fəramuş edib, mənə təərrüz qılsan, bu nan gözlərini tutsun və səmumi-küfrani-nemət gülşəni-ömrünü xəzan etsin:

Məni həzinə gəl Allah rizası cövr eləmə,
Ki, aşiq ahi tutar zalimin giribanın.



Dedi:

– Ey aşiqi-miskin! Bundan sonra fariqülbal olub bəzmi-vüsalə məhrəm ol, kimsədə cürəti-təərrüz sənə yoxdur:

Çəkmə qəm ey – aşiqi-dilxəstə mən yarəm sənə,
Özgələr cövr eylədikdə mən həvadarəm sənə.

Əlqissə, bu tedaddan dəxi fariğ olub məşğuli-işrətü nədimi-məhfili-məsərrət ikən:

Ol xəstəcigər bəlayə düşdü,
Bir qüssəli macərayə düşdü.
Çərx eylədi dövri-namüvafiq,
Hicran sitəmi araya düşdü,
Aləmdə həmişə qüreyi-qəm.
Üşşaq günü qərayə düşdü.

Gərdişi-dövrani-kəcrəftar və iyzai-firqeyi-əşrar, toieyi-dilşkəni-əğyar və sədəmati-həvadisi-ruzigardan aşiqi-suxtəcan ilə məşuqeyi-mehriban arasında müfariqət vaqe olub, biri avareyi-diyar, biri vətənində qərib, biqəmküsar oldu.

Necə tab etsin dili-şuridə canandan cüda?
Bisərü-saman qalır hər mülk sultandan cüda.

Aşiqi-biçarənin cismində can canan idi,
Necə şivən qılmasın kim cism olur candan cüda?!

Xülasə, ənvai-naləvü şivən ilə bir-birindən vida edib, məşuqə səfər qıldı. Və aşiqi-məhcur dideyi-xunbarilə bikəs qaldı. Guya mükərrər bu şeri oxuyub ağlardı:

Sənsiz dili-xəstə zar olubdur,
Bimunisü qəmküsar olubdur.
Xunabə tutubdu rəngi-zərdim,
Bu gülşən üçün bahar olubdur,

Xunin cigərim bə sani-lalə,
Əfsürdəvü dağidar olubdur.
Hicran sitəmi alıb qərarim,
Gün nuri gözümə tar olubdur.
Hicrində düşüb bəlayə Əsgər,
Sərgəştəyi-ruzigar olubdur.

Ol məzlumeyi-qəmnak dəxi gündüzlər seylabi-əşkibiqərarın dəlilirah, gecələr şəmi-şəbistanin şöleyi-ah edərdi. Qafileyi-əşkü ahilə həmsəfər, dil pürateşü didə tər, hər mənzilə kim virud edər bu novilə ağazi-sürud edərdi:

Ey mayeyi-eyşü kam, sənsiz,
Xunin cigərəm, müdam sənsiz.
Hər dəm mənə qasidi-fəraqin,
Qəmdən gətirir pəyam sənsiz.
Eyb etmə sözüm müşəvvəş olsa,
Yox təbidə bir nizam sənsiz.
Seyri-çəmənü kəmali-işrət,
Əiduhim olur tamam sənsiz.
Dünyada hüsuli-şadimani,
Olmazmı mənə haram sənsiz?!
Mən bikəsə künci – möhnət olmuş,
Hicran gecəsi məqam sənsiz.

Zaman-zaman yadi əyyami-vüsal etmək ilə gülü-seyrabını giribançak edərdi və ləhzə-ləhzə təmənnayi-zövqi-mülaqat eyləməkdən laləsüfət daği-həsrət sineyi-suzanə çəkərdi və bu şeri oxurdu:

Bülbül necə gülzar ətəyindən əlin üzməz.
Şüvən dili-bimar ətəyindən əlin üzməz?!
Qanilə boyar səfheyi-ruxsarımı gül-gül,
Dil, dideyi-xunbar ətəyindən əlin üzməz.
Dil dərdü-bəla çəkmək ilə qəmdən usanmaz,
Ol şuxi-cəfakar ətəyindən əlin üzməz,
Göz pərdəsi xunabilə rəngindir, əmma,



Nəzzareyi didar ətəyindən əlin üzməz.
Əqsami-bəlavü qəmi-ənvai-müsibət,
Üşşaqi-cigərxar ətəyindən əlin üzməz.[1]

Bilmərrə daməni-şəkib dəsti-iqtidarından gedib tabi-fəraq etmədi və arizuyi-dövləti-didar qılıb bir müddət sonra yenə müraciət edib, mücaviri-kuyi-canan olmaq istədi. Qürbi-şəhrə yetdikdə aşiqi-məhcur kim ahi-cansuz çəkməkdən gülbərgi-üzari ovraqi-xəzan tək saralmışdı və bari-müsibət həmlindən qaməti-movzunu xəm olmuşdu:

Təravəti-güli-ruxsarəsi xəzanə dönüb,
Qədi xəmidələnib, qaməti kəmanə dönüb.
Sirişki-didə rəvan seyli-kuhsaran tək,
Cigər şərarə tutub qəmdə, bağlı qanə dönüb.

Məşuqeyi-dilaranın xəbəri-vürudin istima etdikdə bəstəri-mərizdən durub, əlinə bir əsa alıb, haləti-zəfdə kəmali-qüvvət ilə şəhərdən tışrə çıxdı, guya bu sözləri deyirdi:

Söylə ey həmdəm, kərəm qıl hali-yarımdan mənə,
Haq rizası, bir xəbər ver gülüzarımdan mənə!
Rövşən eylə rəhgüzarim gəl ey ahi-atəşin,
Tar olubdur ruzi-rövşən intizarımdan mənə.

Nagəh gördü kim karivani-Leyli, məhbublar sərxeyli yetişdi. Nəhayət şövqilə yügürüb özün onun ayağına salıb bu növ ədai-şükr etdi:

Lilləhül-həmd ki, çərx etdi müyəssər kamım,
Cövri-bidadilə hicr almış idi aramım.

---

[1] Başqa bir nüsxədə

Kakilin sevdası gün-gün biqərar eylər məni,
Arizuyi-arizin biixtiyar eylər məni,
Müttəsil ahu şikari-mərdüm olmuş, türfə kim,
Tiri-müjganilə bir ahu şikar eylər məni.
Məhfili-eşq içrə yadi-çeşmi-məxmurin sənin,
Cürənuşi-cami-zövqi nagüvar eylər məni.

Pəs, ol kim müstəməndi-cigərxun biri-birini qucaqlayıb sədayi-təhniyətü avazi-mübarəkbad zəminü zamandan büłənd oldu, məşuqə nəzəri-həsrətilə baxub dedi:

– Ey aşiqi-dilxuni-müztər, ey novgüli-çəməni-ahəngər!

Bu nə haləti-mükəddərdir kim, müşahidə qılıram? Aya, gərdişi-dövranü izai-əbnai-zaman sənə nə zülmlər etmiş ki, surəti-halın bu məqamə yetmiş?

Əsgəri-biçarə bu sözləri istima edib, seylabi-əşki-çeşmsari çeşmindən cari edib dedi: Ey yari-dilnəvaz, ey şuxi-işvəbaz!

Ey rövşəneyi-dü çeşmi-xunbar,
Arami – dili – həzini-bimar!
Kami-dilü arizuyi-didə.
Asayişi-cani-möhnətasar.

Kim mənə izayi-hal etməyə qadir olur? Surəti-əhvalimə təərrüz qılır kim, bu növ dilxəstəvü rəncur etsin? Və ya gərdişi-dövrandan, aləmi-həvadisati-zəmandan nə bakim var ki, əncami-karim bu məqamə yetsin?

Mənəm novgüli-bağı-ahəngəri,
Mənəm valideynin əziz Əsgəri.
Mənəm kim, atam çakucundan səda,
Alır günbədi-çərxi-neyluferi.
Onun kurəsindən büłənd olsa gər,
Fələkdə şərər yandırar əxtəri,
Verir xəlqi suri-Srafiltək,
Fənayə onun dəminin dəmləri*.
Əgər Gavə tək rəyəti-rəzm aça,
İtaət qılar aləmin əksəri*,
Onun sümtəraşi zibəs tizdir,
Edib-münfəil tiği və xəncəri.
Əgər görsə Rüstəm onun zərbini*,
Şücaətdə eylər vücudun bəri.

Amma sənin dağı-fəraqindən bu növ pərişan olmuşam. Və həvayi-güli rüxsarindən qönçeyi-növxiztək bağrı qan olmuşam.



Sənin fəraqın alıbdır qərarü taqətimi,
Səmumi-qəhrilə bərgi-gülüm xəzan olmuş.
Edəndə yad o gün arizin ənadiltək,
Həmişə virdi-ləbim naləvü fəğan olmuş.

Məşuqəsi dedi:

– Ey cani-şirin! Mən dəxi səndən ayrı çəkdiyim bəlaləri şərh etsəm, baisi-italeyi-məqal olur ki, ədəmi-izhar münasibdir. Hala bir tədbir et kim, səbəbi-müvasilət olsun.

Bir yan fələk cəfası mənimçün qəm artırır,
Bir yan zəmanə gərdişi min matəm artırır.
Bir yan həsud tənəsi bağrımı qan edər,
Bir yan qərib covri bəla hər dəm artırır.
Eşqin bəlası sineyi-pürxunə ah kim,
Hər ləhzə bir cərahəti-bimərhəm artırır,
Bunlar qamusu səhldir, asan tədariki,
Hicran dili-həzinə qəmi-aləm artırır.s
Bir çarə fikrin eylə məcali-vüsal üçün,
Hicrani-dövr daryeyi-əzəm artırır.

Və atan ovsafini bəyan etdiyindən, maderi-mehribanım dəxi ona təəşşüq yetirmiş. Nə ola əgər varub təcəssüsi-əhkami-şəriət edəsən, əgər caizü mübah olsa, məni sən aldıqdan sonra valideyni-namidarimi də ki, validi büzürgüvarın təzvici ilə şad qılasan ki, əhli-beyt arasında təfriqə düşməsin. Və Abbas, Hüseyn bir-birindən ayrılmasın və məcmu müxəlləfati-mətrukatə malik olub validi-alimiqdarım məqamində namülbədəl olasan.

Bir daha qismət bizə ənduhi-hicran olmasın,
Xatiri-cəmiyyətim qəmdən pərişan olmasın.
Ta ki, təxti-gülbün üzrə gül qoyar başına tac,
Könlümün şəhrinə səndən özgə sultan olmasın!

Pəs, Əsgəri-biçarə dəxi bu məsləhətdən mülahizeyi-ümidi-xeyr edib, bir fazili-fərzanə və yeganeyi-dövri-zəmanə hüzurinə varıb kəşfi-məal təriqilə istifsar qıldı ki:

– Bir kimsə əgər bir səbiyyəni həbaleyi-nikahə gətirsə, nagah validimənguhə validəsindən təməttöi-təzvic almaq caizmidir?

Çün məzhəbi-eşqdə bu surət məqami-əşkal idi, ol fazil məsələni fitvayi – piri – eşqə mühəvvəl qıldı. Hənuz kaşaneyi-uqdeyi-mətləb təviqdə qalmışdı. Bir gecə kim, ərusi-cahanaray mehri-ənvari-zülməti-şamdan zülfi-mişkin rüxsarinə töküb hicleyi-rübdə aram buldu və mahi-şəbəfruz məclisi-sur mürəttəb edib ki, şəbi-tarı qeyrəti-ruz və surəti-Leyli tək zinətənduz qılıb dirhəmü dinar səvabitü səyyari-əflakdan təbəqlər doldurub nisar üçün amadə qıldı:

Mehr oldu büsati-çərxdən dur,
Mah aldı əlinə şəmi-kafur.
Bir türfə şəbü xücəstə fərcam,
Onun kimi görməmişdi əyyam.
Novruz günündən ol füzun qədr,
İzzətlə misali-leylətül-qədr.

Cümlə xəlayiq xabi-rahətdə olub Əsgəri müztər səri-təhəyyür balini-ənduhə qoyub, gah əğyari-dilazar cövrin yad edib naləvü əfğan çəkərdi, gah möhnəti-fəraqi-gülüzardan, seylabi-əşg səfheyi-rüxsarə tökərdi və deyərdi:

Qəm canimə qəsd eylər əlim yarə yetişməz,
Mətlubə nədəndir dili-biçarə yetişməz.

Hicran çəkərəm hali-pərişan, günüqarə,
Ümmid əlim ol türreyi-tərrarə yetişməz.

Başlar dili-şuridə fəğan yardən ayrı,
Bir bülbülə manənd ki, gülzarə yetişməz.

Aramımı bir dilbəri-şirindəhən almış,
Kim, tuti dili ondakı köftarə yetişməz.

Hərçənd ki, var qönçədə yüz növ nəzakət,
Bihudədir, ol ləli-gövhərbarə yetişməz.

Guya tutalım hüsndə-məşhuri-cahandır,
Rüxsari-gül, amma güli-rüxsarə yetişməz.

Yansın bu necə tale varundu ki, Əsgər,
Ömrün tükədir hicrdə, dildarə yetişməz.



Və gəh fələki-kəcrəftardən şikayətlər edib bu sürud ilə mütərənnüm olurdu:

Görəyim dövrü fələk mən kimi naşad olsun,
Qoymadı əhli-vəfa qüssədən azad olsun
Dağılıb bir-birə dəysin bu rəvaqi-niyli,
Könlümün şəhri-kimi qübbəsi bərbad olsun.

Və gah məhbubeyi-dilarami-cansitanının şahidi-xəyalini müxatəb qılıb söylərdi:

Yox səndə qəmi-eşqdən ey dust nişanə,
Mən qəmzədənin surəti-halın nə bilirsən?
Sən bəstəri-rahətdə tutub təkyəgəhi-xab,
Aşiqlərin ənduhi-məlalin nə bilirsən?

Xülasə, ol qədər nəlavü şivən qıldı ki, bihuş olub, dideyi-zahirbini bağlanıb çeşmi-bəsirət açdı. Aləmi-röyada gördü ki, məğfuri-mərhum, müəllimi-məlum qəbrindən qiyam edib məscidə gəldi. Mənbər üzrə çıxıb mövizələr qılırkən dedi:

– Handadır mənim canişinim?

Pəs, Əsgəri-xunincigər ləbbeykguyan ehrami-ixlas bağlayıb təhsili-səfayə səy edib, kəndisin kəbeyi-məqsudə qurban verməк üçün məqamından durub hüzurinə getdikdə dedi:

– Ey nuri-didə! Düxtəri-nikəxtərimi sənə təzvic etdim. Bundan sonra mənim malım və əyalim sənə məxsusdur. Amma gərəkdir ki, mənim Abbasımı əziz tutasan, nəvazişlər edəsən:

Yetim olan kəsə əlbəttə qəmküsar olmaz,
Zəlili-aləm olur, izzü etibar olmaz.
Bəlalar içrə qılır dərbədər, dəmi keçməz
Ki, bağrı qanə dönüb didə-əşkbar olmaz.

Ələssəbah kim, talieyi-sübhi-sadiq bu məzmuni-zövq əfzayə müvafiq kəraneyi-üfüqdən zahir olub giriftari-zülməti-aləm olanlara ruzi-rövşəndən bəşarətlər vrdi. Əsgəri-müztər bu röyayi-sadiqdən əhbabə hekayət qıldı və müsaidəti-əltafi-zülcəlalə talib olub, mütərəssidi-təvil oldu və bu rübaini virdi-zəban etdi:

Kərçi ahü naleyi-biixtiyar eylər könül,
Zikri övsafilə dəfi-intizar eylər könül,
Hicr əyyamində bəs kim, qüssə tul əncam olur,
Səatin-ay, hər günün bir il şümar eylər könül.

Ümidvaram ki, inşallah təala ənqərib peyvəndi-müvasilət aralarında vaqe olub, ədai-təhniyət qılıb, mübarəkbad edim və ol məzmunə nüsxeyi-cədid inşa qılım:

İlahi, bu duami müstəcab et,
Hüsuli-mətləbi-feyz intisab et!

***

Əlhəmdü livahibül-ətiyyə
Voşşükr lixaliqil-bəriyə...
Kim, xameyi-mişk barim etmiş,
İzhar məratibi-əliyyə.
Bir türfə kitab edib mürəttəb
Əhbab üçün etmişəm hədiyyə.
Tövfiqi-səadətilə olmuş,
İtmam: "Kitabi-Əsgəriyyə".
Şayəd ki, vəsiləyi nicatım
Olsun bu ümuri-mənəviyyə.





Ey düzlüyü sevən, eşqi gəl eyləmə məzəmmət,
Zahidlikdə mən görmürəm nicat üçün əlamət.

Küfrilə din heyran qalıb, onlar kimi arayır?
Daraq, kimin mişk ətirli saçlarını darayır?!

Mən duyuram ruh oxşayan yar ətrini inanın,
Can mülkündən xəbər verir iltifatı cananın.

Nəşə verdi yar camından nuş etdiyim hər damla,
Bir ad ilə bəzədim bu kitabımı inamla.

Ki onun pak hümmətinin feyzi ilə hər zaman,
Parlaq günəş zühur edər adi qara torpaqdan.

Hər nə qədər tərifini mən söyləsəm var yeri,
Odur bizə kəşf eyləyən bilinməyən şeyləri.

O səadət günəşidir mənə odur nur verən,
Odur mənim hər zərrəmdə yüz möcüzə göstərən.

Bu canımdır ancaq onun bir müşkatül-ənvarı,
Bu qəlbimin xəznəsidir onun gənci-əsrarı.

Bu kitabda istəyirəm yazım onun sirrindən,
Qoy "Mişkatül-ənvar" – deyə adlandırım onu mən.

Qəribədir, tarixi də sanki doğmuş əsrardan,
Hasil oldu can adı da bu "Mişkatül-ənvar"dan*.

Ey misilsiz cavan, çalış hümmət eylə hər işə,
Cavanbəxtsən, qoca kimi tədbirli ol həmişə.

Cavanlıqda dərdlər məni tez qocaltdı, durma get!
"Var"ın "yox"un cəfasından varlığını xilas et!

Ey işıqsız gözlərə nur bəxş eyləyən gün kimi,
Ey zavallı aşiqlərin dərdlərinin həkimi.

Bu xəstəyə qəmzədən lütf et bir dərman göndər,
Gülüşündən bu ölmüşə ruh ver, yeni can göndər.

Qüdsini sən bir səhrada qoyma qalsın sərsəri,
Öz yolunu itirənin axı sənsən rəhbəri.

Həqiqətə çatmaq üçün mənə doğru yol göstər,
Nədə bir səhv etsəm onu, bir mürəbbim ol, göstər!

## BƏYANİ-HAL

Badisəba, qurban olum, aç qapımı əsərək,
Mənə səndən başqa yoxdur bu dünyada bir kömək.

Yubanmadan gedib Səlmə adlı yara ver salam,
Söylə səndən başqa daha yox qəlbimdə bir məram.

Dərd evinin bir küncünə düşüb qalmış xəstədən,
Şikayətlər yetər ona, söylə solub bu bədən.

Bəla məndən əl çəkməyir, son qoymur bu hicrana,
Faniliyi alqışlaram qismət olsa bu cana.

Bu ayrılıq odu əcəb yandırıb yaxdı məni,
Ömrüm tamam puça getdi, yandı həyat xərməni.

And içirəm o hərəmdən qalxan mişkin qubara,
And içirəm bir an belə atmadığım ilqara.

Hər an onun xəyalilə döyünmüşdür ürəyim,
Ondan başqa olmamışdır heç bir arzum, diləyim.



Səhər günəş qaldıranda bayrağını üfüqdən,
Yana-yana qəm ardınca qoşmadayam yenə mən.

Səhər kimi köynəyimi çak edirəm mən də bax,
Ürəyimdən ah çəkirəm ara-sıra yanaraq.

Bütün günü belə keçir kədər dolu bu həyat,
Gecə olcaq bir zülmətə batır yenə kainat.

Günəş göydən son nəfəsin dərib məhzun gedincə,
Səyyarələr gözlərindən qan axıdır hər gecə.

Ağlar, ağlar səmalər də bir matəmə bürünər,
Onun qanlı yaşlarıyla al boyanar üfüqlər.

Yüz ələmlə, yüz kədərlə nalə-fəryad edib mən,
Əl qaldırıb asimanə söyləyirəm ürəkdən:

"Ey ilahi, ürəyimi parçaladı bu həsrət,
Gözlərimdə nurlu gündüz oldu qatı bir zülmət.

Yarəb, məni məhv eyləyir bu ayrılıq, bu hicran,
Səbrim daha tükənmişdir, kömək ol, ey yaradan!

Nə vaxtadək məhrum olum, dərdlə belim bükülsün,
Nə vaxtadək piyaləmə ürək qanı tökülsün?!

Nə vaxtadək əzab çəkim, qan-yaş töküm cahanda,
Nolar mənim üzümə də bağlı qapı açanda?!

Mən nə qədər gözü yaşlı, qəlb odunda qovrulum?
Bu havadan torpaq kimi mən nə qədər sovrulum?*

Bu beytini ah nə yaxşı söyləmişdir bir şair,
Bu lap mənim işgəncəli əhvalıma oxşayır:

"Ey ilahi, haradadır axı mənim nəsibim,
Mən həsrətdən can verirəm, hanı mənim təbibim?"

## MƏQSƏDİN KƏŞFİ

Dostlar, mənim əhvalımdan siz olunuz xəbərdar,
Görün mənim şadlığımdan qalmışdırmı bir əsər?

O şəxsin ki, məhv olmuşdur hər arzusu, gümanı,
Ağlamaqdan başqa nədir onun dərdə dərmanı?

Ürəyimdə çoxaldıqca hər istəyim, həsrətim,
Bir o qədər ümid sönür, artır dərdim, möhnətim.

Dostlar, məni xatırlayıb saldınızmı yada bir?
Yoxsa belə biganəlik sizə daha xoş gəlir?

Qəm əlində əsir olan bir qəribəm indi mən,
Bir şey yoxdur xilas etsin bu könlümü ələmdən.

Ömrüm keçdi möhnət içrə kədər dolu hicranda,
Gülüstanın çiçəkləri solub getdi xəzanda.

Mən bilirəm ağlamaqdan faydalanmaz qəlbimiz,
Lakin yanan hər bir şeydən tüstü çıxar, şübhəsiz.

Bilirəm ki, xilas etməz bu nalə, bu ah məni,
Neyləyim ki, mümkün deyil saxlamaq ah-naləni.

Heyrət etmə gözlərimdən seltək qanlı yaş axır,
Bil ki, qəlbim öz qanını gözdən çölə buraxır.

Bir zamanlar dönmüş idim bəxtiyara dünyada,
Həmdəm idim zülfü ipək, nazlı yara dünyada.

İndi belə sərgərdanəm, halım olmuş pərişan,
Ağlım belə qalmış mənim öz işimə mat, heyran.

Dostlar, deyin bu dərdlərə varmı əlac, ya tədbir?
Nalə, fəqan etməkdən heç görünmədi bir təsir.



Tutulmaqdan neçin qorxsun tora düşmüş bir şikar,
Kaş ki, onu tutan ovçu olmayaydı zülmkar!

Bülbül əgər qarğa ilə salınsa bir qəfəsə,
Bülbül cəh-cəh vurmaq üçün heç gələrmi həvəsə?

Təəssüflər bu ömrümüz boşa gedir anbean,
Nə xeyr işə sərf olunur, nə sevgiyə, ah, aman!

Bu zəmanə saldı məni əcəb dərdə, möhnətə,
Ürək qanı çilədi bu çöhrəyə, bu surətə.

Sanki mənə əzəl gündən olmuş idi bu xitab:
İçim bulud, xaricimsə olsun nurlu afitab.

Qan uddurur öz əlilə mənə zalim zəmanə,
Zahirdəsə guya vermiş mənə qızıl peymanə.

Heç bir istək alınmamış bu kəcrəftar fələkdən,
Loğman belə olsan yenə qurtarmazsan kələkdən.

Gözlərimdən qan selləri axır, qəlbim dağlıdır,
Qönçə kimi içim dolu, dodağımsa bağlıdır.

Çox sirlər bilirəm mən, açmağasa yox imkan,
Desəm belə kimdir mənim əsrarımı anlayan?

İbn-əl Fərid kimi fürsət tapa bilsəm mən hərgah,*
Xalqı yeni xəbərlərdən eyləyərdim mən agah.

Çıxmışsa da işlərimin ixtiyarı əlimdən,
Uzaqdırsa məndən əgər indi, əziz yar, vətən.

Yenə də bu sonsuz ələm, qüssə ilə hər zaman,
Xoş günlərə ümidlərdir məni xoşhal yaşadan.

Eşq əgər öz zövqü ilə məni həmrah eyləsə,
Varlılıqdan, kasıblıqdan məni agah eyləsə.

Qəlbim onun qəmi ilə elə gülər, şadlanar,
Şadlığım qəm, qəmim isə dönüb şadlıq adlanar.

Məhəbbətdir bu dünyada gözlərimə nur verən,
Odur mənə həqiqəti açıq, aydın göstərən.

Ey ilahi, Qüdsiyə sən qüdsiyyətdən bir can ver,
Onun ağır dərdlərinə öz əlinlə dərman ver!

Gizli şeyə baxan zaman görsün onu aşikar,
Hər *işində dadına çat, sən özün ol ona yar!*

## FİKRİN İZAHI

Ömür keçdi boş-boşuna, etdik daim ahu-vah,
Keçdi xoşluq zamanları, çatdı bəla günü, ah!

Ey saqi, ver piyaləni, mey qızdırsın bu canı,
Bəlkə şadlıq bir də olsun qəlb evinin mehmanı.

Əl tutmasan, qəmlər məni məhv eyləyər, yaxşı bil,
Ona görə verdiyin su adlanıbdır səlsəbil.

Ey saqi, gəl atəşimə bir su çilə çat dada,
Qızışdırsın atəşimi o su mənim daha da.

Qəlb evinin təmizliyi o şərabdan pay alar,
Su deyilir ona, lakin bir atəşdir aşikar.

Ey saqi, bu ruzigardan mən də bir kam almadım,
Bir badə ver, ənbər içən çağırılsın qoy adım.

Bəlkə o mey nicat verə mənə sonsuz kədərdən,
Ruh çiləsin torpağıma cana gəlim bir də mən.

Ey saqi, bir ayna ver ki, dünyanı seyr eyləyim,
Tut qarşımda, sənə gözəl bir macəra söyləyim.



Tuti ayna görən kimi məlumdur ki, dil açar,
Sən də sudan bir ayna tut, sirlər edim aşikar.

Saqi, mənə abi-həyat peymanəsi əta et,
Əsrlərin günəşilə bu dərdimə dəva et!

Qoy yarımın surətini mən göstərim badədə,
Əhsən desin bu qüdrətə yar da, mən də, badə də.

Bu dünyada hər kəs olur bir vəchlə kamiran,
Xızr-zülmətdan, mənsə günəş çeşməsindən, hər *zaman**.

Ey saqi, mən dərd içində avarəyəm ruzü şəb,
Heyranlığın səhrasında dolanıram təşnələb.

Susuzluğa bir çarə qıl, ürəyimi sirab et,
Sən bu suyun xassəsini anlat mənə, səvab et!

"Cami-mey" ki, söyləyirlər, bu sözdə nə hikmət var?
Acı badə içində də, nə qəribə halət var.

Nəzərlərdə saf, gül rəngi görünür o hər zaman,
İçəriyə çəkən zaman neçün olur qızıl qan?

Deyirlər ki, huşyar edər içənləri bu badə,
Bəs neçin məst, zəlil edir, verir həyatı badə?

Gözə bir cür görünən bu mayedə min sifət var,
Onda şoran duzu, həm də Fəratdan da şərbət var.

Sənə qurban olum saqi, sakit qalma, yenə dur,
Sən hərəkət edən zaman məclisimiz şən olur.

Dolu şərab badəsi ver, unudum hər dərdi mən,
Bəlkə bir az can qurtarım mən ağlımın əlindən.

Ürək şənlik məclisinin çiçəklənən bağıdır,
Ağıl isə quldur kimi vurub onu dağıdır.

Dünyaları əks eyləyən saf aynadır bu ürək,
Ağıl tozu örtər onu çirkli qara pərdə tək.

Lütf et, saqi, məqsədimə çatım bəlkə birtəhər,
Bihuş olub qələm çəkim huşyarlığa bir qədər.

Ürək azad olan zaman işgəncədən, əzabdan,
Bəlkə ona gizli sirlər olacaqdır nümayan.

Biləcəkdir bu badənin xoş səfası nə imiş,
Hər bir işin ibtidası, intihası nə imiş!

Əgər mənə kömək olsan ümidim var nəhayət,
Sənin gözəl niyyətinlə kəşf edilər həqiqət.

## NƏFSİN QORUNMASI

Qüdsi meydən qüdsi nəşə istəmişdir hər zaman,
Hər kəs olar məclislərdə bu nəşəylə kamiran.

Bir mey istər, qüvvət verə o mey dinə, ağıla,
O mey yox ki, onunla din, ağıl, hünər dağıla.

O şərabı istəməz ki, şər ab olmuş ləqəbi,
Zatında bir fitnə vardır, qarışdırar əsəbi*.

Elə şərab istəməz ki, etsin cana bəd əsər,
Nəşəsindən qəm yaransın, xumarından dərdi-sər.

Deyirlər ki, yüz xətaya olar daim mey bais,
Ona görə ad vermişlər ona "ümmül-xəbais".

Ağılsız baş şərab ilə qızışarsa bir daha,
Bada gedər bir gün içrə hörmət, ədəb və həya.

Bu uğursuz nəfsin hökmü qarışarsa hər işə,
Ağlasığmaz pislik olar insanlara bu peşə.



Nəfsin olsa can mülkündə sayğısız bir hökümdar,
Əvvəlcə o öz həyanı ortalıqdan qaldırar.

Bu sözlərdən yol açılar belə dərin mənaya:
Ki, din əldən gedər əgər tanımasa üz həya.

Həya yoxsa, həvəs içrə baş qaldırar rəzalət,
Zalım nəfsin istəyi də verər min bir fəlakət.

Mən bu fikri nəql etmirəm başqasının sözündən,
Öz başıma gələn işdir, qoy nəql edim özümdən:

## MƏTLƏBİN TƏDRİCLƏ AÇILMASI

Çox zamandı ürəyimdə dolanırdı bu sual,
Görəsən ki, içən zaman necə dəyişir əhval?

Mey nəşəsi barəsində hər kəs bir cür vurur laf,
Saf şərabın xassəsində vardır böyük ixtilaf.

Biri onda gəzir şadlıq, fərəh, hər cür xoş halət,
Bir başqası deyir: "Şərab törədir min fəlakət".

Biri sübut etmək üçün gətirir bir çox dəlil.
Deyir: "Heç nə mənfəətdə bu şəraba tay deyil".

Başqası da başqa dəlil göstərir çox mötəbər,
Ki, mey şeytan sidiyidir, haqdan gəlmiş bu xəbər.

Hər kəs bir cür fikir edib durur fikri üstündə,
Min ixtilaf törədirlər meyin zikri üstündə.

Bunu görüb gəldim belə qərara ki, mən əgər,
İstəyirsəm biləm meyin xeyir-şərin, bir qədər.

Gərək içim, baxım mən də, nə cür olur al şərab,
İçməmiş kim edə bilər tərifini intixab?!

Mən bu fikrə düşən zaman gülümsədi xoş bahar,
Güllər açdı, çəmənlərdə oldu hər yer laləzar.

Səba yeli vurdu artıq gülüstana min bəzək,
Çəmənzarın simasına ənlik vurdu hər çiçək.

Nəsiməmi ətir vermiş gül cöhrəli bu gülşən,
Ya ki, nəsim öz ətrilə eyləmişdir gülü şən?!

Hər tərəfdə kef əhlindən etmək üçün bir xahiş,
Yarpağını kağız edib göndərdi gül sifariş.

Bu gülşəndə bir saqidir al geyinmiş bir lalə,
Almış ələ o gül rəngli jalə dolu piyalə.

Səhər çağı nəğmə deyir quşlar böyük həvəslə,
Səba yeli ürək açır xoş ətirli nəfəslə.

Nəhayətsiz fərəh, şadlıq çəmənzara sığışmaz,
Sanki fələk asimanda şurə gəlib çalır saz.

Çəmən, səhra başdan-başa nə xoş gəlir nəzərə,
Ruhu oxşar, könül açar hər görünən mənzərə.

Yoldaş olub neçə nəfər çəkilərək guşəyə,
Eyşü-işrət süfrəsində dalmış olar nəşəyə.

Mən də neçə hal əhlilə, ariflərlə bərabər,
Çəmənin xoş bir yerində məclis qurduq müxtəsər.

Gül yanaqlı saqi tutub əldə gülgün peymanə,
Meyində var öz üzündən, ya da güldən nişanə.

Xoş avazlı xanəndəylə əlindəki bərbət, çəng,
Könülləri oxşamağa olmuş necə həmahəng.

Badə gərək nəşə versin, olsun dadlı xoşgüvar,
Xüsusilə bahar fəsli, yanında da bir nigar.



Ağıllılar bu zamanlar verməz əldən fürsəti,
Mey nə qədər saf olarsa, artar onun ləzzəti.

Qarşımızda elə şərab vardı bizim ərğəvan,
Rəngi, ətri utandırır gülləri də hər zaman.

Şöhrətində o mey sanki ruh açan bir reyhandı,
Əsli Firəng yurdundandı, ləqəbi də Şampandı.

Bütün gözəl şərablardan şöhrətlidir, adlıdır,
Hansı şərab onun kimi ləzzətlidir, dadlıdır?!

Həyat verən yar ləbi tək o mey şirin, təmizdi,
Sözü kimi acıdısa, mənfəəti hədsizdi.

Dəniz suyu acısa da xeyir verər o bizə,
Ona görə şərabı da bənzədirlər dənizə.

Bəllidir ki, şərab silir ürəklərdən ələmi,
Unutdurur qəm-kədəri, unutdurur aləmi.

Bunlar aydın rəvayətdir, danışmağa yox həvəs,
Nələr gəldi başımıza sərxoşluqdan bizim bəs!?

Şərab içib getdikcə çox, sərxoşluğa düşdüm mən,
Ürəyimin ətəyi də çıxdı tədbir əlindən.

Hərisliyim çoxaldıqca açdı şərab üzümü,
O sildikcə qəm tozunu, çaşdırdım hər sözümü.

Sevinərək mən özümü hesab etdim o zaman,
Tacım-təxtim olmasa da həşəmətli hökmüran.

Yenə içdim, hey içdikcə içməyi çox xoşladım,
Dilsiz idim, birdən-birə natiqliyə başladım.

Elə bildim söz mülkünün mənəm qadir sultanı,
Söz düzməkdə təkcə mənəm öz əsrimin Söhbanı*.

Qafil idim söylədiyim sözlərdən yavaş-yavaş
Qəlbimdəki şirlərimi eyləmişəm tamam faş.

Xəyalımdan tamam çıxdı sayıqlıq və ehtiyat,
Mey apardı iradəmi, düşmən açdı qol-qanad.

Bu məsəli yaxşı demiş dünya görmüş atalar,
Öz başını qorumağa sərxoş nədən güc alar?

Mən yenə də başa çəkdim bundan sonra neçə cam,
Sərxoşluğum rəqs etməyə verdi bu dəm sərəncam.

Bu qaydadır sərxoşların rəqsə meyli çox olur,
Çünki şərab təsirilə vüqar, təmkin, yox olur.

Mən, elə ki, rəqs elədim lap pozuldu əhvalım,
Nəyim vardı getdi əldən, itdi ağlım, kamalım.

Sonra yenə başa çəkdim neçə dolu badə mən,
Keflilikdən çərənlədim, tamam getdim badə mən.

Hər yetənlə dalaşaraq söyüb təhqir eylədim,
Yaraşmayan işlər gördüm, cəfəngiyat söylədim.

Hərçənd ki, sözlərimdən bir az oldum xəbərdar,
Lakin əldə deyil idi heç iradə, ixtiyar.

İllər boyu sınadığım sadiq o can dostları,
Candan əziz o səmimi və mehriban dostları.

Qaba sözlə mən incitdim, təhqir etdim bir anda,
Yaman sözdən yaman bir şey yoxdur, bilin cahanda,

Hər dillərin sirlərini kəşf eyləyən babalar,
Demişlər: "Dil yarasına heç bir dərman etməz kar".

Sədi yaxşı demiş: "Susmaq yaxşıdır pis söhbətdən,
Pis söz salar söyləyəni xalq içində hörmətdən..."*



Xeyir işlər təlqin edən o Məhəmməd peyğəmbər,
Demişdir ki, haqqın üzü xoş kəlamda görünər.

Firon belə küfrə düşüb Allah dedi özünə,
Lakin cavab tapmadı o, Musanın haqq sözünə*.

Atalardan qalma məsəl xatırladım sənə gəl,
Dilə girov baş özüdür, açar başa dil əngəl.

Xalq nə bilsin axı sənin ürəyindən keçəni,
Söylədiyin sözlər ilə tanıyacaq o səni.

Gah şadlandım, gah qəmləndim bu yaramaz dil ilə,
Yarəb belə yaman dilim kaş dibindən kəsilə!

Hər nə isə ağlım itib eyləmişəm gör nələr
Yaraşmayan işlər tutub törətmişəm fitnələr.

Heç özüm də bilməyirdim nədir bunun səbəbi,
Gah ağlayır, gah gülürdüm, xeyli küsgün, əsəbi

Mən qusmağa başladıqda halım tamam pozuldu,
Huşsuz düşdüm cəsəd kimi, dilim isə lal oldu.

Başağrısı sərsəmliyim eyləmişdi məni xar,
Bu zavallı halı yalnız düşən bilər, anlayar.

Ayrılıqda ətrafımda görmədim bir dostumu,
Ar da getdi, pul da getdi, şərabdakı kef bumu?

Etibardan dəm vurmağa haq verirmi bu halət?
Allahdan da, bəndədən də mən çəkirəm xəcalət.

## ƏSİL MƏQSƏDİN BƏYANI

Ey könül, sən ibrət götür öz başına gələndən,
Başqası da ibrət alsın bu yol ilə qoy səndən.

Mey məstliyi uzun sürməz, davamı da azdır, az,
Ayılantək təsir qalmaz bir nəşəsi duyulmaz.

Günahını bağışlatmaq diləyirsən, dilə gəl!
Haqq yoluna dönənlərə bağışlanır pis əməl.

Çoxlarını məst eləyir var-dövləti dünyanın,
Gözlərini kor eyləyir bu var-dövlət insanın.

Bu dünyanı sevən demək faniliyə aldanmış,
"Fəəğşeyna" ayəsilə gedib olsun qoy tanış*.

Öz ömrünü sərxoşluqda keçirərsə hər cahil,
Başağrısı bir an belə rahat qoymaz, onu bil!

Xumarlanmış gözlərini açan zaman yuxudan,
Görəcəkdir günəş çıxmış, işıqlanmış bu cahan.

Hər əmələ ədalətlə cəza verər haqq özü,
O əyriyə əyri deyər, düzə çıxarar düzü.

* *
*

Aləm nədir sinəsində çaxnaşmalar, qovqalar,
Sərmayəsi: şöhrət, qürur bundan başqa nəyi var?!

Bu dünyanın arzuları: sonsuz ələm, məşəqqət,
Köpük kimi suda üzür, itib gedir nəhayət.

Var-yox bütün əfsanədir, mənasız bir xəyaldır,
Bu xəyaldan özgə nə var, dərk eyləmək mahaldır...



Çox məşhurdur Səba şəhri gözəlinin dastanı,
Ki, dalğaya bənzətmişdi şüşədəki damlanı*.

Həqiqətdən sən uzağa çox düşmüsən, əzizim,
Yoxluğa bir varlıq deyə səhv etmişsən, əzizim!

Bu dünyanı duymaq olmaz xəyallara dalaraq,
Aləm nədir? Nədir onda belə ləzzət, bu maraq?

Arzu kamdan çox uzaqdır, birləşməzlər heç zaman,
Muzdurluqdur bu yaşamaq, dünya böyük bir zindan.

Məşəqqətlə ömür sürüb, rahatlanmaq dilərik,
Əlimizdə olan dövlət: ehtiyacla köləlik.

Təəccüblə baxıram mən mal toplayan hərisə.
Yığdığını alacaqdır ya tufan, ya vərəsə.

Beləliklə, qəribədir hər bəşərdə bu xislət,
Hərisliyi tuğyan edər, şərə düşər nəhayət.

Sübut üçün Qurandakı bir ayəni oxu, bil,
"İnnəl-insan" ayəsinin hikmətləri boş deyil!

İşrət nədir? Etibarı olmayan bir həvəsdir,
Zəmanənin əhli kimi vəfasızdır, əbəsdir.

Gecə deyək xoş keçindik, bir az keyə baxaraq,
Gündüzlərin əzabından bəs necə can qurtaraq?!

Bir loğmanı axşam yedin, kef kökəldi, bu bəlli,
Axı gündüz aclığına bu olarmı təsəlli?!

Keçənlərdən boş xatirə qalacaqdır dünyada,
Röyalarda gördüklərin bir xəyaldır bil o da.

Hökmranlıq nədir? Nəfsə məhkumluqdur mənası,
Azadlıqdan həmişəlik məhrumluqdur mənası.

Mənsəbindən səmər nədir: sonsuz cədəl, qalmaqal
Başın qovğa içindədir, öz işinə yox macal.

Artar hər an təşvişlərin, ürəyində təlaşın,
İşlərinə baxmaq üçün fürsət tapmaz öz başın.

Hər tərəfdən hücum edər düşmənlər və paxıllar,
Bir az keçməz xasiyyətin dönüb itdən pis olar.

Yavaş-yavaş tinətində görünər bir qəddarlıq,
Sarsılaraq viranəyə dönər səndə bu varlıq.

Zülm edərsən, günahını heç boynuna almazsan,
Qan tökmək də gözlərinə görünəcək çox asan.

Zənn edərsən ki, filankəs sənə quyu qazır ha,
Özün quyu qazıb onu tez salarsan quyuya.

Nə özündən xəbərin var, nə işindən, karından,
Qəflət səni ayrı salar ən vəfalı yarından.

Keçmişlərdə sənə bənzər bir məst kişi yaşardı,
Ki, məstliyin çoxluğundan məstliyini danardı.

## HEKAYƏT

Bir kişinin dərd əlindən əhvalı çox çaşbaşdı,
Bazarda o gəzə-gəzə bir əttara yanaşdı.

Dedi: Mənə bir həb ver ki, nəşə versin adama,
Pul verərək uddu həbi, gedib girdi hamama.

Xəlvət yerə girib palçıq sürtən zaman özünə,
Həbin güclü təsirilə baxdı bir an üzünə.

Dedi: Axı, dəyişmədi əhvalımı mənim həb?
Harda qaldı bəs şadlığım, yoxdur nəşəm, nə əcəb?!



Verdiyim pul getdi bada, hasilim bəs nə oldu,
Könlüm kədər, qəm əlindən daha betər pozuldu.

Belə halla çıxıb getdi o həmamdan bazara,
Utanmadan min qəzəblə yaxınlaşdı əttara.

Dedi: Alçaq! Bəs həbinin hanı mənə təsiri?
Heç bir nəşə verməyibdir, özündədir təqsiri.

Düz bir saat söydü, onu, üstünə də atdı şər,
Nəşə ondan gedən kimi tutdu özündən xəbər,

Eylədiyi qəbahətdən çəkdi sonsuz xəcalət,
Ah çəkdirdi, onu yaman peşman etdi bu halət.

Dedi: Aman, gör nə bəla gətirdim öz başıma,
Hansı üzlə nəzər salım indi öz tay-tuşuma?

* *
*

Dostum əgər təkəbbürdən sən keyfi saz olmusan,
Bu dünyanın eşqi ilə bir ədabaz olmusan.

Olma pisi yaxşıların cərgəsinə qoyan sən,
Sərxoş ikən gəl özünü ayıq sanma, oyan sən!

## LƏTİFƏ

Bir alimdən keçənlərdə sual etdi bir nadan:
– Heç divana bilərmi ki, məhrumdur o ağıldan?

Bilərmi ki, o dəlidir, şüura da biganə?
Cavab verdi: Bilsə bunu, demək deyil divanə.

## CAN YAXAN EŞQİN İŞIĞINDAN BİR ŞÜA

Salam, sizə ey sevdanı bilən əhli-mərifət,
Səlamətlik guşəsinə çəksin sizi məhəbbət.

Məhəbbətsiz bu dünyada nəşə yoxdur, bu şəksiz,
Eşqi isə duymaq olmaz, saf duyğulu ürəksiz.

Ürəklərin rahatlığı eşq ilədir hər zaman,
Hər kəs olmuş öz eşqilə bu dünyada kamran.

Bu dünyada yoxdur ancaq məhəbbətin ədəmi,
Başdan-başa o qəm, kədər olsa belə, nə qəmi?!

Onun qəmi elə qəm ki, çox üstündür şadlıqdan,
Onun bəndi içindəsə azad olar hər insan.

Dərd içində əgər nalan qoysa belə o canı,
Unudarsan həmişəlik sən hər iki dünyanı.

Qəlbim sonsuz həyatı bu dərdə qurban edərdi,
Ürək çəksin qoy dərmandan yaxşı olan bu dərdi.

Bu xərabə yerə düşüb can çəkişən hər insan,
Öz kədərli ürəyini istər edə şadman.

Lakin yoxdur bir nəfər də bu dünyada bəxtiyar,
Şadlıq, şöhrət, xoşbəxtliyin ancaq quru adı var.

Hərənin bir dərdi vardır, deyin kimdə qəm yoxdur?
Bir fərq ilə: birində çox, o birində lap çoxdur.

Başdan-başa bu dünyanın işləri qəm, kədərdir.
Lakin insan bu işlərdən qafildir, bixəbərdir.

Bu dünyada bir iş yoxdur, olsun tamam zərərsiz,
Bir şirin bal tapılmaz ki, olsun tamam zəhərsiz,



Hər bir işin mənasını axtarırlar səbəbdə,
Əziyyətsiz tapılmaz bu aləmdə bir səbəb də,

Cəhd eyləyir, hər kəs tapsın bir az şadlıq dəmini,
Şadlıq tapmaz, o daha da artırar öz qəmini.

Bu dünyada qəm, möhnətdən başqa yoxdur səadət,
Eşq olsun o aşiqə ki, ona gülür məhəbbət.

Bu qəmlərdən, kədərlərdən, işgəncədən, əzabdan,
Ancaq bir şey xilas edər ürəkləri hər zaman.

Olmasın qoy can evində yar qəmindən başqa qəm,
Dərd bir olsa tez tapar o öz dərdinə bir məlhəm.

Sənin dərdin o vaxt çatar istədiyin dərmana,
Ki, qovuşsun könül yara, can vəfalı canana.

Bu mətləbi yaxşı dərk et: Məhəbbətdir azadlıq,
Onun qəmi, kədəri də olar xoşluq və şadlıq.

Həqiqətdən bəhs edərkən yada düşdü bir məcaz,
Bir cavandan deyim sizə ki, olmuşdu eşqi baz.

## HEKAYƏT

Misirdə bir gözəl vardı yanaqları al-əlvan,
Ölkədə o əzizlərdən sayılardı hər zaman.

Camalı nur çiləyirdi çıraq kimi hər yana,
Onun xalı atəşinə yanmışdı çox pərvana.

Yanağının kitabında yazılmış sətr arası,
Şərh olunur ona baxan zamanda "nur" ayəsi.

Dodağıyla can bəxş edər gözlərilə ovlardı,
Surətində yaradanın sənəti canlanardı.

Kakilində görünərdi ümid, qorxu əsəri,
Ayı iki parçalardı qaşlarının xəncəri.

Qara zülfü kəmənd kimi halqa-halqa buranda,
Vurğun qəlbi tora salıb ovlayardı bir anda.

Gülşənində yanaq kimi bəsləyirdi bircə gül,
Ona nəğmə oxuyardı yüz şur ilə min bülbül,

Ona aşiq olanlardan birisi də əttardı,
Hər xəstəyə dərman verib özü xəstə yatardı.

Öz yanında xoş ətirli dərmanları var ikən,
Yar zülfünün qoxusunu axtarardı sübh erkən.

Bu dərd ilə zaman ötdü, aylardan il düzəldi,
Günlər keçdi, bahar ötdü, xəzan keçdi, qış gəldi.

Bir görüşə möhtac idi o binəva, müxtəsər –
Bu görüş də o yazığa olmayırdı müyəssər.

Bir gün o ay aşiqlərin naləsindən incəldi,
Aşiq qanı tökdüyündən canına bir dərd gəldi.

Ya da nəzər oxu ilə vurduğuyçun yaralar,
Bir bədnəzər zərbəsi də ona axır etdi kar.

Təbib onun mərəzini yoxlayarkən nəhayət,
Dərman üçün yazdı ona meyvələrdən bir şərbət.

Təsadüfən bu şərbəti hazırlamaq zamanı,
O əttarı gətirdilər düzəltsin bu dərmanı.

Əttar yarı görən kimi zəfərantək saraldı,
Çırpınaraq qəlbi birdən onu sonsuz dərd aldı.

Ciyərinin qanı ilə cuşa gəldi həvəsi
Gözlərini qapayırdı yarın odlu nəfəsi.



Sinəsində tufan vardı sanki coşğun dənizdi,
Dodaqları bağlı idi, heyrətindən səssizdi.

Huş gedərsə, dodaq səssiz, hərəkətsiz dayanar,
Gül önündə bülbül qəlbi çırpınaraq odlanar.

Bəli, əsil aşiq odur öz yarını görəndə,
Varlığını unudaraq dili düşsün kəməndə,

Gözlərini açsın ancaq yar üzünə hər zaman,
Ancaq yarın söhbətini eşitsin o anbaan.

Camalının xəyalilə o qəlbini xoş tutsun,
Canı oda düşsə belə varlığını unutsun.

Varlığından olub düşsə çaşqınlığa, heyrətə
Od içində sızlamağı sığışdırmaz qeyrətə.

Nə isə, o hazırladı meyvələrdən bir şərbət,
Atəş üstə qoyan zaman artdı onda hərarət.

Eşqin əcib təsirindən olmuşdu çox pərişan,
Sərxoş idi məhəbbətin şərbətindən bu zaman.

Bulayaraq qarışdırdı barmağıyla şərbəti,
Bu şərbətdə yandı əli hiss etmədi o qəti.

Dilbər onun halın görüb qandı o da aşiqdir,
Öz eşqində fədakardır, məhəbbətə sadiqdir.

Min könüldən aşiq oldu ona məşuq olan yar,
İstədi ki, daim olsun ona yaxın həvadar.

Aşiq əgər öz eşqində göstərərsə sədaqət,
Məşuq ona aşiq olar, budur əsil həqiqət.

Eşqin çətin imtəhanı titrətsə də əsəbi,
Bil məcazi məhəbbətin budur axır tələbi.

Sədaqətli aşiqlərin budur halı, bil bunu,
Burda Leyli daha artıq tələb edir Məcnunu.

Yarla aşiq, vəsl ilə hicr, gəldi müvafiq ədəd,
Sal yadına ki, nə dedi: "Qül hüvəllahü əhəd".

Müddəanı sübut üçün eldə gözəl misal var,
Artıq sözlər küfrə dönər, burda sözü gəl qurtar!

Sən özünü tanımadan, necə mümkün bu əməl,
Bu hikmətin əsrarını anlayasan mükəmməl?!

Öz halını o uşaqla tutuşdurub sal yada,
O, günəşi görməmişdən inanmazdı dünyada.

## HEKAYƏT

Qaranlıq bir ev içində doğulmuşdu bir uşaq,
Evlərində bir ustaddan elm öyrəndi o ancaq,

Tanımadı şamdan başqa işıq verən atəşi,
Bir an belə görmədi o gözlərilə günəşi.

Müəllimi hər nə qədər söylədisə aşikar,
Ki, dünyada hər bir şeydən işıqlı bir günəş var.

Uşaq ona inanmayıb hey deyirdi ustada,
Ki, bu *şamdan işıqlı şey ola bilməz dünyada.*

Bir gün səhər çölə çıxdı, uşaq heyran dayandı,
O günəşi görən zaman bu sözlərə inandı.

Bədənin bir evə bənzər, canın ona bir əşdir,
Ağlın nurlu şama bənzər, eşq isə bir günəşdir.

Sən bilmirsən əbədiyyət mehri nədir, ey nadan,
Ağılçatmaz hər bir şeyi mahal sanma hər zaman.

Bu sözlərin yeri deyil, yersiz sözdən çəkin, qaç,
Məhəbbətdən bir söz söylə, aşiqlikdən söhbət aç!



## DÜZLƏR MƏSLƏKİNİ İZLƏYƏNLƏR DASTANININ DAVAMI

Bu aşiqlik, bu məşuqluq əvvəlinci mənzilidir,
Eşq əhlinin kami-dili bu mənzildən hasildir.

Birdən artıq çoxluğa üz qoyan dəmdə bu vəhdət,
Görüşündə, xasiyyətdə yarandı bir ziddiyyət.

Vəhdət durur öz başına, heç asılı olmadan,
Görünüşdə, xasiyyətdə həm əyandır, həm nihan.

Kainatın öz sirri var baxma ona havayı,
Hər şey doğub məhv olmada bircə ondan savayı.

Çoxluq təzad yaradırsa əsrarəngiz vəhdətə,
Aşiq-məşuq ad verildi bu əzəli hikmətə.

Hər bir işdə nazu niyaz tələb edir bu dövran,
Bu cür ancaq işlərdəki nöqsan qalxar aradan.

İstəyirsən gizli sirlər sənə olsun aşikar,
Qurandakı "Allahü nur" ayəsini et təkrar.

## MUŞTULUQ XƏBƏRİ

Bu rəmz ilə xitab etdi Xəlilullah insana,
Ona şahid ayla, günəş, odur Allah insana*.

Yemək, sevgi arzusuyla yaşamaqda bu bəşər,
Ulduz kimi bu arzular başı üstə cilvəgər.

Şərafətə minər insan artarsa onda şüur,
İnsan idrak sayəsində günəş kimi saçar nur.

Bir baş daha yüksələrsə dönüb olar bir mələk,
Günəş kimi ondan işıq alar sonsuz bu fələk.

Məhəbbətlə günəş dildə bir adlanır mehr, mehr*,
Əbədidir günəş kimi məhəbbət də, deyil sehr.

Məhəbbətdə dərk eyləyər insan özü-özünü,
Sevgi, sevda, məhəbbətlə başlayar hər sözünü.

Qurana bax, genişsə də mənaları, məzmunu,
"Bey"lə "sin"lə başlanaraq bitir, yaxşı bil bunu!*

Məqsəd belə aydın ikən bu təkrarə nə hacət?
Düz demişlər, ariflərə bir işarə kifayət.

## EŞQDƏ TƏMİZLİK HAQQINDA

Məhəbbətdə sanma küfrə, nə də dinə uyan var,
Rindlik, məstlik olan yerdə ayinlərə kim uyar?

Fisqilə zöhd insanlara qurulmuş bir duzaqdır,
Huşyar olan şübhəsiz ki, bu kələkdən uzaqdır.

Səfsətədir hər müddəa, fikirləri müəmma,
Məsələlər məlum olmur, hər şeydə var bir əmma.

Aşiqlərdə təqlidə heç olmaz zərrə etimad,
Ancaq vardır hər bir işdə öz gücünə etiqad.

Boş laqqırtı nəyə lazım, xoş gəlsə də hər avaz,
Göz gördüyün qəbul edər, quru sözə inanmaz.

Eşq hədisi başqa şeydir, diqqətlə bax ona sən,
İbrət alaq indi biz də bu hikmətli hədisdən.

Sözə yeni məna, yeni şəkil versin fikrimiz.
"İstincanı", "İstibranı" başqa cür şərh edək biz.*



Bunlar nədir ki, bunlarsız taət haram sayılır,
Onlar olsa insan qəflət yuxusundan ayılır.

Burada gəl bu sözlərin izahını eşit bir,
Fazillərin müəllimi Şeyx Bəhai demişdir:

Yaramazlar! Bu əməldən, hərəkətdən utanın,
Ki, istinca daşlarını gizlərsiniz şeytanın.

İstincadan qərəz budur-ürək təmiz olmalı,
Alçaq tiynət məhv edilib paklıq əziz olmalı.

İstibrasa o deməkdir, gizli saxla hər sözü,
Sirr deyilən xəzinəyə sahib olsun qəlb özü.

Şərab içsən, şərabla da apararsan xumarı,
Su olmasa bəs təmizlik nə cür olar, bil barı!

Əbədiyyət badəsilə sərxoş olan bir adam,
"Vəlləzinə-amənu"dən alar qüvvət və ilham.

Bu söz ilə təmizlənsə hər ürəyin qubarı,
Camalında şəfəq salar könüllərin ilqarı.

Bu bədxahlıq, yaramazlıq, xəbisliklə, ey cahil,
İbadətin mənasızdır, qəbul olmaz duan, bil!

Bu hərəkət çox bənzəyər dərgahında üsyana,
Zahirdə həqq, batindəsə bağlanmısan şeytana.

Bu riyakar itaətdən susmaq daha yaxşıdır,
Asi olmaq müşriklikdən hər mənada yaxşıdır.

Pis sifətdən çəkin, həqqə istinad et ey insan!
Bir an belə üz döndərmə "gəl-gəl" deyən Allahdan.

Alnı açıq hər işini eşqə bağla həmişə,
Qoy eşq olsun dil əzbərin, sənə yüksək bir peşə.

Məhəbbətdən başqa yoxdur sənə düz yol göstərən,
Odur xeyir işə çəkən, sənə cürət, güc verən.

Ey qəfəsdə çırpınan quş, tənbəllikdən iş aşmaz,
Sən qartalsan, milçək işi qüdrətinə yaraşmaz.

Öz nəfsinin məhbəsindən qurtar, azad qanad çal,
"Leysə lil-insanə illa ma səa"dən ibrət al!*

Əqlin varsa puç eyləmə ömrünü, qıl ehtiyat,
Qoyma boş-boş kefcilliyə hədər olsun bu həyat.

Bir düşünsən əbədiyyət dövlətinə sahibsən,
Müvəqqəti ləzzət üçün vermə onu əlindən!

Asiliklə əziz ömrü göydən yerə salmasan,
Qocalmısan, uşaq kimi çirk içində qalmısan.

Ürəyini azadlıqdan özün saldın zindana,
Yaradılış mənasından xəbərsizsən, qansana!

Həq yaratdı özü kimi səni, verdi min ziynət,
Bu qamətlə dedi bizə etməlisən itaət.

Onda olan əlaməti, o cəlalı istəsən,
Sidq ürəklə, doğru dillə zülcəlalı istə sən!

Xəlvətdən bir mənzil verdi sənə möhkəm, mükəmməl,
Sonra dedi öz əqlinlə bizə tərəf qayıt, gəl!

Lakin indi bunları sən unutmusan, ey insan,
Heyif olsun sənə heyif, yazıq sənə, bir utan!

Bəzən guya meyl edirsən ibadətə, xaliqə,
Pərdə olur öz varlığın itaətə, xaliqə.

Cəhənnəmin qorxusu, ya behşit üçün ibadət,
Etməz haqqın dərgahında sadiqliyə dəlalət.



Çünki bu nəfs istəyidir, xudpərəstlik deməkdir,
İtaətin əvəzinə qurulmuş bir kələkdir.

Bəhaidən yenə düşdü yadıma bir rəvayət,
Bu yerdə çox münasibdir, qoy eyləyim hekayət.*

O demişdir: İtaətdən əvəz almaq istəsən,
Bu korluqdur, muzdurluqdur, əl çək belə adətdən.

Aşiqlərə məqsəd ancaq yar vəslidir hər zaman,
Cənnət şövqi, ya cəhənnəm xovfi bilməz o bir an.

Kimdə olsa yar sövdası de nə qəmi var onun?
Öz behişti, öz dəhşətli cəhənnəmi var onun.

Kafirlərin küfrü, həm də dini hər bir dindarın
Ürəyində bir zərrəcik dərdə bənzər əttarın.

Hər şəxsin ki, olsa bu cür yüksək ali hümməti,
"Əssabiqun" ayəsindən alar gücü, qüdrəti.

Candan keçib çatar o dəm cananının vəslinə,
Əzəliyyət aləmilə qovuşar, bil, o yenə.

## MƏHƏBBƏT VƏ VƏFA ŞƏRTLƏRİNİN ŞƏRHİ

Ey müxatəb, eşqə meyl et, dərdlərinə ver dərman,
Allah eşqin bəlasilə edir bizi imtəhan.

Eşq aləmdir, işgəncədir, nəhayətsiz macəra,
Aşiq gərək əzablara dözməyi də bacara.

Alşərab ki, bu ləzzəti bizə bir az tanıdır,
Aşiqlərin göz yaşıdır, ya da ürək qanıdır.

Yaranmışdır qan dənizi içində bir inci tək,
Ya kənarı tikən dolu incə, lətif bir çiçək.

Qızılgülü dərə bilməz tikanından çəkinən,
İncini kim əldə edər dənizlərə girmədən?

Canan qəmi can mülkünü dağıdan bir afətdir,
Lakin əsil mənada o sənə candır, nemətdir.

Bu səhrada can nə imiş, onun qədri nə imiş,
Candan keçmək olmalıdır hər aşiqə əvvəl iş.

Ölməkdən çox nəfs öldürmək çətindir bu dünyada,
Bənzəyirlər biri böyük, biri kiçik cihada.

Bu hikmətə sübut üçün lazım gəlsə hekayət,
Qoy söyləyim "Məsnəvi"dən bir münasib rəvayət*.

"Ölüm" adı gələn kimi hər kəs gələr vəhşətə,
Bu qovm isə rişxənd edər belə yersiz dəhşətə.

Dərdə düşüb çəkən zaman intəhasız iztirab,
"Ölüm" sənə meydan oxur, olar sonda kamiyab.

Bu dünyaya bağlılıqsa əgər səndə ixtisas,
Sanma qəmdən olacaqsan ölüm ilə sən xilas.

Torpaq səni udanadək özün dönüb torpaq ol,
Ya torpaqdan təmizlənib, çirkinlikdən uzaq ol!

Sözsüz, səssiz bu mənanın əsrarını gəl öyrən,
Sən ölməkdən əvvəl yaşa, bir an qorxma ölümdən.

Hər kim belə sifətlərə malik olsa dünyada,
"Ölüm", "həyat" qəmlərindən azad olar daima.



## TƏMSİL

Hər kəsin ki, mədəsində doldu min cür zır-zibil,
Ya qəlbini əsir etdi min cür kədər, qüssə, bil!

Gözü açıq olsa belə batar dərin yuxuya,
Aram olmaz, qan-yaş tökər, düşər sanki quyuya.

Gözlərinə zülmət çökər, minbir xəyal görünər,
Yuxuları xoflu olar, min dəhşətə bürünər.

Əgər dərdsiz, qəm-qüssəsiz uyuyarsa bir insan,
Ayıqlıqdan daha da şən yuxu görər hər zaman.

İndi sən də qiyas elə seç özünə doğru yol,
Nəfsin, həm də bu aləmin məhbəsindən xilas ol!

Bu əzabdan öz "ölümün" etsin səni qoy azad,
Gəlişilə qoy eyləsin bircə dəfə səni şad.

Qoy aparsın səni ruhlar aləminə durmadan,
Oradaca bilərsən ki, bu dünyadır bir zindan.

İstəyirsən biləsən ki, düzgünmüdür bu xəbər,
"Son əvvəldən xeyirlidir" ayəsinə sal nəzər.

## MƏSLƏK YOLÇULARINA ŞADLIQ XƏBƏRİ

Sakit durma, ey sərgəştə könül işə başla sən,
Dünya və din matəmini saxla belə vaxt ikən.

Sərxoş ikən huşyarlıqdan dəm vurursan nə üçün,
Bütpərəstkən dindarlıqdan dəm vurursan, nə üçün?

Pay umursan qapısından məhrəm bilib hər kəsi,
Quzğunlardan istəyirsən sən bir hüma kölgəsi.

Zənn edirsən ki, filankəs səni dilşad edəcək,
Ya da qəmdən, işgəncədən səni azad edəcək.

Bilmirsən ki, onun dərdi səndən də laəlacdır,
Bu dəbdəbə, şöhrətilə o, səndən də möhtacdır.

Öz başının hayındadır, gücsüz qalmış cahanda,
Başqasına nə cür kömək göstərəcək bu anda.

Get Qurandan oxu yenə sidqi-dillə bir ayə,
Bəlkə "malik" ayəsindən düşə sənə bir sayə.

Odur hakim nə istəsə edər, hökmü rəvandır,
Padşahı gəda etmək onun üçün asandır.

## TƏMSİL

Sən olsan da aciz, küskün, zəif, gücsüz, xaksar,
Vücudunda lakin vardır: iradə hər ixtiyar.

Xaliq sənə bəxş etmişsə görən göz və əl-ayaq,
Bu nemətdən istifadə etməlisən bir sayaq.

Acizliyə biganədir, o qüdrətli, qadir şah,
De ki, xalqa sən özünsən arxa, pənah, ümidgah.

Öz mülkündən o hər kimə yer verərsə hörmətlə,
Onun başı səmalara yüksələcək şöhrətlə.

Sonsuz qüdrət sahibidir, əlçatmazdır bu cəlal,
Lütfü hədsiz, mərhəməti sonsuz, hökmü bizəval.

Kam istəyən bəndəsinə deyər: İstə, verim mən,
Bütün dünya pay almada onun nemət bəhrindən.

Hər kəs doğru bir ürəklə dua etsə basəvab,
Hüzurunda şübhəsiz ki, dərhal olar müstəcab.

Bu sözləri yazan zaman xəyal çatdı dadıma,
İt haqqında bir əhvalat gəlib düşdü yadıma.



## HEKAYƏT

Ev sahibi öz itini dam üstündə bağlardı,
Onu daim bağlı qapı arxasında saxlardı.

Bir həftə ac, susuz qaldı orda yazıq it naçar,
Gündüz fəqan qopardı, gecələri ahü-zar.

Günlər keçdi, qalmadı heç onda, qüvvət, güc daha,
İtə olan bu zülmlər xoş gəlmədi Allaha.

İtə başqa çarə yoxdu qapı bağlı, ev zindan,
Rəhm eylədi ona bağlı qapıları açdıran.

Qəzadan bir alov düşdü ev alışdı sübh erkən,
Qapı yandı, it də xilas oldu ölüm cəngindən.

Əfsus olsun elə nəfsə, o alçaqdır itdən də,
Güzaranı pərişandır düşüb möhkəm kəməndə.

Nə naləsi əsərlidir, nə duası müstəcab,
Əməlləri tərsinədir, günahları bihesab.

Dərgahından alar bir pay hər hünərli, hünərsiz,
Özlərisə qalar daim macəradan xəbərsiz.

Haqqın böyük kərəmindən məhrum qalmaq yararmı?
Kərimlərin paxıllarla nisbətləri də varmı?

Qüdsi, mütləq sənə addan, şan-şöhrətdən fayda yox,
Tale küskün, bəxtin zəbun, səadət yox, nalə çox.

Bir cazibə istə qüdsi aləmdən ey Qüdsi zar,
Ta istəyin təxəllüsə uyğun gəlsin aşikar.

İndi belə olsan əgər sən nəfsinə qul, yenə,
Yəqin bil ki, dərman olmaz ürəyinin dərdinə.

## ALÇAQ NƏFSDƏN ŞİKAYƏT

Alçaq nəfsin dad əlindən verir mənə min əzab,
Odur verən ürəyimə sonsuz kədər iztirab.

Cananımın dərgahından uzaq salır o məni,
Onun zalım əllərilə alışır can xərməni.

## FİKRİ SÜBUT

Bir mötəbər kitabda mən gördüm belə bir xəbər,
İt ayağı dəyən yerə qədəm basmaz mələklər.

Neçin bəsit Əshabi-Kəhf ilə kaha girərək,
Dördüncü ya səkkizinci hesab oldu o köpək*.

Neçün gəlib tapmadılar mələklər o kahanı,
Bu hədisin dəlilləri, həqiqəti bəs hanı?!

İt bəlkə də alçaq nəfsi timsalıdır insanın
Bəlkə ən şum, ən murdar bir xilqətidir cahanın.

Həq nurunu örtür, qəlbi boğur zülmət içində,
Kim gecələr günəş görmüş bu kainat içində?!

Binəvadır o adam ki, sevgilisi böylədir:
Vəfasızdır, can alandır, işi riya, hiylədir.

Bu zalım yar salır hər an məni dərdə, möhnətə,
Min günaha düçar edir, salır böyük zillətə.

Nə etməli, çarəsizəm dərdlər isə aşikar,
Gözüm varsa baxmaq üçün, yoxdur əldə ixtiyar.

Gah kor edir, ağlın gözü tapmaz olur işıq, nur,
Gah beynimi məğrurluğun küləyilə sovurur.



Mən filanam, filankəsdən neçin qalım bəs dala?
Ya filankəs neçin belə çatmış cahü cəlala!?

Ağıl məndə, özümdədir dünya malı, dövlət də,
Kimdən əskik yaranmışam istedadda, cürətdə?!

Belə boş-boş xülyaların əsiri hər əqli kəm,
Gecə-gündüz xiffət edib kədərlənir, çəkir qəm.

Lakin edir özü kimi yüzlərinə köləlik,
Bu ölümə həyat deyir ölməsə də hələlik.

Ömür keçir çox mənasız boş-boş xəyal içində,
Aciz ikən üz göstərir saxta cəlal içində.

Edir çılğın ehtiraslar könlümüzü tarimar,
Gün keçdikcə rəzalətə sürükləyib edir xar.

Malu dövlət, ya da şöhrət arxasınca hər zaman,
Həftə-həftə, ay-ay, il-il dolanırıq sərgərdan.

Tamahkarlıq varlılara əl açdırır bax sənə,
Eşidirsən hər alçaqdan min sərzəniş, min tənə.

Arzu, tamah tükənməyir, bitmir tələb, iztirab,
Bu minnət, bu tənələrə olmayırsan kamiyab.

Hirsə əsir o yolçuya bənzəyir bu, eşit, qan!
Əl açaraq utanmadı el-obadan, Allahdan.

## HEKAYƏT

Bir kişinin vəziyyəti pisləşəndə bir qədər,
İstədi ki, işlərini sahmanlasın birtəhər.

Pul götürüb çölə çıxdı ki, korlara paylasın,
İstədi ki, ehsan üçün o korları haylasın.

Bir gözlü də qaça-qaça gəlib ona açdı əl,
Yalvararaq pul istədi, dedi: "Məni qovma gəl!"

Kişi dedi: "Mən korlara pul verirəm, çəkil get,
Sən gözlüsən, heç olmasa öz boyundan həya et!

Gözlülərə pul paylamaq adət deyil heç zaman,
Rədd ol sənə bir pay düşməz mənim ehsan pulumdan".

Yoldan ötüb keçirdi bir dünya görmüş əhli-dil,
Bu sözləri eşidincə durub güldü dedi: "Bil.

Lap madərzad korlardan da daha kordur bu adam
Ondan neyçin sən umursan heysiyyətə ehtiram?!

Əgər o kor olmasaydı yolçuluğa getməzdi,
Səndən kərəm gözləyərək, Allahı tərk etməzdi.

Bu da kordur ki, pay umur özü kimi bəndədən,
Bu gözlünü o korlardan ayırırsan nahaq sən".

## ŞİKAYƏTİN SONU

Zalım nəfsin min başı var, min rəngi var dünyada,
Hər an başqa cilvə ilə üz göstərir bir əda.

O hər kəsdə bir ayrı cür zühur edir hər zaman,
O gah qızğın atəş olur alovlanır onda can.

Bu fikrimi sübut üçün, bax "kitabi-Məsnəvi",
Əsərində nə kəşf etmiş alicənab Mоləvi.

Həris nəfsin yüz başı var, hər başında bir əməl,
Əl çatmayan asimandan yer altına atmış əl.

Birisinin uşaq dərdi, dövlət dərdi, mal dərdi,
Gör "innəma əmvaləküm" necə düzgün xəbərdi.



Biri kefə düşkün olub arxalandı zoruna,
O birisi əsir düşdü çirkin şəhvət toruna.

Bir başqası şirin nemət həvəsilə yaşadı,
Birisi də əlvan xələt həvəsilə yaşadı.

Bir digəri cahu cəlal axtardı hey durmadan,
Birisi də kölgəsindən qorxub oldu hərasan.

O birisi ləzzət aldı nökərçilik etməkdən,
Başqası da ad qazandı elm ardınca getməkdən.

Bir başqası hiylə qurub, gəldi xalqa min kələk,
Zöhdü təqva toru qurdu hər an misli-hörümçək.

Hər birisi məqsədinə çatmaq üçün çalışır,
Öz ömrünü puç eyləyir, boş işlərə alışır.

Boşa çıxır əməlləri, kəsilirsə əlacı,
Bar vermirsə arzusunun, istəyinin ağacı,

Hiylə qurub bidad edər istər qanlı intiqam,
Qərəz ilə, qəzəb ilə tutmaq istər bir məqam.

Hər cür rəzil vasitəyə əl ataraq o qəddar
Hər vəchlə zalım nəfsə çıxmaq istər tərəfdar.

Bilməz sonra nə zərbələr dəyəcəkdir nəfsinə,
Bəlkə birdən işlər tamam çevriləcək əksinə.

Zülmü həsəd hiylə ilə bu dünyada iş aşmaz,
Hər bir işin bir ziddi var, qafil olmaq yaraşmaz.

Bu barədə xatirimə düşdü gözəl hekayət,
Hər əməlin mükafatı veriləcək nəhayət.

## HEKAYƏT

Hindistanda bir şah vardı ədalətli, bəxtiyar,
Dünyaları fəth edərdi bu qüdrətli hökmdar.

Sonsuz idi qəzəbi tək onun lütfü, şəfqəti,
Hər tərəfə yayılmışdı adı, şanı, şöhrəti.

Etiqadca atəşpərəst olsa belə hökmran,
Xudpərəstlik badəsilə məst deyildi heç zaman!

Bütpərəstlik etiqaddan doğur aydın, aşikar,
Onda nə nəfs istəyi var, nə də nifrət, qorxu var.

Xudpərəstlik-dinsizlikdir, kafərlikdir bil, inan!
Məslək gedər, düzlük itər, yoxa çıxar din, iman.

Çox yazıqdır öz nəfsinə əsir olan dünyada,
Axır ömrü puç olacaq, çatmayacaq murada.

Çatmaq üçün arzusuna nəfsə uyan hər insan,
Öz işini salar daha çətinliyə anbaan.

O yazığın işi daim olar həsəd, sitəm, kin,
Bu dünyada halı budur nəfs ardınca düşənin.

Layiq deyil belə alçaq sifət məncə heç kəsə,
Xüsusilə ünvanına şah deyilən bir şəxsə.

Şahın hökmü olmalıdır xalq rəyinə müvafiq,
Elə bir iş tutmalı ki, xalqa olsun o layiq.

Ölkəsində qəddarlığa, zülmə etsə şah adət,
Heç bir zaman xalq içində hökm sürməz ədalət.

Şah bir etsə zülmü, onun xadimləri yüz edər,
Gedər elin iqtidarı, hörməti də tez itər.



Bu halları görən zaman söyləmişlər atalar:
Ölkədə şah zalim olsa, xadimləri can alar.

Viran edər öz yurdunu zülm eyləyən hökmran,
Həqiqəti yox eyləyər, puça çıxar din-iman.

Şah kafər də olub əgər ədalətlə görsə iş,
Rəhmət ilə yad olunar, versə elə asayiş.

Küfrilə zülm olan yerdə dövlət olmaz payidar,
Bəsdir, zülmü küfr haqqında söhbətini gəl qurtar!

Xülasə o padşahın var idi bir vəziri,
Ölkəsini düzəldərdi onun işi, tədbiri.

Hər kəs əgər döndərsəydi xaqandan üz arabir,
İşi islah etmək üçün çalışardı o vəzir.

Qəzəblənib xaqan versə ədalətsiz bir fərman,
Onu yanlış fərmanından döndərərdi hər zaman.

Vəzirdən çox razı idi xaqan ilə rəiyyət,
Hər bir işdə onun sözü kəsb edərdi qətiyyət.

Hökmdarı xeyr işlərə eyləyərdi o vadar,
Hökmdara sadiq idi, rəiyyətə havadar.

Bir gün xaqan xəstələndi, göründü son səfəri,
Fələk onun boğazına tökdü ölüm zəhəri.

Bu durumsuz dünyada bir boşluq oldu qisməti,
Bu qanundur: Gərək hamı içə ölüm şərbəti.

Səltənətə varis onun bircə oğlu var idi,
Onun da nə qanacağı, nə də ağlı var idi.

Çıxıb şahlıq taxtına o fərəhləndi, oldu şən,
Lakin sonra zəiflədi həm səltənət, həm vətən.

Vaxt keçdikcə düşmənləri baş qaldırdı hər yandan,
Dostlar isə yavaş-yavaş döndərdilər üz ondan.

Hər yetəndən hiylə, kələk işlətməkçin dərs aldı,
Ölkə içrə inamsızlıq günü-gündən çoxaldı.

Biri xoşa gəlmək üçün yaltaqlandı gülərək,
Biri qurub kef məclisi işə saldı min kələk.

Biri dedi: – Sənin kimi ləyaqətli sərdara,
Sənin kimi hökmdara, şücaətli sərdara,

Layiq deyil ömr eyləyə min-bir qovğa içində,
Şah olmalı daim kefdə, eşqü sevda içində.

Biri dedi: filankəsin qızı-gözəl bir afət,
Günəş çəkər camalının qarşısında xəcalət.

Bir yol ilə bu saraya düşməlidir o pəri,
Yalnız sənə layiq görmək olar elə gövhəri.

Başqasısa deyirdi ki, bir nəşədir mey cana,
İçib məst ol, kefli-kefli sarıl nazlı canana.

Biri dedi: Bir cavan var, çalan zaman o rudu,
Gözəl şaqraq nəğməsilə heyran qoyar Davudu*.

Məlahətli səsi ruha misilsiz bir qənimət,
Süleyman şah cəlalından çox üstündür bu nemət.

Püstə ağzı, saz səsilə oxuyanda bax ona,
Avazının hər cəh-cəhi dəyişilməz cahana.

Xülasə, şah elə daldı sonsuz eyş-işrətə,
Ki, unutdu şahlığını, laqeyd oldu millətə.

Hökmdarlıq qüdrətini verdi yelə, tufana,
İşə düşdü saqi, şərab, saray oldu meyxana.



Əvvəl əgər məhrumdusa düşüncədən, ağıldan,
İndi daha dəlidən də dəli oldu o nadan.

Şahın kefi məmləkətə bir dözülməz matəmdir,
Birisinin yersiz kefi minlərinə dərd-qəmdir.

O ağıllı vəzir isə olmayıb bir an rahət,
Bu qayğısız padşaha hey verirdi nəsihət.

Cahillərə əsər etməz nəsihət də, tədbir də,
Doldursan da havayıdır su qalarmı qəlbirdə?!

Şah işini qanmırdısa, vəzir yaxşı qanırdı,
Şahın axmaq işlərinin atəşinə yanırdı.

Çalışırdı ifşa etsin, hər hiyləni, qərəzi,
Təbib kimi o sağaltmaq istərdi hər mərəzi.

Düşmənlərin kələyindən o deyildi xəbərdar,
Bilməzdi ki, düşməninin məhv eyləmək qəsdi var.

## VƏZİRİ MƏHV ETMƏK ÜÇÜN FİTNƏKARLARIN TƏDBİRİ

Bir gün bədxah, paxıl, nacins və hiyləgər adamlar,
Vəziri məhv etmək üçün birləşərək nə ki, var –

İşlətdilər hiylə-kələk, uydurdular min yalan,
Qaldırmaqçın maneəni tezlik ilə aradan,

Hər birisi bir yol tapdı, bir söz dedi hər biri,
Axtardılar hansı yolla məhv etsinlər vəziri.

Axır biri dilə gəlib dedi: "Tapdım yolunu,
Ancaq belə üsul ilə məhv edərik biz onu:

Lazımdır ki, bir kahini əvvəl ələ alaq biz,
Əlbir olsaq işə kömək göstərər o, şübhəsiz.

Çünki xalqda kahinlərə ehtiram var, inam var.
Dində, dövlət işlərində onlardadır ixtiyar.

Tədbir töküb, yaxşı-yaman nə söyləsə kahinlər
Dedikləri söz-söhbəti inam ilə xalq dinlər.

Kahinlərə inanacaq yəqin sarsaq hökmran,
Hakim olluq, vəziri tez qaldırsaq biz aradan".

Bu fikirlə sirdaş olub onlar tədbir gördülər,
Bir kahinə dil tökərək ona daş-qaş verdilər.

Kahin ilə əlbir olub bir cəbhədə durdular,
Bu işə bir çarə üçün incə kələk qurdular.

Savadsızın hiyləsi də verməz böyük xəsarət,
Kahin əgər hiylə etsə baş verər min fəlakət.

Bu hikməti yaxşı öyrən, bunda dərin məna var,
Bu barədə gözəl sözlər söyləmişlər atalar.

Demişlər ki, kim dərs alsa pis adamdan dünyada,
Elə bil ki, bir kəsərli qılınc verdin cəllada.

Bir gün saray əyanları geniş məclis qurdular,
Sərkərdələr təkəbbürlə ön sırada durdular.

Şah məclisin baş ucunda oturanda taxtına,
Yaltaqlar dil tökən zaman cavan şahın baxtına.

Təzim edib irəliyə qədəm atdı bir qoca,
O pirani, alimsifət şeytan əvvəl bolluca

Şahı tərif eyləyərək dedi: "Ömrün çox olsun,
Baxtın, taxtın şöhrətlənsin, düşmənlərin yox olsun".

Dünən gecə mən yuxuda gördüm mərhum atanı,
Gördüm bir nur bürümüşdür nəhayətsiz dünyanı.



Mərhum cənnət bağlarında gəzir düzü-düzünə,
Çoxlu nemət qapıları açılmışdı üzünə.

Təbəssümlə dedi mənə: "Sabah qalxıb tezcə get,
Bu tənhalıq dərdimi tez şah oğluma bəyan et!

Ona de ki, bu cənnətdə bütün nemət olmuş cəm,
Lakin təkcə çatışmayır bir həmsöhbət, bir həmdəm.

O dünyada vəzirimlə birgə qəlbim çox şaddı,
Könlüm onun söhbətilə qəm-qüssədən azaddı.

Dost olmasa, oxşayır bax zindanlara bu cənnət,
Əgər oğlum istəyirsə daha olum mən rahat.

Qoy yandırıb vəzirimi tez yanıma göndərsin*,
Bu cənnəti daha da şən bir aləmə döndərsin".

O hiyləgər koramallar onu təsdiq etdilər,
Söylədilər hərə bir çox uyğun gələn xoş xəbər.

Nadan şahsa inanaraq, baş açmadı hiylədən,
Dedi: "Gərək tez yetirim yerinə bu əmri mən".

Vəzir işi belə görüb itirmədi özünü,
*Səbr edərək gizli qoydu qəlbindəki sözünü.*

Bildi ki, çox hiyləgərdir düşmənləri nə ki var,
Ancaq idrak və səbr onu bu bəladan qurtarar.

Təzim edib vəzir dedi: "Əzəmətli xaqanım,
Mən də belə yuxu gördüm, artdı maraq, həyəcanım,

Düşündüm ki, desəm atan dəvət edir yanına,
Düşünərsən: "Qulluq yatmır vəzirimin canına".

Bundan qorxub mən susdum, ah, bunu duyan hökmdar,
Başqa dostun dili ilə etdi hökmün aşikar.

Öz əmrini icra etdi bu kahinin dilindən,
Bu yol ilə xilas etdi məni əzab əlindən.

Böyük xaqan xilas etdi məni ağır təlaşdan,
Belə fəxri bir dəvəti şah bildisə bu zaman.

Gərək versin yubanmadan icrasına tez qərar,
Mənsə belə bir dəvətçün eyləyirəm iftixar.

Lakin uzun illər boyu qul olmuşam sizə mən,
Şahım mənim yanmağıma indi qərar verirkən.

Gərək məni yandırmasın həqarətlə, nifrətlə,
Yola salsın ehtiramla, nəvazişlə, hörmətlə.

Vida edib ayrılarkən sizin kimi "dostlardan",
Gərək məni təntənə ilə yola salsın hökmran.

Şah səbr etsin gərək məni yandırmağa neçə gün,
Ta ki, meydan hazırlansın mərasimə büsbütün.

Palıd şimşad gətirilsin, ocaq tonqal çatılsın,
Gül, zəfəran, müşkü ənbər od üstünə atılsın.

Böyük meydan mərkəzində yandırılsın bədənim,
Ki, qalmasın bu dünyada bir arzum da qoy mənim.

Belə hörmət ehtişamla yanmaq necə gözəldir!
Belə yanmaq özü böyük bir arzudur, əməldir"...

Oradakı əyan-əşrəf tərif-təhsin eylədi,
Gurultuyla vəzirə çox afərinlər söylədi.

Sonra xaqan təyin etdi yandırılmaq gününü,
Dedi: "O gün elan olsun bir mərasim düyünü"



## VƏZİRİN TƏDBİR İLƏ TƏHLÜKƏDƏN XİLAS OLMASI

Vəzir evə dönən kimi bir guşədə qaldı tək,
Düşündü ki, bu boladan xilas olsun o gərək,

Lağım atan çağırtdırdı öz yanına o gecə,
Ona bütün macəranı nəql elədi gizlicə.

Gələcəyə vədə verdi, şirnikdirdi qaş-daşla,
Dedi bir an vaxt itirmək olmaz, işə tez başla!

Bir lağım at həmən yerdən ortasına meydanın,
Boş yerə heç keçməməli bu iş üçün bir anın.

Usta Hümmət kəmərini bağlayaraq hünərlə,
Lağım atdı, dayanmadan çox sürətlə, zəfərlə.

Çox çəkmədi istənilən hazır oldu tər-təmiz,
Bu tədbirdən, bu əməldən hamı qaldı xəbərsiz.

Vəzir özü odun yığdı etibarlı adamla,
O meydanın ortasında qalatdırdı nizamla,

Məharətlə örtdü otla gizli yola bacanı,
Xəbər verdi şaha artıq çatdı yanmaq zamanı.

Bu xəbərlə guruldadı, böyük şəhər bir anda,
Yayıldı son surətilə bu macəra hər yana.

Kişi, qadın, uşaq, böyük toplaşdılar durmadan,
Baxmaq üçün çoxlarına qalmadı heç bir imkan.

Yer yox idi küçələrdə izdihamın əlindən,
Tərpənmək də olmayırdı xas, avamın əlindən.

Gözləyirdi saray əhli qızışdıqca od ocaq,
Görsünlər ki, vəzir necə diri-diri yanacaq.

Səf çəkərək durmuşdular sərkərdələr, əyanlar,
Vəzir gəldi cəsarətlə, üz-gözündə min vüqar.

Böyük inam, iftixarla şaha təzim edərək,
Ətrafını istehzalı baxışlarla süzərək,

Dedi: Şahım, qoy dövlətin artsın sənin dəma-dəm,
Bəxtin sənə qoy yar olsun, qulun olsun bu aləm.

Məni şahın qulluğuna aparərkən bu səfər,
Soruşsa o əgər sənin əhvalından bir xəbər,

Nə söyləyim! Şah dedi ki, məni əzir, de hicran,
Qoy ona bir məktub yazım, qoy oxusun şadiman.

Sonra o bir məktub yazdı baxa-baxa cəmaət,
Hər şeydən az xəbər verib tamam etdi, nəhayət,

Təqdim edib dedi: – Apar, atamı sən salamla!
Qucaqlaşıb yola saldı vəziri ehtiramla.

Vəzir girib odunların arasında oturdu,
Bədxah olan fitnəkarlar odunlara od vurdu.

Atəşpərəst dini necə deyirdisə – etdilər,
Vəzir "yanıb kül olan tək" dönüb evə getdilər.

Lakin vəzir asimana yüksələndə od tüstü,
Nicat tapıb gizli yolla evə getdi əlüstü.

Günlər, aylar keçdi, vəzir gizli qaldı nəzərdən,
O, ölkədən xəbərdardı, şah xəbərsiz xəbərdən.

O, ölkənin halını çox izləyirdi xəlvəti,
Bir gün üçün müntəzirdi, gözləyirdi fürsəti.

İşin sonun gözləyirdi maraq ilə hey vəzir,
İstəyirdi görsün nə bar verəcəkdir bu tədbir.

Müxtəsər ki, o hariflər bu kələkdən xoşdular,
Rahat nəfəs alıb, daha əl-qol açıb coşdular.

Nə istədi hər kəs etdi, nə bir hesab, nə kitab,
Ölkə xarab oldu, xalq da çəkdi böyük iztirab.



Hər tərəfdə zülm o qədər artdı xalqa anbaan,
Çox çəkmədi ölkə oldu əhaliyə bir zindan.

Dövlət işi elə bərbad hala düşdü, nəhayət,
Hətta nadan şah da qandı nə yerdədir vəziyyət.

Lakin o nə əlac etsin bu sağalmaz dərdinə,
Bu dolaşıq işi necə sahmanlasın o yenə?

İndi bildi etmir əmri vəzirsiz heç bir təsir,
Atılan ox geri dönmür, getmiş əldən o vəzir.

Çox təəssüf elədisə, oldusa da peşiman,
Peşmançılıq fayda verməz, qalmış idi o heyran.

## VƏZİRİN GERİ QAYIDIB DÜŞMƏNLƏRİ CƏZASINA ÇATDIRMASI

Vəzir gördü daha gedir ölkə əldən, el əldən,
Səltənətin bünövrəsi sarsılmada təməldən,

Kahin vardı xalq içində çox hörmətli xoşnəfəs,
Hamı onu tanıyırdı – din adamı, müqəddəs.

Vəzir ona göndərərək gecə gizli bir xəbər,
Çağırtdırıb qızıl verdi, etdi böyük vədələr.

Dedi: "Sabah şah yanına o tələsik gedərək,
Əyanların yanındaca şaha təzim edərək,

Desin: – Dünən gecə gördüm mərhum şahı yuxuda,
Qəm-qüssədən asimanə çıxmış ahı, yuxuda.

Dedi nə səhv elədim mən düşünüb tək özümü,
Öz əlimlə başsız qoydum əziz iki gözümü.

O vəzir ki, tədbirilə yüksəlirdi məmləkət.
O vəzir ki, hünərilə qurulurdu səltənət.

Belə mahir bir vəziri mən ayırdım oğlumdan,
Zəiflədi səltənətim, qaldı ölkə, yurd viran.

İndi daha son qoymaqçın xəyanətə, böhtana,
Vəzirimi göndərirəm kömək olsun xaqana.

Get xəbər ver qoy çıxsınlar pişvazına bu axşam,
Təntənəylə qarşılayıb eyləsinlər ehtiram.

Söylə həmən yerdən vəzir yenə əyan olacaq,
Gətirdiyi fərman ilə hər şey bəyan olacaq".

Şah eşitcək çox şad oldu, səs yayıldı hər yana,
Əyanlarla axşam çağı üz qoydu şah meydana.

Gördü vəzir yanan küldən baş qaldırdı nagəhan,
Haman paltar, qiyafətdə, qaldı şahla xalq heyran.

Vəzir açıb qollarını cəld atıldı meydana,
Təzim edib nəvazişlə gülümsədi xaqana.

Hökmdarın atasından uydurараq yüz yalan,
İftixarla öpə-öpə verdi şaha bir fərman.

Şah da öpüb o fərmanı əvvəl sürtdü üzünə,
Məzmununu çox müvafiq gördü o gün özünə.

Oxudu ki, şah vəzirə hörmət etsin həmişə,
O, vəzirin sözlərilə əməl etsin hər işə.

Yazmışdı ki, necə olsun, ölkə, saray, məmləkət,
Sonra neçə qəzəbli söz yazmış idi. Nəhayət,

Demişdi ki, köməyinə göndərirəm vəziri,
Çətin işdə əsas olsun sənə onun tədbiri.

İndi gərək tək qalmayım incitməsin qəm, kədər,
Saraydakı şənlik sevən əyanlardan beş nəfər,

Göndərərsən mən də burda onlar ilə olum şən
Qoy bir az da onlar ilə məclis qurum burda mən.



Qoy bu qəmli ürəyimi onlar ilə edim şad,
Daha aydın olsun deyə bax yazıram adbaad.

Şah tələsik yığdı bütün əyanları həvəslə,
Atasının fərmanını elan etdi gur səslə.

Sonra da şah əməl edib bu aldığı fərmana,
Göstərilən adamları toplatdırdı meydana.

Onlar necə hıçqıraraq etdilərsə nalələr,
Bu nalələr şah qəlbinə eləmədi bir əsər.

Üzürləri rədd edildi, xahişi boş sandılar,
Şahın qət hökmü ilə başdan-başa yandılar.

O fitnəni törədənlər qurban getdi özləri,
Həyatını fitnələrə qurban etdi özləri.

* *
*

Bəli, belə olmuş dünya – nə tökərsən aşına,
Öz tökdüyün çıxacaqdır axırda öz qarşına.

Çox yerində deyilibdir ataların bu sözü,
Özgələrə quyu qazan düşəcəkdir bil özü.

Nəyi rəva bilməyirsən özünə sən ey filan!
Başqasına onu rəva görməyəsən heç zaman.

Çalış daim başqasına yaxşılıq et dünyada,
Ki səni də yaxşılıqla salsın hamı qoy yada.

## YOLU AZMAQ

Öz arzuna çatmaq üçün etsən kimə sən nifrət,
Bəsləyirsən ürəyində ona min cür ədavət.

Sonra da bu ədavətdən dərdə dəva umursan,
Ürəyində fitnə-fəsad atəşinə cumursan.

Könlündəki qızğın atəş varlığını məhv edər.
Bundan böyük, vahiməli əzab varmı de məgər?

Bu zəhmətlə öz ömrünə son qoyursan bil tamam,
Nə var, nə var düşməndən alacaqsan intiqam.

Bilməyirsən kinli düşmən nə fikir, nə haldadır,
Bəlkə tale bu əməldə, yazıq, səni aldadır?

Bil ki, iki tərəfə də zərərlidir kin, qisas,
İnsanlarda bədbəxtlikdir xəbis duyğu, ehtiras.

Yolumuzun üstündəki toru niyə görərək,
Özümüzü bu tələyə atmış olaq biz gərək?!

Azğın nəfsin tələbidir, fitnə, fəsad, hiylə, qan.
Aqil adam uymaz belə xəyallara heç zaman.

## TƏMSİL

Nəfsin elə bir ağacdır, zəhərlidir hər barı,
Cəhənnəmdən gətirilmiş bil ki, onun tumları.

Ondan qaçıb öz canını qurtar, əgər ağlın var,
Unutma ki, zəhərlidir verəcəyi bəhər-bar.

Peşmançılıq meyvəsini yeyəcəksən sən bir gün,
Həyatını zəhərləyər bu meyvələr büsbütün.

Ey ilahi, özün yazıq Qüdsiyə bir imdad et,
Belə alçaq duyğulardan ürəyini azad et!

Öz eşqinin kədərilə fərəh verib hər zaman,
Qurtar onu öz nəfsinin əlindən, ey yaradan!





## SUALLAR

Ey sağlamlıq bəxş edən məriz Şəhab,
Pak ruhlusan, gəl sorğuma ver cavab*.

Cəmiyyətdə qəlbim olmuş pərişan,
Tən mülkündə ruhum tapmır aşiyan.

Axtardığım əsrarı kəşf edərək,
Torpağından gözlərimə sürmə çək!

Mənə gizli qalanlar bihesabdır,
Yol azana yol göstərmək savabdır.

Nə dənizdir ki, görünmür sahili?
Zahirindən məlum olmur daxili.

Nə damladır, həm dənizdir, həm bulud?
Mömin kimdir, kəbr kimdir, qıl sübut!

Biz kimik və nə deməkdir sən və mən,
Biz yoxuqsa, bəs nədir bu əncümən?

Həqiqətdə yoxsa əgər küfrü din,
Bəs nə üçün hərə tutmuş bir ayin?

Əgər kitab təkcə doğru yoldursa,
Hərə bir yol tutmuş neçin dünyada?

Sağda, solda duran əshabələr də,
Neçin getsin cəhənnəmə, behiştə?

Deməli bəs "Sabiqundur" əfsanə,
Hüzurunda müqərrəbdən məna nə?

Mümkün də yox ortalıq da, vacib də,
Bəs nə fərq var mümkün ilə vacibdə?

Əyandırsa əgər ona bu aləm,
Ölüm, həyat görünmürmü bəs mübhəm?

Hər kəs "Allah mənimlədir" – deyərsə,
Onun lütfü aiddirsə hər kəsə,

Kimdir bəs yar, əğyarımız o zaman,
Nədən doğmuş nazü niyaz, vəsl, hicran?

Təfəkkürdən taət üstünsə əgər,
Heyrət içrə qaldı neçin peyğəmbər?*

Aşiq qəlbi bir qətrə qandır, bilməm,
Necə sığır onda bütün bir aləm?

Əgər varlıq əbədisə, ədəm nə?
İnam varsa, şübhə nədir, qəsəm nə?

Nə haldır ki, dinsizləşir bir insan,
Sudan quru çıxa bilmir hər zaman?

Əgər hamı bir badədən sərxoşdur,
Neçin biri dilli, biri xamuşdur?

Aşiq nədir, məşuq nədir, et izhar,
Doğrudan da, necə şeydir düz ilqar?

Rəmz ilə ləb, göz, xal necə deyilir?
Üzə gündüz, zülfə gecə deyilir?

Məgər gecə görərmi heç gündüzü?
Parlar amma zülf içində yar üzü.



Şadlıq doğar kədərdən, nə deməkdir?
Bu yol üçün nə azuqə gərəkdir?

Hansı qəmdir ki, ovudur hər kəsi?
Nə atəşdir yüz şölə hər zərrəsi?

Meydən nədir məqsəd, kimə o əşdir?
Soyuq suya deyirlər ki, atəşdir?

Lütf edərək sorğuma ver sən cavab,
Əziz canım sənə qurban, ey cənab!

## HÜSNDƏ EŞQİN ZÜHURU

Bəh, o necə yerdir ki, bəslənir orada can,
Həmişə o saxlayır ürəyi şux və cavan.

Nəzərlərdə hər yeri ürək açan gülzardır,
Yay zamanı belə, o səfalı bir bahardır.

Nəsimi xoş ətirli hər dərdə dərman verir,
Oxşayaraq ruhlara başqa cürə can verir.

Ağaclarda hər zaman quşlar gəlir fəğana,
Çaylar başqa gözəllik verər bu gülüstana.

Saf suların aynası parıldayır gör necə,
Gündüz günəştək yanır əks edir ayı gecə.

Bu cözəllik cismdir, odur ruhu vicdanı,
Mənasızdır bu hüsnün onun mehri-tabanı.

Cəmlənmişdir vücudda sözlərdəki lütflər,
Səndədir hər gözəllik, bir özünə sal nəzər.

Yarəb, vücud xəznədir bəxş etmisən insana,
Dünyada hər neməti, varı verdin sən ona.

Hüsn desəm ona mən, nədir onun təsviri,
Eşq desəm, necədir onun cismə təsiri?

Məcnun rüsva olduqda eşqində yana-yana,
Leylininsə dəvəsi üz qoydu biyabana.

Bahar vaxtı bülbüllər qoparanda şur, fəğan,
Güllər isə parçalar yaxasını durmadan.

Ağıl bəndə düşərək burada mat dayandı,
İşraqi, məşşailər, doğub belə yarandı*.

İşraqilər dedi ki, işıqda çox hikmət var,
Hüsnün işıqlanması eşqi etdi aşikar.

Məşşailər dedi: "Söz cismdədir əl-əlbət,
Bu nurdandır vücudda hər təsir, hər lətafət".

Şübhə düşdü araya, işlər dolaşdı bütün,
Yunan hikmətilə də açılmadı bu düyün.

Bir xəyaldır yunanın fəlsəfəsi, hikməti,
Çatmır eşqi-izaha bu hikmətin qüdrəti.

Ey Qudsi, sən qəlbinin gözlərilə dosta bax,
Qəlbin sənə nə desə, onu qəbul et ancaq.

Sən vahid bir vücudu gör ki, odur həqiqət,
Onun hüsnü zahirdə, batindəsə məhəbbət.

## ƏRZİ-ƏHVAL

Ey şuridə bülbül sənsən bizə yar,
Aşiqlərə təkcə sənsən havadar.

Sənsən ülfət gülzarının məhrəmi,
Sənsən ülfət əsrarının həmdəmi.



Məhəbbətdə xar olursan bax, sən də,.
Tikan batır sinənə hər gülşəndə,

Bir az da gəl mənimlə ol həmzəban,
Öz qəmimdən söyləyim bir dasitan.

Gəl dərdləşək, bir az edək biz söhbət,
Edim sənə zəmanədən şikayət.

Sənsən könül quşuyla həmaşiyan,
Eşqə, qəmə şərikimsən hər zaman.

Qanad çalıb düş Şirvana yola sən,
Xəbər apar gülüstana, qəfəsdən.

O gülüstan ürəyimə ruh verər,
Güllərilə olur bu can müəttər.

O yerdə var yüz lətafət, yüz bəzək,
Görüşünə can atmada göz, ürək.

Ərz o yerlə göylərdən möhtərəmdir,
Bir qismi də gülüstani-irəmdir.

Gülləri şad olar daim büsbütün,
İşıqlıdır ulduzları o bürcün.

O gül üçün qana dönmüş ürəyim,
O ulduzdan pozulmuş hər diləyim.

Ağzım ahla dolu, nursuz – gözlərim,
Ondan uzaq gecədir – gündüzlərim.

Hüzuruna gedib çatan kimi sən,
Mətləbə bir fürsət tapan kimi sən,

Ciyər qanı axıt torpaq gil olsun,
Bir ah çək ki, qəlbi yanıb kül olsun.

Səhv etdim, yox, dəymə bir az könlünə
Vəfada bir könül çatmaz könlünə.

Qoy fələyin büryan olsun ürəyi,
Qan etməsin o hər məsum ürəyi.

Sonra dil aç göstər ona bəyanı,
Ona çatdır bizim bu xoş dastanı.

Söylə etdin sən ağlımı pərişan,
Ey könlümə işıq verən əziz can!

Var bir həyat ləzzətindən binəsib,
Öz könlündən ayrı düşən əndəlib.

Deyir, mənim bir halıma nəzər sal,
Əhvalımdan xəbər tut bir haya qal!

Mən "göz" desəm bir "göz" çıxar haman dəm,
Ruzigarım dönüb olar cəhənnəm.

Gündüzümlə gecəm fərqli deyildir,
Yuxusuzluq göz nurumu əskildir.

Gözlərimdə əks eyləyir camalın,
Məni bir an tərk etməyir xəyalın.

Neçin deyim ki, ürəyim al qandır?
Sənə ki, hər dərdü qəmim əyandır!

Əzab verir mənə gözümlə ürək,
İstərəm ki, şövqilə bir görüşək.

Sənin kuyun mənə verir səadət,
Zərərin də olur mənə mənfəət.

Qəmlərində var idi bir dilşadlıq,
Sən verirdin bu ruhuma azadlıq.



Gülməkdəydi üzümə xoş səadət,
Dilimdə heç yox idi bir şikayət.

Kuyində mən ömr edərdim şadiman,
Olmuşdum hər işdə kamil, hökmran.

Nə bilim ki, yaramazdır bu fələk,
Həyatımı belə alt-üst edəcək.

Səlamətkən bir gəmidə bir nəfər,
Bilməyirdi qədrini o bixəbər.

Bir az sonra dəniz gəldi xruşə,
Civə kimi titrədi, gəldi cuşə.

Dalğalar da hücum etdi durmadan,
Gəmi dolu piyalə tək o zaman –

Oynayırdı dalğalarda ürəklər,
Çör-çöp kimi atılırdı diləklər.

Xəbər verim o zavallı adamdan,
Olmuş idi qorxusundan yarımcan.

Birdən düşdü dənizə o gəmidən,
Boğazından tutdu əcəl çox erkən.

Bir az batıb-çıxdı yazıq naəlac,
Təsadüfən keçdi ələ bir ağac.

Ağacla tez atdı sular sahilə,
O, ac-susuz qalsa da xeyli belə.

Şükr edirdi bu hala təkrar-təkrar,
Dərman qədrin bilər xəstə olanlar.

Məni də xoş gündən qafil görərək,
Onun kimi hala saldı bu fələk.

Xoş günümü buraxaraq əlimdən,
Gördüyün bu yazıq günə düşdüm mən.

Bilmirəm ki, sonum necə olacaq,
Bir ümidlə yaşayıram mən ancaq.

Deyirəm ki, Qüdsi, etdin çox qəflət,
Gec anladın nədir əsil səadət.

## XƏYALIN UÇUŞU

Çox gəzmişəm mən səyahət edərək,
Rusiyadan – Lehistana gedərək,

Bir neçə ay Varşavada qalmışam
Hər cür eyşü işrətdən kam almışam.

Çox adamla tanış oldum mötəbər,
Həvos əhli, hər bir işdən baxəbər –

Şəxslərlə məclislərdə oturdum,
Hər mədəni cəmiyyətə baş vurdum.

Bu diyarın Saları çox tədbirli,
Şahın yaxın naibi bir əmirdi.

Paskeviç! Bu adda böyük şöhrət var,
Öz adıyla məşhur olmuş bu salar*.

O hər gecə şən məclislər qurardı,
Bu məclisdə hər kəsə bir əş vardı.

Görünürdü hər gözəl bir xoş rənglə,
Cilvələnib dururdu min bəzəklə.

Ruh verirdi o gülşənin hər gülü,
Hər bir gülün yanında öz bülbülü.



Hər dilbər bir odlu baxış, bir nazla,
Aşiqini arayırdı niyazla.

Ram olub hər vəhşi ahu aşikar –
İstəyir bir ovçu etsin o şikar.

Yer etdikcə camal gözdə, könüldə,
Haldan hala düşürdü bu könül də,

Ürək çalmaq buralarda adətdir,
Məhəbbətdən söhbət adi söhbətdir.

Gözəllikdə olmaz onlara çatan,
Eşqi belə qaldırmışlar aradan,

Bu şəhərin bağı cənnət bağıdır,
Hər görüşdə ələmləri dağıdır.

Hər gözəllik bu şəhərdə olmuş cəm,
Bu yerlərin təsvirində acizəm.

Tərif etmək mümkün deyil söz ilə,
Görmək lazım bu şəhəri göz ilə.

* *
*

Mən bir gecə xəstələndim, qəfildən,
Evdə qalıb, uzaq düşdüm məclisdən,

Xəyal olcaq həmdəmim öz başımda,
Sakit oldu hər bir işdən başım da.

Nə aləmdir, bəh-bəh xəyal aləmi!
Nə gözəldir xəyalın bu xoş dəmi!

Dedim, xoflu, xəyalıma, "Gəl dilə,
Bu gecəni qoy keçirim səninlə".

Dedi: "Kimdir məndən yaxşı sənə yar?
Sənsə mənə etməyirsən etibar".

Dedim: "Necə mən səninlə dost olum?"
Dedi: "Budur haqqa gedən düz yolum.

Badəmi iç, məst ol, getsin dərdü qəm,
Önündə şam yandır, ələ al qələm.

Açıq deyim hər fikrimi qulaq as!
Bil ki, vardır hər şadlığa bir əsas.

Əvvəl deyim sənə uca evlərdən,
Düzdür, onlar düzəlmiş ağ mərmərdən.

Tikilir çox zəhmətlə hər imarət,
Bilinməz o kimə çatar nəhayət.

Gəl məclisdən və sərvətdən danışaq,
Bəzək, çalğı səadətdən danışaq.

Xoşdur məslis, nəğmə, şadlıq hər zaman,
Bunlar qoymaz ürək olsun pərişan.

Lakin olsa məclisbazlıq bir adət,
Boşdur ona çəkilən hər məşəqqət.

Bu nazənin, pəri üzlü hər nigar,
Şirin dilli, xoş söhbətli, nazlı yar,

İşə salıb minbir kələk, hiyləni,
Məhv edərlər onlara meyl edəni.

Canan deyil, cana dərddir hər afət,
Onlarda yox mehribanlıq, sədaqət.

Bunca bəzək, zinət deyil nöqsansız,
Hər kəs onu daşımadı həycansız.



Hər nə qədər kamil olsa, kəsri var,
Lap yaxşını pis söyləyər düşmanlar.

Yadımdadır bir şux gözlü bir gecə,
Özünə çox bəzək vurdu gizlicə.

Bu bəzəyə zəhmət çəkdi çox zaman,
Sonra dedi zər ver, zivər alasan.

Lakin lağa qoyuldu tez o nigar,
Bu bəzəkdə min cür nöqsan tapılar.

Xoş geyinmiş, xoş bəzənmiş, xoş gülən,
Dostlar gördüm dildə tez-tez "can" deyən.

Üzdə sanki səadət var qanında,
Fikri isə öz xeyrinin yanında.

Üzdə deyir: "Dostam sənə ürəkdən",
Həqiqətdə olur qatı bir düşmən.

Yüz hiyləyə əl atıb bir ovçu tək,
Tora salır səni qafil edərək.

İndi özün insaf ilə yaxşı bax,
Yaxşıdırmı belə qafil yaşamaq?

Bu da haman eyş-işrətdir ay filan,
Şüurunu alıb etdi sərgərdan".

Mən eşitcək bu kəlamı çəkdim ah,
Dedim: "Necə gör həyatım keçdi, ah!

Məni yurddan ayrı saldı bu səfər,
Dostlarımdan qaldım necə bixəbər!

– Mən firəngə bir səyahət eyləyim*,
Elmü fəndən kəsbi-ləzzət eyləyim

Deyə, düşdüm boş xəyala mən aman,
Dəmir zərlə örtülübmüş nə yaman!*

Bu fikrim coşdurdu tez xəyalı,
Çox tünd oldu, dəyişildi əhvalı.

Söylədi: "Ey sözü, işi boş, nadan,
Dərdə düşüb dərmanını tapmayan.

Hər ifratdan mən etmişəm səni mən,
Aşdın niyə hüdudunu belə sən?

Haqqın tanı, ona eylə riayət,
Bu səfərdən gəl heç etmə şikayət.

Səfər sənə tanıdır bu dünyanı,
Öyrədir o sənə elmi, ürfanı.

Yadındamı Rum elində, İranda,
Bir düşkünlük görmüşdün hər insanda.

Xəbərsizdi onlar bütün aləmdən,
Yabançıydı onlara hər elmü fən.

Düşünürdü tək özünü hər biri,
Olmuşdu öz tamahının əsiri.

Fəxr edirdi hər kəs varla, nəsəblə.
İşi yoxdu təhsil ilə, ədəblə.

Bir məqsəddi dövlət yığmaq hər kəsə,
O dövləti sərf etsin boş həvəsə.

Axtarıb bir mənsəb tapsın özünə,
Zorla xalqı tabe etsin özünə.

Dəm vuraraq onlar həsəb-nəsəbdən,
Kənardılar hər bir hünər ədəbdən.



Yadındamı o zaman bu söhbətlər,
Ürəyinə salırdı min qəm, kədər.

Buna görə sən eylədin səyahət,
Bəlkə bir az qəlbin ola fərağət.

Darıxdı bəs burda niyə ürəyin?
Başqa bir yer olmuş indi diləyin.

Pərişanlıq qoymaz sən kam alasan,
Bir yerdə sən durub rahat qalasan.

Artıq sənin ömrün keçmiş hədərə,
Çox dolandın bu aləmdə dağ-dərə.

Hər tayfayla elədin sən çox söhbət,
Aldığın nə oldu bundan nəhayət?

Qəflət içrə uyumuşdur kamalın,
Ayrılmadın bax indi də; xəyalım-

Çox mənalar mənə izah eylədi,
Yatmış idim, sanki bidar eylədi,

*Dedim:* "Sən ey *mayasızlar mayası,*
Müflislərin sənsən dərdə davası.

Sayəndə çox dərdə əlac tapılar,
Təxtü tacsız şaha dönər gədalar.

Mənsəbindən məst olanı sən haman,
Ayıldarsan mənasız, boş xülyadan,

Kim özünü yüksək bilsə hər kəsdən,
Öz həddini qandırırsan ona sən.

Bir yol göstər mənə, oldum biçarə,
Bu dünyada istəksiz bir avarə.

Söylə nə cür mən də çatım murada,
Nə iş ilə məşğul olum dünyada?

Nə etməli ki, asudə olum mən,
İslam ilə Firəng çəkişməsindən*.

Söylə varmı bu dünyada bir imkan,
Ki orada ürək olsun kamiran?

Burda xəyal ayrıca bir surətdə,
Məni haldan-hala saldı sürətlə.

Tam unutdum varlığımı mən bu dəm,
Bilmədim ki, haradayam, mən kiməm?

Çox qəribə hala düşdüm, nagahan,
Gözlərimdə cilvələndi bir məkan.

Bəh, nə gülşən, bəh, nə əlvan mənzərə!
Gəlin kimi bəzənmişdi, dağ, dərə.

Şırıltıyla axır hər yan çeşmələr,
Sularda gül göz yaşıtək əks edər.

Əlvan paltar geymiş necə bu diyar,
Səf-səf durub bax meyvəli ağaclar.

İki yandan çay axmada sürətlə,
Ad qazanmış bu yer böyük nemətlə.

Yüksək bir dağ önündə mavi dəniz,
Hər ikisi ləzzət verir şübhəsiz.

Dağ başında qar ağarır hər zaman,
Qülləsində soyuq hava biaman.

Qarşısında günəş belə baş əyir,
Sayəsində bir aləmə vermiş yer.



Mavi rəngli dənizmidir bu, aman,
Ya da yerdə vardır başqa asiman?!

Orda gəzən gəmidə var bir cəlal,
Sanki göydə gəzir aydın bir hilal.

Gur çayların arasında aşikar,
Çox sofalı yerdə gözəl bir kənd var.

Bağı, cənnət bağının bir kənarı,
Göz yaşıtək duru axır suları.

Bülbülləri cəh-cəh vurur biqərar,
Havasında bu yerin gül ətri var.

Evləri, bax yaşıllığa bürünür,
Sanki göydə nurlu ulduz görünür.

Hər tərəfi yaşıl, sarı rəngli kərd,
Birləşmişdir sanki qızıl, laciverd.

Çöldə sürü gəzdirir, bax hər çoban,
Neylərində bir səda var ruh açan.

İşsiz qalmaz nə ki, qadın, kişi var,
Bu yerdə bax hər kəsin öz işi var.

Burada kin, həsəd bilməz bir insan,
Qardaş kimi bir-birinə mehriban.

Ayrıca bir ev gördüm arx başında,
Bir doğmalıq var idi hər daşında.

Çox da gözəl deyildisə imarət,
Saraydan çox onda vardı şərafət.

Ətrafında güllər açmış gülşəndi,
Bu evin hər mənzərəsi çox şəndi.

Həyətində hovuz, önü xiyaban,
Bir tərəfdə bağı vardı al-əlvan.

Gördüm ki, çox cəlallıdır bu bina,
Dedim burda gərək olsun kətxuda.

Sonra tanış olmaq üçün əhvalla,
Mə bu evə daxil oldum xəyalla.

Ev sahibi evdə idi, sübh ikən,
Yatağında yatmış idi xeyli şən.

Yanındaca öz qadını şadiman,
Bir bədəndə biri ruhdu, biri can.

Sonra qəhvə içirdilər kədərsiz,
Ömürləri keçirdi xoş, xətərsiz.

Söhbət edib gülürdülər anbaan,
Hər sözləri xoşdu, gözəl, mehriban.

O bir sadə paltar geyib tez durdu,
Gəlib başqa bir otaqda oturdu.

Bu otaqda xeyli kitab var idi,
Hər suala orda cavab var idi.

İslamın və Firəngin hər əxbarı,
Sülhün, həm də davanın hər əsrarı.

Zahirdə bir guşənişin görünər,
Lakin verər Hind, Rum, Çindən o xəbər*

Gah oxurdu kitabları xoş səslə,
Gah da əsər yazardı min həvəslə.

Neçə saat belə məşğul olaraq,
Sonra etdi başqa işə o maraq.



Gəlib tapdı onu neçə həmdəmi,
Söhbətinin vardı başqa aləmi,

Kətxudaya, xəlqə o xoş niyyətlə,
Çox xeyirli sözlər dedi hörmətlə,

Qoydu işi öz yoluna əlbəəl,
Hər kəsə o verdi dəsturul-əməl

Bir az sonra məhsulundan alaraq,
Məclis qurdu, süfrə açdı bir sayaq,

Ki, üstündə görünmədi heç nöqsan,
Neçə nəfər yeyib doydu firavan,

O yeməkdən sonra neçə saət də,
İstirahət eylədi bir xəlvətdə,

Axşam üstü çıxdı o bağ seyrinə,
Dincəlməkçin, yüngül ayaq seyrinə,

Nəzər saldı güllərin xoş üzünə,
Qüvvət gəldi beyninə və gözünə.

Bağbanına göstərişlər verərək,
Dedi: "Gəl bu ağacı sən belə ək",

Sonra da gah süvari, gah piyada,
Məşğul oldu şikarla xoş havada.

Gecə oldu qayıdaraq evinə,
Dağdan enib, evə çatdı o yenə.

Arvadıyla söhbət etdi könlü şad,
Həyatından razı qaldı, şən, azad.

Onun gözəl həyatını görəndə,
Pərişanlıq saldı məni kəməndə.

Sual etdim xəyalımdan həmin vaxt,
"Kimdir azad ömür sürən bu xoşbəxt?"

Müyəssərdir ona bütün diləyi,
Canı sağlam, kədərsizdir ürəyi.

Paxıllığım tutdu, necə tək adam,
Toplamış din, dünya zövqün belə tam.

Mənsə oldum kami-dilçin dərbədər,
Gəzməkdəyəm bu dünyanı sərbəsər.

Mən fələyə deməyimmi biaman,
Mən nakamam, olsa belə kamiran.

Xəyal gülüb dedi: "Anla, ey qafil!
Paxıllığın özünədir yaxşı bil!

Heyrət etmə cəhalətlə sən buna,
İp bağlamış nəfsin bil öz boynuna*.

Pislik edən pislik görər, bu bişək,
Buna nə xalq müqəssirdir, nə fələk,

Cəsarətlə bu qorxunu gəl burax,
Gözünü aç, bir özünə yaxşı bax.

Bu gözəl kənd, bu bina, bu nazlı yar,
Səninkidir, cəhaləti et kənar.

Bu ki, sənsən, bu da sənin həyatın,
Bunlar sənin öz halın, öz büsatın.

Bir bax, hər şey burda hazır, sən uzaq,
Sənin könlün öz nəfsinə uyaraq,

Səadəti verib burda əlindən,S
Axtarırsan, uzaqlarda onu sən.

Bir əhd etdim xəyalımla bu axşam,
Bu səfərdən əgər mən sağ qayıtsam,



O guşədə sakit qərar tutaraq,
Yaşayaram qovğalardan mən uzaq.

Qalan ömrü keçirərəm firavan,
Şükr edirəm Allahıma hər zaman.

Qüdsi, xoşdur Əmsar adlı məskənin,
Şəhərlərdən çox üstündür öz kəndin.

## FİRƏNG MƏCLİSİ

Ziyafətdə bir gecə oturmuşdu bir cavan,
Eşqin məngənəsində gördüm onu xəstəcan.

Sakit qalıb dinmirdi, danışıqdan qaçırdı,
Lakin onun sirrini göz yaşları açırdı.

Dedim ki, ey zavallı, nədir səndə bu əhval,
Yatmışsanmı, ya səni aparmışdır bir xəyal?

Dedi: "Görmürsənmi ki, ap-ayıqdır gözlərim,
Sanki girdaba düşmüş bir qayıqdır gözlərim.

Belə vəziyyətdə heç xəyala dalmaq olar?
Unutmuşam özümü, qalmamışdır ixtiyar".

Eşitdikdə bu sözü əhvalına yandım mən,
Ürəyimin atəşi alovlandı təzədən.

Düşdü mənim yadıma gənclik illəri haman,
Ki, bir yarın zülfünə bənd olmuşdum o zaman.

Vermiş idim könlümü bir insafsız dilbərə,
Unutmuşdum dünyanı, cəmiyyəti bir kərə.

Baxdım yazıq cavana mən də yazıq baxışla,
Şəkiltək səssiz qaldıq, sonra dedim: "Bağışla!"

Toxundumsa qəlbinə qəbul et üzrümü gəl,
Barı, ürək dərdini mənə söylə müfəssəl.

Axı mən də sənin tək aşiq idim bir zaman,
Dərd əhliyəm, çəkinmə, macəranı et bəyan.

Sənə kömək eyləmək gəlməsə də əlimdən,
Heç olmasa qəminə bir şərik olaram mən".

Dedi: "Əsla etmərəm öz sirrimi aşikar,
Heç kim mənim dərdimdən olmamalı xəbərdar.

Sirri gizli tutmağı tələb edir məhəbbət,
Ticarətdə xoş olar çənə-boğaz, söz-söhbət.

Sevgilimi hər kəsə necə tərif edim mən?
Rəqibimdir bəlkə də sözlərimi dinləyən".

Sonra dözməyib dedi: "Yoxdur onun naziri,
Kim o yarı görərsə dərhal olar əsiri.

Dil biləndir, gözəldir, mələk kimi canandır,
Şux gözləri süzərkən, işvəsi can alandır".

Dedim: "Mənə söyləmə lətafəti necədir,
De insafı, əxlaqı, ləyaqəti necədir".

Dedi: üzü kimidir davranışı, ədası,
Heyran qoyur insanı onun gözəl sədası.

Əgər nöqsan varsa da yarımda aydın, açıq,
Mən ki, görə bilmirəm o nöqsanı azacıq".

İnsafını soruşdum, dedi: "Onu bilmirəm,
Xasiyyəti mənə də qalmışdır hələ mübhəm.

Mənə nə lütf edibdir, nə göstəribdir cəfa,
Mənə nə vədə vermiş, nə vədə etmiş vəfa.



Nədən bilim o gözəl zalımdır, ya mehriban,
Hələ yaxın görüşə olmamışdır bir imkan.

Ürəyindən bu qədər xəbərim var, o dilbər,
Məni görən zamanda üzümə salmaz nəzər.

Neçə gün bundan qabaq qonaqdım bir evdə mən
Yığılmışdı oraya bir çox sevən, sevilən.

Hər eşqbaz dolanır bir güləndam başına,
Necə ki, pərvanələr dolanar şam başına.

Hamısı rəqs edərək oxuyub şadlanardı,
Bəd nəzərdən iraq, bu məclisdə şənlik vardı.

Biri açıb eşqini edirdi bir-bir bəyan,
Gizli işvə edərək nazlanırdı o canan.

Hər cür söhbət gedirdi eşqin hərarətindən,
Ən çox xumar göz ilə, zülfün lətafətindən.

Mən ki, eşqə nabələd, xam bir yeniyetməyəm?
Deyirdim bəs nə üçün mən arzuma yetməyəm?

Gözlərinə bir qızın deyirdim ruh çalandır,
Yox, yox onun saçları daha çox can alandır.

Bəh-bəh, bunun yanağı qızılgültək necə al,
Xoşdur deyən o birin dodağında qara xal.

Qəlbim hərdən cürbəcür fikirlərə dalırdı,
Hər an halım dolanır, başqa bir rəng alırdı.

Özüm də heç bilmirdim baxım hansı tərəfə,
Bağlayım öz qəlbimi hansı pəri surətə.

Bu arada gözləri xumarlanmış bir gözəl,
Kirpiyilə oxladı ürəyimi əlbəəl.

İldırım tək nəzəri çaxdı üzərimə düz,
Varlığımı yandırdı o atəşsiz, tüstüsüz.

O dünya gözəlləri, canlar alan cananlar,
Ürəkləri ovlayan xumar gözlü ceyranlar.

Cümlə bir an içində silindi gözlərimdən,
Necə ulduz yox olar günəş tulu edərkən.

Elə sərxoş eylədi bu badənin buxarı,
Fərq etmədi mənə nə aşağı, nə yuxarı,

Mən məclisi unutdum, tam itirdim özümü,
Bircə onun üzünə zilləmişdim gözümü.

Yenə dəqiq baxmaqla görmədim o camalı,
Tək, başına gələnlər başa düşər bu halı.

Kim günəşə baxarsa gözləri tez qamaşar,
Onu yaxşı görmədən bəbəkləri oynaşar.

Bir də gördüm o dilbər qəzəbləndi nagahan,
Camalını bir hiddət buludu aldı haman.

Qızışdı ol nazənin, dəyişdi gül siması,
Sanki atəş üstündə göründü su damlası,

Lalə kim qızardı camalı öz-özünə,
Jalə kim düzüldü tər damlası üzünə.

Bu hiddəti görüncə o gözəl simada mən,
Heyranlıq yuxusundan ayıldım sanki birdən.

Sezdim ki, baxır bizə kənardan bir bədnəzər,
Buna görə sən demə hiddətlənmiş o dilbər.

Sonra, heç olsun deyə rəqiblərin töhməti,
O bir hiylə işlədib pozdu bu vəziyyəti.



Arvad min hiylə qurar qısa zaman içində,
Hər nə könlü istəsə çatar bir an içində

Arvad dediyin məxluq hər bir işə qadirdir,
Ürəkləri çalmağa xüsusilə mahirdir.

Arvad mövcud olduqca eşqbazlıq qalacaq,
Aşiqini hər zaman dərdə, qəmə salacaq.

Xülasə... hiddətlənib canan qalxdı yerindən,
Bir ayna qarşısında gedib oturdu həmən.

Təsadüfən tuş idi aynaya mənim üzüm,
Camalını orda da buraxmayırdı gözüm.

Bəh-bəh, necə deyim ki, gülərək yavaş-yavaş,
Necə burdu saçını, göz vurdu, oynatdı qaş,

Sonra nazü qəmzəylə o can alan nazənin,
Musiqilə bir nəğmə başladı həzin-həzin.

Pəsdən elə oxudu ruh uçdu təsirilə,
Gözlə qulaq girdilər bəhsə biri-birilə.

Sonra rəqsə başladı qonaqlığa gələnlər,
Başqa bəla üz verdi qəlbimizə müxtəsər.

Hərə bir nazəninlə, mən də o xoş nəfəslə,
Hərləndik ortalıqda min bir şövqü həvəslə,

Fürsəti fövt etmədim, zəiflərkən rəftarı,
Möhkəm qucub belini çəkdim özümə sarı.

Ovcumdakı əlini yavaş-yavaş sıxaraq,
Baxdım onun gözünə məftun aşiqlər sayaq.

Nəzərimə düşəndə o dilbərin nəzəri,
Göründü al üzündə eşqü sevda əsəri.

Asta-asta girişdik pıçıltıyla söhbətə,
Yavaş-yavaş yetirdik söhbəti məhəbbətə.

Əl çatmadı mətləbə, gecə keçib gec oldu,
Arzuları qəlbimin açılmadan tez soldu.

Şərh olmadı istəyim, lənət dedim baisə,
Bu söhbətin mabədi qaldı başqa məclisə,

O getdi, mən qayıtdım evə suyu süzülmüş,
Gözü yaşlı, qəlbi qan, dodaqları büzülmüş.

Çəkilmədi gözümdən bütün gecə xəyalı,
Məni heyran qoymuşdu onun günəş camalı.

Oyaqlıqda, yuxuda o idi tək amalım,
Ancaq onun haqqında düşünürdü xəyalım,

Səhər durub hər yeri dolandım neçə saat,
O cananın evindən xəbər tutdum nəhayət.

Ancaq indi öyrəndim nədir onda nişanə,
Onu görmək qəsdilə axtardım bir bəhanə.

Öyrəndim ki, özündən çox qoca bir əri var,
Zəncir olub, zülfü tək kərdəninə dolanar.

Bir məsəl var deyirlər hər işdə var bir müşkül
Xəznə olmaz ilansız, tikansız da qızılgül.

Bu yolda mən çalışdım qurum incə bir hiylə,
Axtardım çıxış yolu mətləb üçün vəsilə.

Bir az sonra yetişdi bayram – istədiyim gün
Şəhər əhli toplaşıb çölə çıxdı büsbütün.

Hərə bir nazəninlə vermiş idi baş-başa,
Həqiqətdə əcəbdi bu misilsiz tamaşa.



Mən də bu vurhavurda deyirdim kaş o afət,
Gəlib yazıq aşiqə verəydi bir səadət.

Görünmürdü gözümə nə bayram, nə izdiham,
Dörd gözlə dolanırdım, tutmurdu qəlbim aram.

Gördüm çətirlə durmuş bir guşədə nagahan,
Ay üzlü o nazənin, şirin dilli o canan.

Ürəyim əmr edirdi, get yaxınlaş, qorxma sən
Lakin qorxum çox idi, vüsalına ümiddən.

– Bəlkə biri çıxaraq saldı qovğa, cədəli,
Dedi kimsən, haradan tanırsan bu gözəli?

Huşyar olmaq gərəkdir hər əməldə, hər işdə,
Götür-qoy zərər verməz hər hünərli gedişdə.

Lakin eşq olan yerdə ağıl olar əfsanə,
Ağıllıya deyərlər onda dəli, divanə.

Cumdum onun yanına heç bir şey düşünmədən,
Salam verib dil tökdüm, söz açdım həvəslə mən,

Yadındamı, soruşdum o məclisdə, o zaman,
Ki, yamanca rəqs etdi filan qız, filan oğlan.

Yadındamı oxudu xoş səs ilə bir nəfər,
Otaq yaman dar idi, adam çoxdu... müxtəsər,

Bu sözləri aramsız yağdırırdım ki, birdən,
Qonşu evdən ər çıxdı, sanki girdim yerə mən.

Dedi: filan evə biz indi qonaq gedirik,
Tələs, yubanma, tez ol, yamanca gecikirik.

Baxa-baxa gözlərim verdi onlar qol-qola,
Şadlığımı puç edib tezcə düşdülər yola.

Yazıq ağlım yenə də oldu yerində çaşbaş,
Ürəyimdən od çıxdı, gözlərimdən axdı yaş.

Bir az keçdi, heyranlıq dəmindən oldum aram,
Birdən düşdü yadıma o evlə mən də dostam.

Oraya mən də gedib bir küncdə əyləşərəm,
Bəlkə yenə o yarı görüb him-cimləşərəm.

Gedib, bəh-bəh, nə gördüm, qurulmuş xoş ziyafət,
Orada qadın, kişi toplanıb var qiyamət.

Qulaqları kar edir ərğənun və saz səsi,
Hər kəsin bir şüğli var, hər kəsin bir peşəsi.

Bir neçəsi rəqs edir aralıqda şadiman,
Başqaları həvəslə varaq çəkir durmadan.

Başqası bir cananı çəkibdir bir xəlvətə,
Hər şeyi unudaraq qızışmışdır söhbətə.

Ev sahibi görüncə məni gülüb oldu şad,
Razılıqlar eyləyib, göstərdi çox iltifat.

Sonra ondan ayrılıb yarı gəzdim biqərar,
Gördüm ki, tək oturub bir guşədə o nigar.

Anladım ki, dalğındır, pərtdir o nazikbədən,
Ehtiyatlı addımla yaxınlaşdım ona mən.

Əri bir az kənarda qızışmışdı qumara,
Əhəmiyyət vermirdi o gözləri xumara.

Gəlib durdum onunla qarşı-qarşı, üz-üzə
Yalvarışlı səsimlə belə başladım sözə:

"Ah, bu gecə nə gözəl, nə şadiman gecədir,
Gündüzdən də işıqlı bir kamiran gecədir.



Nə xöşbəxtəm bu gecə ki, önündə dururam,
Sənin şirin sözünlə dərdimi unuduram".

Dedi: "Mən də çox şadam, çox məmnunam ki, bu dəm,
Sənin kimi bir cənab, olmuşdur mənə həmdəm".

Bu cür yenə qızışdı aralıqda xoş söhbət,
Ehtiyatı unutdum qızışdıqda məhəbbət.

Dedim: "Axşamçağı mən bir məclisdə darıxdım,
Ancaq sənin eşqinlə gəlib buraya çıxdım.

Oradakı cananlar bir-birindən gözəldi,
Ki, hər biri dünyaya sanki bir bəla gəldi.

O pərilər içindən çıxıb gəldim bura mən,
Bəlkə yenə pay alım can bəxş edən ətrindən.

Ta oturum səninlə bir anlıq, ey məhliqa,
Bəlkə mənim dərdimə sən verəsən bir dəva".

Yumşaldı o dilbər, dedi: "Cana minnət var,
Kaş ki, belə məhəbbət daim olsun payidar.

Kaş ki, aşiq eşqinə göstərəydi sədaqət,
Ürəyi qızdıraydı həmişə bu məhəbbət".

Mövqeyi xoş görüncə söhbət açdım ərindən,
Evindən xəbər aldım ki, öyrənim dərindən.

İstədim bəlkə məni dəvət etsin evinə,
Tənha bir gün mənimlə xəlvət getsin evinə.

Mənə könül verirdi bic-bic gülürdü amma,
Təklifsiz danışırdı hər sözündə müəmma.

Artdı qəmim, kədərim, söndü ümidim yenə,
Elə bil asimandan düşdüm yerin dibinə.

Qəlbimə hücum etdi yenə min dərd, min sual,
Hər sual min xəyaldı, hər xəyal min ehtimal,

Düşdüm bu eşqə, söylə, bu dərdə nə əlac var?
Nədir bu afətdə bəs belə qəribə hallar?

Gah qıyqacı baxmaqla alır mənim canımı,
Gah etinasız qalıb tökür ürək qanımı.

Gah öz şirin sözüylə ümid verir, şad edir,
Gah ülfətdən çəkilib ümidi bərbad edir.

Əgər məni sevirsə, evə çağırmır nədən,
Görmürmü sevdasında məhv oluram belə mən?

Zahirdə söhbətilə vədə edir səadət,
Sonra da üz çevirir, gözəldə bu nə adət?

Gah deyirdim: "Səbr elə, mənə var hər nəzərdə,
Bica deyil bu işvə, bu dərmandır hər dərdə.

Səbəbsiz olmaz onun etdiyi hər bir əməl,
Belə şikayətləri öz bəxtindən etmə gəl!

Evə dəvət etməyir, axı onun əri var,
Bəlkə qorxur ərindən bu sevimli gülüzar?!"

Əqlim mənim hissimə verirdi min nəsihət,
Dedim özüm özümə: "bəsdir belə şikayət".

Rəqsə dəvət eylədim cəsarətlə nagahan,
Qəbul edib önümdə hazır dayandı canan.

Yenə tutub belindən, sıxdım özümə sarı,
Dolandırdım həvəslə ortaqda o nigarı.

Zənni çaşdırmaq üçün sonra da mən bir qədər,
Oynadım başqasıyla ki, çəkilsin bədnəzər.



Gecə yarı olanda məclis dağıldı birdən,
Hərəmiz bir tərəfə yola düşdük o yerdən.

Bu gecədən sonra mən tapmadım daha fürsət,
Ki, onunla yenə də görüşüb edim söhbət.

Çox zaman dolandım ki, ona tanış evlərdə,
Bəlkə təsadüf edim, yarla görüşüm bir də.

Küçələri dolandım, gəzdim bir-bir evləri,
Kölgə kimi ardına düşüb oldum sərsəri.

Qaldım işdən avara, dolandım divanə tək,
Daim boşa gedirdi sərf etdiyim hər əmək.

Axır bir gün eşitdim xəstədir o məhliqa,
Məclislərə gəlməyə imkanı yoxdur daha.

Belə dəhşətli xəbər çatınca sevgilimdən,
Səssiz yanan şam kimi şölə qalxdı dilimdən.

Ah çəkdim, nalə etdim oda düşdü şirin can,
Lalə kimi qəlbimə dağ basıldı, ah, aman.

Belə oldu neçə gün, gəzdim başı bəlalı,
Sonra xəbər tutdum ki, yaxşılaşmışdır halı.

Yenə doğdu üzümə günəşi ümidimin,
Yenə vüsal haqqında düşündüm şirin-şirin.

Yenə hara getdimsə xəyalıma o gəldi,
Gözlərimin önündə bir ay kimi yüksəldi.

Onun söhbətlərini salıb tez-tez yada mən,
Öz ömrümü verirdim bu sevdada bada mən.

Gətirdikcə nazını, qəmzəsini nəzərə,
Danlayırdım özümü hər saatda min kərə.

Deyirdim ki, ay axmaq, heç yoxunmu səbatın,
Neçin yara sən əsil mətləbini açmadın?!

Filan sözdən sonra sən filan sözü desəydin,
Məramını bilincə razı olardı yəqin.

Söz verdim əgər bir də yar görünsə gözümə,
Bütün istəklərimlə zinət verib sözümə,

Ona açıb deyərəm ürəyimdə nə ki, var.
Heç şeyi gizlətmədən açıq, aydın, aşikar.

Nə edim, eşqin budur öz qaydası, qanunu,
Qədim zamandan bəri, aşiqlər bilir bunu.

Hicrana düşən kimi bülbül kimi dil açar,
Min söz düzəldib yarın ünvanına od saçar.

Lakin vüsal çağında unudar hər sözünü,
Dili tamam tutular itirərək özünü.

Xülasə, mən sabahı gün çıxmadan oyandım,
Gedib yarın evinin ətrafında dolandım.

Gördüm evin divarı, qapısı, pəncərəsi,
Yarın günəş üzündən xəbər verir hərəsi.

Baxırdım hər tərəfə sanki röya içində,
Qəlbim təşvişlə dolu, başım sevda içində.

Birdən gördüm o dilbər gəlib keçdi önümdən,
Elə bil ömrüm keçdi, qocaldım bir anda mən.

Huşum getdi, yerimdə donub qaldım bir qədər,
Sanki röya görürdüm mən özümdən bixəbər.

Arzularım məhv oldu, puç olub getdi xəyal,
Qəlbim gəldi gözümə, dilim donub oldu lal.



O zalım yar deyəsən əhvalımı bilərək,
Gülüb baxdı üzümə, keçib getdi xəyal tək.

Baxışında var idi xoş ümidlər, vədələr,
Gülüşündən yağırdı istehzalar, şübhələr.

Mən biçarə yenə də qaldım vüsalə həsrət,
Öz istək və arzumdan yenə çəkdim xəcalət.

Gah düşündüm baxışı gəl dedi için-için,
Gülüşüsə rədd edib get söylədi, nə üçün?

Yoxsa mən yanılıram, bunlar bir bəşarətdi,
Vüsalinə dəvətçin bəlkə bir işarətdi!?

Gah deyirdim gülüş və baxış ilə o rəna,
Heç yazığı gəlmədi, etdi mənə istehza,

Guya dedi ki, səndən çıxmaz vəfalı aşiq,
Sənin kimi xamlara bu ad deyil müvafiq.

Belə üzlə necə sən mətləb deyib durursan?
Yardan qafil xəyalda min bir aləm qurursan.

İndi bax, belə keçir mənim günüm, əhvalım,
Getdikcə artan qəmlə, de, necə sakit qalım?

İndiyədək arizum, xəyalım bir görüşdü,
O vaxtdan ki, təsadüf bəxtimə belə düşdü.

Gördüm boşdur ümidim, xəyallarım məhaldır,
Bu eşqdə nəsibim sadə bir ehtimaldır.

Halım tamam pozuldu, qalmadı tabü təvan,
Vəslə ümid yox ikən əzir qəlbimi hicran.

Ölüm daha xoş olar belə həyatdan mənə,
Bax məhəbbət oduyla yanan cana, bədənə,

Ölüm də məndən qaçır, boşmuş ümidvarlığım,
Bir vəfasız yolunda məhv oldu bu varlığım".

Sözü bura çatanda hönkür-hönkür ağladı,
Onun bu yazıqlığı ürəyimi dağladı.

Susdu, dili tutuldu, gözləri süzülərək,
Düşüb qaldı duyğusuz divardakı şəkil tək.

Mənə dərin bir kədər üz verdi bu nağıldan,
Kədər nədir başqa bir aləm üz verdi haman.

Düşündüm: "Bu zavallı yazıq cavana bir bax,
Ömrünü sərf eyləmiş mənasız eşqə ancaq.

Sərxoşdur bir şövqilə, qəribədir onda qəm,
Onunçun boş görünür eşqində iki aləm.

O rahatdır yenə də, boş da olsa, eşqi var,
Mən isə avarəyəm, nə məhəbbət, nə də yar.

Nə bir yerdə qərarım tutur, dərdim bihesab,
Nə işim var, nə gücüm, nə də bitir iztirab".

Çox düşündüm daşındım bəlkə mən də birtəhər,
Bir yol tapım ki, məni dərd əzməsin bir qədər.

Çox axtardım ki, bir iş məşğul eləsin məni,
Unudum bəlkə bir az bu qəmi, bu qüssəni.

Özümü unutmağa tapdım bircə çarə var,
Xilas edər bu dərddən məni ancaq eşqi-yar.

Axtardım bir ilqarlı, sədaqətli nigarı,
Bəlkə qəlbim dincələ, baxam bir yara barı.

Dedilər: "Eşq dərmandır hər bir dərdə, anla sən,
Eşqə düşən dünyada qurtarar hər fitnədən".



Düşündüm ki, bu yerdə gözəl pərilər çoxdur,
Onları tapmaqda da heç bir çətinlik yoxdur.

Gözəl dolu küçə, bağ, naz, qəmzəli mehriban,
Baxa-baxa qalırsan hüsnə, camala heyran.

Allah-Allah, nə gözəl ruhaçan yerdir bu yer,
Ürəklə göz bu yerdə rahatlanıb dincələr.

Desəm ki, bir gülzardır çiçək açmış burada,
Nisbəti yox, çünki çox təfavüt var arada.

Çünki bahar zamanı çiçəklənir gülüstan,
Bura isə gözəldir hər fəsildə, hər zaman.

Desəm bura müqəddəs, əcaib bütxanədir,
Belə xəta hökmlər yersiz bir əfsanədir.

Bütlər axı durğundur, hərəkətsiz şəkildir,
Bu bütlərsə can verib can almağa qabildir.

Desəm ki, Çin vadisi kimi ruhu çalandır,
Nisbəti yox, çünki bu mənasızdır, yalandır.

Bir tayfadan ibarət deyildir bu xoş diyar,
Bu səfalı ölkədə axı, bir çox tayfa var.

Bu ölkədə yaşar çex, rus, alman, rum, firəngli,
Hər birinin paltarı bir çeşidli, bir rəngli.

Xumar gözlü ceyrandır, hərəsi bir nəsildən,
Ovlamaqçın ovçunu gəzirlər üzləri şən.

Yırtıcı vəhşiləri edirlər bir anda ram,
Qan içən aslanları tora salarlar müdam,

Xülasə, çox düşünüb, daşındım mən, nəhayət,
Yüz xəyal, yüz ümidlə tutdum qəlbimdə niyyət.

Ürək narahat oldu yenə etdim ahü vah
Qəlbim bir Müştəriydi, qarşısında Mehrü Mah*.

Hərdəm bir xumar gözlü atırdı sinəmə tir,
Qəlbimin ayağına zülfü olurdu zəncir.

Gah bir gözəl nazilə eşqə işıq saçırdı,
Gəzib niyaz əlini, ürəyini açırdı.

Bir başqası oxurdu məhəbbət təranəsi,
Eşqi qızışdırırdı onun odlu nəğməsi.

Mən heyrətdə qalmışdım, kimə verim qəlbimi,
Nə edim, sevmək üçün intixab edim kimi?

Yar hesabsız dövrəmdə, mənimsə bir qəlbim var,
İşim çoxdur, vaxtım az, indi nə etmək olar?!

Düçar oldu ürəyim bir gözələ nəhayət,
Verdim ona könlümü, dedim tapdım səadət.

Lakin bərk yanılmışdım, az keçməmişdi ki, mən
Anladım hər bir işi onun hərəkətindən.

Ardına düşüb bir çox eşqbaz pəhlivanlar,
O da sevir hər kəsi yoxdur ona etibar.

Sən demə, mən də onun aşnasından biriyəm,
Vüsal üçün ardına düşüb bir pay diləyəm.

İxtiyarım yoxdur ki, edim ondan şikayət,
Əğyar ilə görüş də onlara olmuş adət.

Mən çox razı qalaram yarım cəfa etməsə,
Lakin eybi yox imiş əhdə vəfa etməsə.

Mən də guya hər kəsə meyl eləsəm yeri var,
Hər ikimiz bu işə verməliydik ixtiyar.



Nə o, nə mən deyilik bir-birinə bivəfa,
Bu bir adi şey imiş saxlasaydıq aşina.

O da gəzir özüyçün, sən də gəzib kef elə,
Ona da belə xoşdur, sənə də xoşdur belə.

Səndən yaxşı tapınca etibarı unudar,
Yaxşısını tapdımı, çıxdı əlindən o yar.

Vəfanı bilən təmiz, saf ürəkli yar hanı?
Ki, ona qurban edim dərdə düşmüş bu canı!

Huri kimi bəzənmiş bu gördüyüm gözəllər,
Yolkəsəndir quldurdu, biri birindən betər.

Bir zavallı bilmədən ürək versə onlara,
Tora düşmüş ov kimi, qəlbinə dəyər yara.

Ov yaxşıdır, səhv etdim, bəzən ov qalar rahət,
Düşdüyü tor içində edər gah istirahət.

Lakin belə pərivəş, şeytan ürəkli dilbər,
Yaxşını da, pisi də bir anda məhv eyləyər.

Onlar eşqi bənzədir mənasız bir həvəsə,
Qarğa ilə bülbülü salırlar bir qəfəsə.

İndi ki, belə oldu qınamayın siz məni,
Nə üçün mən dost tutum həyatıma düşməni?

Nə yaxşıdır qoy mən də eşq, sevda duymadan,
Ürəyimi vermədən hər gün tapım bir canan.

O cavan yazıq idi ümid edib murada,
Hiyləyə aldanaraq ömrünü verdi bada.

Neçin məni onun tək məhv eləsin boş xəyal,
Neçin yarı görəndə, dil tutulsun, olum lal.

Heç olmasa bəlalı, işgəncəli bu anda,
Bir rahatlıq arayım vəfalı bir cananda.

Hanı o dilbər, hanı, eşqimə olsun layiq,
O mənə tam vəfalı, mən də o yarə sadiq?!

Aman, vermə qəlbini o cəfakar dildara,
Ki, əri ola-ola gözləri yar axtara.

Aşna tapan tək yenə onu ata gülərək,
Bir başqa yar axtarıb, qura ona min kələk.

Arxasınca gəzdirə aşiqləri qədərsiz,
Qoya o yazıqları bir-birindən xəbərsiz.

Bu cür gözəl görünən cananda olmaz vəfa,
Onlar səni dərmansız dərdə edər mübtəla.

Bəsdir daha, ey Qüdsi, qurtar bu hekayəti,
Gözəllərdən çox etmə bu qədər şikayəti.

Gətirdim bu misalı bəlkə olsun bir örnək,
Məqsəd burda deyildi eşqə xələl gətirmək.

Eşqə ziyan yetirər, onu salar rövnəqdən,
Əgər hüsnü duymasan bütün təmizliklə sən.

Həqiqət axtarana lazımdır möhkəm dəlil,
Haqqı rədd ya qəbulla anlamaq mümkün deyil.

Yaxşıya da, pisə də bir pərdə çəkilmişdir,
Özgəyə ayıb tutmaq özü də ayıb işdir.

Təsəvvürdə, təftişdə zənn etmə düz yoldasan,
Təkcə sən öz əqlinə arxalanma heç zaman.

Ağılla dərk edirik nöqsan cəhətləri biz,
Nöqsanını dərk edən ağıllıdır şübhəsiz.





## HİKMƏTİN FƏZİLƏTİ

Qədim bir kitabda verilmiş xəbər –
İranda bir həkim varmış mötəbər.

Ümidi yox ikən onun sabaha,
Belə bir sifariş göndərdi şaha:

"Onun üzüyünü böyük hökmdar,
Ən müdrik adama versin yadigar".

Şah bu vəsiyyəti icra edərkən,
Ehtiyat edirdi divanələrdən.

Çünki hər dövlətli, kasıb, hər gəda,
Özünü ən müdrik bilir dünyada.

Nəhayət hamını çağırtdırdı şah,
Onları mətləbdən eylədi agah.

Dedi: Üç suala istərəm cavab,
Kim daha düz desə olsun intixab.

Əvvəl – ən xeyirli nədir müxtəsər?
Tamahkar olanlar dedilər ki, – zər!

Vergi toplayanlar dedilər: xərac!
Tacirlər dedilər: alver və rəvac!

Şah dedi: Uzaqdır bunlar mətləbdən
Orada bir qoca durmuşdu, həmən.

Söylədi: hər şeydən xeyirli – hünər!
Hünərsiz heç bir şey olmaz müyəssər.

Şah qəbul eylədi, soruşdu yenə:
Dünyada hər şeydən yaxşı deyin, nə?

Yüksəldi müxtəlif səslər saraydan:
Şahın razılığı... şadlıq... firavan.

Yenə də o qoca dedi bu sözü:
Hər şeydən yaxşıdır, yaxşılıq özü.

Çünki yaxşı sifət olarsa səndə,
Afərin söyləyər dost da, düşmən də.

Şah dedi: Ən lazım nədir insana?
Yenə də çox fikir çıxdı meydana.

Şah isə qocaya edirdi diqqət,
Dedi: Ən lazımlı şeydir – həqiqət.

Həqiqət olmasa, olmaz intizam,
Dünya həqiqətlə dolanır müdam.

Şah qalxıb qocaya eylədi təzim,
Üzüyü hörmətlə eylədi təqdim.

Əmr etdi saraydan getməsin bir an,
Ki, alsın bu işdə məsləhət ondan.

Nəhayət oldu o şahın vəziri,
Ölkəni düzəltdi onun tədbiri.

Nə yaxşı olardı hər ölkədə ah,
Olaydı belə bir vəzir ilə şah.

Ey Qüdsi, hikmətdən varsa xəbərin,
Yaxşı adamlarda olsun nəzərin.



## HAQ SÖZ

Yadımda deyildir nə vaxt və kimdən,
Belə bir hekayət eşitmişəm mən:

Bir gənc padşahın bir yarı vardı,
Hüsndə dünyanı heyran qoyardı.

Pəri tək gözəldi o tamam-kamal,
Şirin danışardı o huri camal.

Saçından gözəllik alardı sünbül,
Üzünün odundan rəng alardı gül.

Bir gecə padişah eşitdi xəlvət,
Bir arvad o yara edirdi töhmət.

Deyirdi: "Nə oldun hüsnünə heyran?
Təkcə bir hüsnilə yaşamaz insan.

Camalın nəhayət heçə enəcək,
Qaş kimi dartılma, qıvrılma saç tək".

Gözəli bu tənə qızartdı, birdən –
Zülfü tək qıvrılıb cavab verdi: "Sən

Yersiz təhqir etmə hüsnü bu qədər,
O hansı dövlətdir hüsnə bərabər?

Bundan da böyük bir dəlil istərsən?
Ki, şah haqqın yerdə sayəsi ikən,

Onun fərmanına baxarkən cahan,
Özü də hüsndən almada fərman".

Söylədi o arvad: "Ey qafil gözəl,
Hüsnünlə bu qədər lovğalanma gəl.

Ölərəm can verərək olmasa canan qismət,
Verərəm canımı olsa mənə o can qismət.

Yədi-beyza və əsa göstərər hər sehrbaza,
Kimsəyə olsa bu cür zülfi-pərişan qismət*.

Əli boşluqda uçulmuş divarın qədrini bil,
Çünki olmaz sənə Keyvandakı eyvan qismət*.

Güldə gör əksin dilbər üzünün şadlıq elə,
Olmamışdan xəzana böylə gülüstan qismət.

Yuva tikməkdə olan bülbülə gül asta dedi:
Xoş olar olsa bu başlanğıca payan qismət.

Bax, ölümdən də betərdir bu vüsalsız yaşamaq,
Nə ömürdür ola daim ona hicran qismət?!

Yağıdan qorxmaz idim, Qüdsi, əgər dostum ola,
Tənədən qorxmaram heç olsa giriban qismət.





Ey könül, dövləti – fəqrinlə dolan bəsdir, bəs,
Nə qədər varsa əlində güzaran bəsdir, bəs.

Şah gədadan belə bir kuyi də çox əskikdir,
Bəndəlik et, diləmə şövkətü şan bəsdir, bəs.

Varsa fikrin olasan qeydi-bədəndən azad,
Başa çəksən gülərək rətli-gəran bəsdir, bəs.

Soldurub badi-xəzan gülşəni, güldən yox əsə
Sayə salsa başa ol sərvi-rəvan bəsdir, bəs.

Dutalım ki, səni öldürməyə qəsd eyləyir o,
Razı olsan ona tapşırmağa can bəsdir, bəs.

Bizdə zahid kimi gər olmasa da yüz ümmid,
Eləsə bircə nəzər, piri-müğan bəsdir, bəs.

Niyə söylərsən, a Qüdsi, hamıya qəmlərini,
Göz və qəlbin halına olsa nişan bəsdir, bəs.

Dünyada səltənət çox alçaq şeydir,
Sadə, şən yaşamaq ondan çox yeydir.

Şah qafil yaşasa xalqdan, dövlətdən,
Zövq alsa o ancaq eyşü işrətdən,

Cilovu versə o sən tək gözələ,
Dövlətin əsası verilər yelə.

Hasili boş olar, ölkəsi xarab,
Dünyada məşəqqət, üqbada əzab.

Dünya, din işinə baxarsa yəqin,
Düzələr ölkəsi, rövnəq tapar din,

Adına deyilər ədalətli şah,
Ona kömək edər hər işdə Allah.

Şahın vaxtı keçər qovğalarda tam,
Yediyi heç olar, yuxusu haram.

Belə şah gözəldən gözləməz fərman,
Heç onu görməyə tapmazsan imkan.

Əsl şah göstərib xalqa ədalət,
Kəndlidən daha çox çəkər əziyyət".

Bu sözü eşitcək cavan hökmdar,
Ürəyi titrəyib oldu biqərar,

Dili söz tutmadı, ciyəri yandı,
Bir zaman şəkiltək cansız dayandı.

Dedi öz-özünə: "Kişidir adın,
Sənə yol göstərir amma bu qadın".

Taxtından, tacından əl çəkdi sultan,
Qurtardı şahlığın ehtiyacından.



Ey Qüdsi, bu halda necə hikmət var,
Onunçun şahlıqdan keçdi hökmdar.

Utanıb bir ibrət almısan nədən,
Qırmırsan kölәlik zəncirini sən?

## ÜMİDİN BOŞA ÇIXMASI

İş bilən, ağıllı, qoca bir dehqan,
Bir gecə söylədi belə bir dastan:

Ki, Həsən adında bir kəndli vardı,
Bağbanlıq edərək rahat yaşardı,

Dünyanın qəmindən ürəyi azad,
Əkindən başqa şey eyləməzdi yad.

O, məhsul alardı, cüzi, bir qədər,
Xərcinə çatardı güclə, bir təhər.

Xeyirxah bir qərib Həsəni gördü,
Ona çox qəribə bir toxum verdi.

Həsən əkdi onu, çəkdi çox zəhmət,
Yetişdi bir neçə alma nəhayət.

Heç kəs belə alma görməmiş yəqin,
Onda ətri vardı gözəl güllərin.

Bir yanı qırmızı, sarı bir yanı,
Var idi fərəhdən, dərddən nişanı.

Aşiqlə məşuqdur guya bu sayaq.
Birləşib oturmuş qucaqlaşaraq.

Həsən çox dəyərli gördükdə barı,
Bilmədi nə etsin bu almaları.

Əqlinə gəlirdi onun min xəyal,
Gah dedi: "ver yesin qoy əhli-əyal".

Gah dedi: "gəl göndər dosta ərməğan,
Qalsınlar belə bir almaya heyran".

Gah da pul qazanmaq gəldi niyyətə,
Dedi ki, sataram baha qiymətə.

Axırda o gəldi belə qərara:
"Layiqdir bu alma hökmdarlara".

Qəlbini bəzədi min rəngli xəyal,
Sudakı köpük tək coşdu ehtimal.

Zənn etdi sevinər buna hökmdar,
Eləyər ölkədə onu bəxtiyar.

Belə xoş ümidlə, yüksək xəyalla,
Yönəldi şəhərə, gördü cəlalla

Şah çıxır səfərə, tələsik Həsən,
Şaha təqdim etdi almaları şən.

Şah fərman verdi o, sarayda qalsın,
Qayıdan zaman bir mükafat alsın.

Lakin xadimləri bədcinsdi tamam,
Həmişə avara, nəməkbəharam.

Nə xalq, nə də dövlət düşürdü yada,
Bir qızıl-gümüşdü məqsəd dünyada.

O uca qapıda çox alçaqdılar,
Xidmətdə daima zalim, cəfakar.

Belə alçaqların əlində ikən,
Gör necə bəlaya rast gəldi Həsən.



Saxlayıb müxtəlif evlərdə miskin,
Evindən saldılar onu didərgin.

Yorulub belə bir işdən nəhayət,
Zindana salaraq oldular rahət.

Həsən, o binəva, o yazıq Həsən,
Sonsuz əzab çəkdi, qəlbində şivən.

Gün keçdi, ay keçdi, gəldi hökmdar,
Həsənin halından olub xəbərdar.

Əmr etdi hüzura gəlsin o bağban,
Təəssüf eyləyib bu işə sultan.

Hökm etdi açsınlar ta xəzinəni,
Salsınlar oraya təkcə Həsəni.

Könlü nə istəsə götürsün dövlət,
Bəlkə yaddan çıxa çəkdiyi zillət.

Girdi xəzinəyə tək-tənha Həsən,
Heyrətə düşdü o bu xəzinədən.

Bircə şey alsaydı ömrünə bəsdi,
Lakin daş-qaşlardan tamahı kəsdi.

Götürdü iki şey ancaq oradan:
Biri balta idi, biri də Quran.

Bu xəbər çatdıqda şaha qaldı mat,
Çağırıb danladı, etdi iltifat.

Dedi: "Ey divanə, bu fürsət bir də,
Əlinə düşərmi sənin ömründə?

Sonralar bu işdən olsan peşiman,
Bir fayda gətirməz bu sənə, inan!

Fürsəti itirməz ağıllılar bil,
Qayıt xəzinəyə gözlərini sil!

Qiymətdə ən böyük bir cəvahir al,
Gedib öz dərdinin əlacına qal"!

Şaha təzim edib söylədi Həsən:
"Bunlardan özgə şey istəmirəm mən.

Baltayla kəsərəm ağacı əvvəl,
Ki, odur gətirən başıma əngəl.

Deyərəm and içsin nəslim Qurana,
Ümid bağlamasın heç bir sultana.

Nə arzu etmişdim, noldu nəhayət,
Qoy onlar halımdan alsınlar ibrət.

Kim razı qalmasa öz xoş halından.
Varına qənaət etməyən insan,

Tamahla, həsədlə yaşasa ancaq,
Şadlığı doyişib əzab olacaq".

Ey Qüdsi, sən də gəl bundan ibrət al,
Bu sonsuz arzunu bir hüduda sal.

Gəl etmə bu mənsəb, cəlala nəzər,
Kim çatdı arzuya sonuna qədər?!

Belə tamahkarlıq nəyə gərəkdir?
Səadət əlinə düşməyəcəkdir.

Özünə nə lazım bu zülmü sitəm,
Çox pay istəyənə ruzi olar kəm,

Qaç bu pozğunluqdan, canını qurtar,
Yaşamaq şəklində ölümdür bunlar.



Üzünə məcazi olan bu dastan,
Həqiqət qapısı açsın hər zaman.

Həsən bir ruh idi, ağac da xislət,
Qəribə bar verər üzə gülsə bəxt.

Sonra bu bar sənə məğrurluq verər,
Qəflət zindanına çəkib gətirər.

Yoxsulu sınayan xəznəni atsan,
Xislətin ağacı kəsilər asan.

Qurana and içsən, dilşad olarsan,
Qulluq həlqəsindən azad olarsan.

## QARI VƏ HARUN

Bağdadda bir qarı yaşardı küskün,
Taleyi ömürtək zavallı, düşkün.

Harun sarayına yaxın yaşardı*
Viranə qalan bir daxması vardı,

Saray genişlənib düzülən zaman,
Lazımdı sökülsün bu ev də, haman.

Qarıya nə qədər əvəz verdilər,
O dedi: "Daha çox qiymətə dəyər".

Daha on min qızıl verdilər azı,
Yenə də rədd edib, olmadı razı,

Hər yandan dedilər: "Dəlisən, nəsən,
Getmirsən bir uçuq boş viranədən".

Dedi: " Mən dəliyəm, bəs Harun niyə,
Belə çox pul verir bu viranəyə?"

Ey Qüdsi, dövlət bir pərdədir, inan,
Onunla örtülür cinayət, nöqsan.

Bir məsəl dedilər, dövlətə bağlı,
Harunun nöqsanı, qadının ağlı.

## KƏLƏKBAZLIQ

Misirdə bir nəfər Rinud kəndindən,
Gedib bir şəhərdə sərbəst gəzərkən,

Yolda düçar oldu ona bir cavan,
Ki, onun hüsnünə qaldı mat, heyran.

Gizlədib qəfəsdə o can quşunu,
Qorxusuz soruşdu kim olduğunu.

"Məhəmməd" – deyincə adını həmən,
Onu qucaqlayıb öpdü üzündən.

Cavan qəzəbləndi, hay-haray saldı,
Dərhal ətrafını əhali aldı.

Bir çoxu qəzəbdən qıyıb canına,
Çəkib apardılar şahın yanına.

Çığırdı qəzəblə padşah ona,
– "Nə üçün zülm etdin, – dedi, – cavana?"

Kəndli üzr istəyib dedi: "Şəhriyar!
Bu işi tutmuşam lap biixtiyar.

Bilən tək adıdır onun Məhəmməd,
Huş getdi əlimdən qalmadı taqət.

Eşqin bilirsənmi xasiyyətini,
Məcnun öpmədimi Leyli itini?"



Əmr etdi padişah vermədən ara,
Bir nökər çağırdı üzü qapqara.

Surəti eybəcər, çirkin, müdhişdi,
Sanki cəhənnəmdən çıxıb gəlmişdi.

Şah dedi: "Məhəmməd adlanır bu da,
Öp görüm, aşiqsən əgər bu ada".

Rind dedi: "Ey dinin pənahi olan,
Sənsən bu dünyada adil hökmran.

Doğrudur, adlanır bu da Məhəmməd,
Təkcə mən deyiləm burada ümmət.

Qoy onu başqası öpsün bu anda,
Ta ki, feyz aparsın bir müsəlman da".

* *
*

Nə xoşdur aman, bu gözəl macəra,
Bənzəyir bizdəki hala, rəftara.

Bizə nə xoş gəlsə, biz də o saət,
Adına deyərik təqva, ibadət.

Qüdsi də belədir, yeri gələndə,
Deyir ki, itaət edirəm mən də.

## DUA VƏ TƏVƏKKÜL

Abbasilər dövləti hökmrandı,
Bu vaxt düşdü bərk quraqlıq Bağdadda.

Hərarətdən ürək yandı, dil yandı,
Susuzluqdan Dəclə gəldi fəryada*.

Qadın-kişi ağlayaraq bu zaman,
Biyabanda əl açdılar səmaya.

Yalvardılar. Etdikləri ah-aman,
Heç bir təsir göstərmədi xudaya.

Bu maraqlı əhvalatı görərək,
Məcnunnüma Bəhlul bir dəm açdı dil*.

Söylədi ki, sərf etməyin boş əmək,
Ey avamlar, bu yalvarış düz deyil.

Nə çıxar bu yersiz ahü nalədən,
Bu nə dua axı, bu nə həyəcandır?

Dərdə əlac yolu deyil bu şivən,
Bizə gizli şey – Allaha əyandır.

Biz bağlarkən qapımızı gecələr,
Açar niyaz qapısını yaradan.

Gecə xəlvət tapar hər sahibnəzər,
Çətin dərdə gecədir ən xoş dərman.

Gecə sakit, kəsiləndə səs, səda,
Təsir edər dualar bil, daha da.

Gecə hisslər açıqdır tamam, kamal,
Haqq demişdir: "Gecələri olma lal".

İnandılar, toplaşdılar sərasər,
Məcnunnüma Bəhlul ilə bərabər.

Üz qoydular səhraya gecə yarı,
Bağ yanından düşdü bu dəm yolları.

Bəhlul döydü o qapını nagahan,
Ta ki çölə çıxdı təlaşla bağban.



Dedi: "Nədir bu vaxt belə iztirab?"
Bəhlul isə verdi ona tez cavab:

"Nə yatmısan qəflətdə ey filani,
Durub bağa sən bir az su versənə".

Bağban dedi: "Ey aləmin nadani,
Sənə əbəs demədilər divanə.

Bu nə yersiz təklifdir, məni gecə,
Hay-küy salıb qaldırırsan ayağa?!

Bağban özü yaxşı bilir ki, necə,
Nə zamanda su verəcək o bağa".

Bəhlul baxıb camaata məstanə,
Dedi ki, ey ağıldan dəm vuranlar,

Kimdir deyin indi dəli, divanə,
Bu işlərdən etmək lazım sizə ar.

Bu bağbandan ibrət alın, de məgər,
Allah bilmir işini bağban qədər?!

Ey Qüdsi, bax biz əcəb biçarəyik,
Dünyadan və dindən də avarəyik.

Nə təvəkkül bacarırıq dünyada,
Nə də ağıl gəlir bizə imdada.

## AVAMIN NÖQSAN AXTARMASI

Eşitdinmi, bir kişi öz oğlu ilə bahəm,
Eşşəyinə minərək gedirdi yolu biğəm.

Hər kim onu görürdü, edirdi çoxlu töhmət,
Rişxənd ilə gülürdü, tənəsə binəhayət,

Utanmayır yaşından, – deyirdi – bir buna bax,
Özü minib eşşəyə, piyada gedir uşaq.

Kişi xəcalət çəkib öz-özünə deyindi,
Tez oğluna söylədi: "Min eşşəyə sən indi".

Töhmətlə söylədilər görüncə başqaları:
"Qoca gedir piyada, cavan isə süvari".

Tez atıldı kişi də yenə eşşəyə mindi,
Başqa biri onları belə görüncə dindi:

Dedi – "Bəh, yazıq eşşək necə gətirsin davam,
Zülmdür bir eşşəyə minərsə iki adam".

Hər ikisi düşdülər, piyada yol getdilər,
Yenə görənlər gülüb çox istehza etdilər.

"Nə axmaqdır, – dedilər – bu kişi, bir buna bax,
Eşşək boş qala-qala piyada gedir uşaq".

Kişi gördü qalmamış əldə başqa imkanı,
Buraxdı eşşəyini, təki qurtarsın canı.

*Yenə xalq əl çəkmədi, başladılar töhmətə,*
Dedilər: "Bir baxınız axmaq bifərasətə.

Bu cür gözəl eşşəyi müftə verirlər bada,
Nə qəribə axmaqlar var imiş bu dünyada".

Qoca nə eylədisə lağ etdilər hey ona,
Axırda təngə gəlib söylədi öz oğluna:

"Bu eşşək əcəb bizi qalmaqala salıbdır,
Töhmətdən qurtarmağa bircə çarə qalıbdır.

Eşşəyin qol-qıçını möhkəmcə bağlayaraq,
Mindirib dalımıza gülə-gülə aparaq.



Gəl mənfəət güdmədən edək bunu imtahan,
Xalqın acı dilindən qurtaraydıq bəlkə can".

* *
*

Ey Qüdsi, sən ibrət al bu kişidən ayıq ol,
Xalqın tənələrindən qurtarmaqçın, sayıq ol.

Onlar, nə etsin, yenə tapacaqlar bəhanə,
Edəcəklər səni bil oxlarına nişanə.

Qulaq assan tənəyə, ya da yersiz mədhə sən,
Elə bil ki, dalına bir eşşək mindirmisən.

## XEYİRLİ İŞİN FAYDASI

Bir qocanı gördü cavan bir əmir,
Ki, bağında zəhmət çəkib qoz əkir.

Gülüb dedi: "Ey zavallı biləsən,
Dərd qalacaq sənə bunca zəhmətdən.

Başqa ömür lazımdır ki, bu ağac,
Meyvə verib, dərdinə olsun əlac?".

Qoca dedi: "Eyşöhrətli hökmdar,
Başqaları əkdi, yedik, nə olar?

İndi də biz zəhmət qəbul edərək,
Nəsillərçin qoz ağacı becərək.

Yaxşılığın budur rəsmi dünyada,
Yaxşılıq et, səni salsın el yada".

Əmir onun sözlərini xoşladı,
Neçə dinar çıxarıb bağışladı.

Qoca dedi: "Çoxu əkdi və illər
Gözlədi ki, əkdiyi versin səmər.

Mən əkirdim başqalarçın, güldü baxt,
Məhsul aldım zəhmətimdən əkən vaxt.

El üçün kim girişərsə bir işə,
Özü dəxi xeyir görər həmişə".

Qüdsi, bu boş sözlərin nə xeyri var,
Dediyini işdə eylə aşikar.

## MƏŞVƏRƏTİN ŞƏRTLƏRİ

Mənə gülşəninin ustadı yenə,
Belə güllər səpdi öz gülşəninə:

Bir zaman Şirvanda bir əmir vardı
Zahiri, batini xoş hökmdardı.

Vücudi əzizdi, hümməti yüksək,
Lakin xudpəsənddi, hər zaman gərək,

Hər işdə sarayda olan adamlar,
Onun dediyini edəydi təkrar.

Əksinə çıxmazdı onun bir insan,
Getdikcə qalırdı ağlına heyran.

Məsləhət zamanı bir şəxsi-fazil,
Əmirin sözünü eyləyib batil,

Dedi: "Həqiqəti danmayınız bir,
O iş başqa cürdür, belə deyildir".

Əmir çox söylədi, o eşitdi az,
Dedi ki, düz sözü rədd etmək olmaz.



Nəhayət, qızışıb qışqırdı əmir:
"Ədəbsiz, nə hədlə elədin təhqir?

Unutdun ki, mənəm burda hökmran,
İcra olmalıdır verdiyim fərman!"

O fazil əmirə cavab verərək,
Söylədi: "Hər şeydə bir düzlük gərək.

Danışma, heç bir şey görmə – əmr etsən,
Susaram, yumaram gözlərimi mən.

Əmr etsən anlama! Əfv et, hökmdar,
Bu işdə əlimdə deyil ixtiyar"*.

Əmir dediyindən oldu peşiman,
Sonra dedikləri vermədi ziyan:

Düzlükdən qüdrətli bir bövlət yoxdur,
Ey Qüdsi, düzlükdə səadət çoxdur.

Düz iş yoxlanarsa nə qorxusu var,
Düşmən də düz işi eyləməz inkar.

Deyək heç yoxlayış olmayacaqdır,
Düzlük özü qəlbə möhkəm dayaqdır.

## MƏLAMƏT ƏLAMƏTİ

Çox gözəl hekayət yadıma düşdü,
Ya da bir şikayət yadıma düşdü.

Bir fəqir gələrək yüz ahü zara,
Şikayət edərək bir hökmdara.

Dedi ki, bu kənddə var bir bostanım,
Onunla dolanır bil, xanimanım.

Qonşunun camışı girib bostana,
Onu ayaqlayıb edib virana.

Hakimsə danlayıb yazıq kişini,
Dedi: "Sən tutaydın möhkəm işini.

Bir hasar çəkmədin bostana nədən?
Tikanla örtmədin hasarını sən".

Dedi ki, camışa bunlar nə edər,
Hasar, tikan ona edərmi əsər?

Dırnağı, buynuzu möhkəmdir onun,
Zoru çox, şüuru çox kəmdir onun.

Dağıdır önünə nə çıxsa haman,
Özünə yol açar bu qanmaz heyvan.

Qüdsi, heyrətdəyəm ki, hər bişüur,
Hər şeydə işlədir qanmazlıqla zur.

Soxulur önünə çıxsa ev, bostan,
Tapdayıb eyləyir yer ilə yeksan.

Dindirsən deyir ki, qorxan deyiləm,
Yəni ki, camışam, insan deyiləm.

## SƏLAMƏTLİYİN QƏDRİ

Səbəbsiz həkimi vurdu bir hakim,
Həkimsə eylədi şükrilə təzim.

Soruşdum: "Təşəkkür yersiz olarmı?"
Söylədi: "Bundan çox yaxşılıq varmı?

Ki, bu güc, bu idrak sahibi əlan,
Verə də bilərkən qətlimə fərman.



Vurmaqla göstərdi mənə iltifat,
Deməli o mənə bəxş etdi həyat".

Döz Qüdsi, üz versə nə cürə zillət
Çünki var ondan da betər əziyyət.

## SAĞLAM İKƏN MÜALİCƏ

Deyirlər xəyala uyan bir adam,
Xam ikən püxtəyəm deyərdi müdam.

Düşündü: "Səbəbi nədir səhhətin?"
Tapdı: – lüzumudur bu təbiətin.

Hər bir xəstəliyin bir səbəbi var,
İllətsiz xəstəlik olmaz aşikar.

Altı şey vücuda çox lazımdır bil,
Dörd şey də eləyir mərəzi təhlil*.

Bu şeylər birləşsə bir yerdə yəqin,
Pozulmaz heç zaman halı səhhətin.

Deməli, mərəzdən kim görsə bəla,
Etmiş öz-özünü dərdə mübtəla.

Ağıllı, xəstəlik hələ gəlməmiş,
Çalışar vaxtında görülsün hər iş.

Elə ki, hüdudu aşdı bir ixlat,
Bədəndə törəyər xəstəlik, fəsad.

Vücudun səhhəti pozulub gedər,
Yüz illət bədəni sərnigun edər.

Sağlamkən gərəkdir edəsən əlac,
Ki, vücud olmasın dəvaya möhtac.

Xülasə, bir mərəz tapdı nəhayət,
Tapdı sonra ona neçə əlamət.

Guya ki, mərəzin önünü aldı,
Özünü gör necə bəlaya saldı:

Əvvəlcə işlətmə içdi o dərhal,
Boşaltdı qarnını o tamam, kamal.

Yay idi yanırdı aləm istidən,
Əridi hərarət içində bədən.

İşlətmə canına vəlvələ saldı,
Sağlamkən canını naxoşluq aldı.

Qorxduğu başına gəldiyi zaman,
Az qaldı zavallı təslim edə can.

* *
*

Ey Qüdsi, az belə əfsanə oxu,
Zəmanə əhlinin avamdır çoxu.

Xəyal aləmində qalıb sərgərdan,
Cahilkən dəm vurur ağıl, şüurdan.

"Kamaldan naqisdir hər kəs", - deyəndə,
Barı fəzilətdən dəm vurma sən də.

## TƏDBİRİN GÖZƏLLİYİ

Əmr etdi nədimə sultan bir səhər,
Ki, hazır eyləsin qalın bir dəftər.

Ölkədə nə qədər dəli-axmaq var,
Yazsın adlarını aydın, aşikar.



Dəftər hazırlanıb verildi sabah,
Lap başda görüncə öz adını şah.

Dedi: "Ey yaramaz, ey həzzrə insan,
Nə üçün adımı bura yazmısan?"

Dedi: "Bir şəxsə ki, mal dövlət verdin,
Uzaq bir ölkəyə onu göndərdin.

Vətənsiz bir quldur o adam ancaq,
Söz yoxdur, o bir də qayıtmayacaq.

İndi o azaddır əlində dövlət,
Kef çəkib yaşayır şad-xürrəm, rahət".

Şah dedi: "Qayıdıb gəlsə o zaman,
Yəqin ki, onda sən axmaq olarsan".

Söylədi: "Eybi yox gələrsə həmən,
Bir adda yazaram bu dəftərə mən".

* *
*

Ey Qüdsi, ibrətlə bax bu gedişə,
Ağılla şüru et son də hər işə.

Əqlə istinadın mənası çoxdur,
Bəxt üz döndərsə də zərəri yoxdur.

Nakam yaşasa da şüurlu insan,
Yaxşıdır xoşbəxt bir nadan olmaqdan.

## YERSİZ MİNNƏT QOYMAQ

Eşitdim: pul verib təbibə səhər –
Bir xəstə üstünə dəvət etdilər.

Xəstənin qüvvəti getmişdi tamam.
Hərarət içində yanırdı müdam.

Qürurla soruşdu ondan kef, əhval,
Xəstəyə verdi o bir neçə sual.

Nəhayət, guya ki, o tapdı dərdi,
Xəstədən qan almaq əmrini verdi.

Yazığın qolundan alındıqda qan,
Qanıyla bərabər axıb getdi can.

Qorxuyla, təşvişlə olsa da, həkim,
Deyirdi: "Nə yaxşı oldu tədbirim.

Nə yaxşı qan aldıq, dincəldi bədən,
Qurtardıq xəstəni bu ağır dərddən".

Bizim əsrdə də belədir: əyan –
Döşünə döyərlər hər alanda can.

Hər kəsin bir işi düşsə əlinə,
Pozaraq o işi, öyünər yenə.

Bu cür minnət qoyub, can almaq, həmən,
Yaxşıdır yenə boş vədə verməkdən.

Deyirlər: Bir kəsdən edəndə xahiş,
Düzəltsin birinə bir əməl, bir iş.

Əzəldən düzünü söylədi o kəs:
"Ki, ümid olmayın siz mənə əbəs,

Elə bu sizə çox hörmətdir ki, mən,
Avara qoymuram öz işinizdən".

Ey Qüdsi, buraxma düzlüyü sən də,
Hörmətsiz olarsan yalan deyəndə.





# Qəzəllər

1

*Gözlərin kim aşiqə məxmur şəklin göstərir,
Əhli-fəqrə mərdümi, məğrur şəklin göstərir.

Bəs ki, çəkdim qamətin yadilə ahi-ətəşin,
Xatirim nari-şəcərdən Tur şəklini göstərir.

Nəşeyi-meyxarə bais nolduğun bildim kunun,
Bir pərivəş can əra məstur şəklin göstərir.

Kuyi-canandan cüda aşiqlər əhvalın desəm,
Dəşt ara bikəs qalan rəncur şəklin göstərir.

Qamət üzrə taqi-geysudən asılmış, həqqi var,
Dil ənəlhəqq söyləsə Mənsur şəklin göstərir*

Asimanda kövkəbi-səd olsa Əsəd yerdədir*,
Bu səbəbdən yer savadi nur şəklin göstərir.

Töhfeyi babi-Süleyman söyləsəm, Qüdsi, nolur,
Bu qəzəl rani-mələxlə mur şəklin göstərir*.

---

* Birinci misraların qarşısında qoyulmuş (*) işarəsi onun Bakıxanov tərəfindən azərbaycanca yazıldığını göstərir.

2

Gördüm o gözəl türrəni rüxsar arasında,
Bənzətdim onu əfiyə gülzar arasında.

Rüxsarə düşən türrələri çəkmə kənarə,
Bu rəsmdi əfi dolanar nar arasında.

Seyd eylədi zülfün məni bu gözlərə, ey vay!
Qaldım nə yaman bu iki bimar arasında.

Ey didə, məgər neyləmişəm mən sənə axır,
Qoydun məni sən yar ilə əğyar arasında.

Göz yaşım ilə bəsləmişəm canıma minnət,
Peykanlarını bu dili-xunbar arasında.

Gördüm səni əğyar ilə ey mah, məsəldir
Bayqu tutar, əlbəttə, vətən bar arasında.

Könlüm quşuna dam qurub çeşmi-xumarın,
Qafilmi gəzər kimsəni əyyar arasında.

Gər guşeyi-çeşmində tutub can quşu məskən,
Bayqu tutar, əlbəttə, vətən bar arasında

Rüxsarın ərə səfhə kimi vəsməli qaşın,
Bir daldı düşüb cədvəli-zəngar arasında

Eşq əhlinə daim yetişir möhnəti-cövrün,
Zahid, qalasan kaş səni dar arasında!

Dəysin başına səktəsiz ol həmdü səlatın,
Kimsən gəzəsən aşiq ilə yar arasında.

Əfsanə dəxi söyləmə, it bir nəzərimdən,
Var sən kimi yüz xər belə bazar arasında,

Qüdsi, nə yaman bağladı bu gözləri sahir
Yüz sən kimi sərkəştəni bir tar arasında.



3

* Arizu eylər könül dildar gəlsin, gəlmədi.
Zülfü kafər, gözləri xunxar gəlsin, gəlmədi.

Hər pərivəş cilveyi-hüsn eyləmiş, mən gözlədim,
Dilrubalar föveinə sordar gəlsin, gəlmədi.

Canə gəldim bivəfalar ülfətindən, istərəm,
Bir vəfa rəsmində sabit yar gəlsin, gəlmədi.

Dərd-möhnət keçdi həddən, bəs ki, çəkdim intizar,
Gözlədim ol şux gülrüxsar gəlsin, gəlmədi.

Ləhcəyi-canpərvərindən şur salsın aləmə,
Əndəlibi-şaxəyi-gülzar gəlsin, gəlmədi.

İstədim, Qüdsi, deyim vəsfi-camalın dilbərin,
Kuşiş etdim, zinəti-göftar gəlsin, gəlmədi.

4

* Çox gözdə sürmə, əldə həna, üzdə xal olur,
Nisbət bu qaşü bu gözə bənzər məhal olur.

Qafi – qaşın, tayi – telin, lami – ləblərin,
Aləmdə əlbir eyləsə, billah qital olur*.

Lövhi-xəyalə hər necə təhr eyləsəm qaşın,
Gəlməz xəyalə axırı məhzi-xəyal olur.

Sirri-dəhani sordum o şəkkər dodaqdən,
"Pünhan danış bu sirri – dedi, – qilü qal olur".

Görcək o atəşin üzünü intiqam oldu lal,
Qüdsi, cərəs düşəndə oda, zəngi lal olur.



5

Bivəfa yarə könül versə vəfadar əbəs,
Əhdü peymanı yoxa verdiyim iqrar əbəs,

Dərdi-dildən səni çox eyləmək olmaz agah,
Qıldığım nalə, qələt, etdiyim izhar əbəs.

Gül kimi beş gün imiş söhbəti-əbnayi-zaman,
Eylədim ömrümü zaye, özümü xar əbəs,

Çeşmi-cadunigəhin məsti-meyi-xab ikən,
Ah kim, eylədim ol fitnəni bidar, əbəs.

Bulmasa feyzi-nəzər kəsbi-kəmal etməz hüsn,
Yari-aşiqdən əgər gizləsə rüxsar, əbəs.

Aşiqi-paknəzər vəslini hicranda sanır,
Eyləməz arzuyi-dövləti-didar əbəs.

Qönçəvü laləni gördüm, qəmə batdım, Qüdsi,
Eylədim meyli-tamaşagəhi-gülzar əbəs.

6

*Gün üzrə ay tüluimi ya gün kəmanıdır,
Ya qaşdurur bu cümləsi aşıq gümanıdır.

Cami-cahannümayə düşüb əksi-asiman,
Xalın səvadi əxtəri-bəxtim nişanıdır.

Göstərsə, yox əcəb, yədi beyza Kəlimi-təb*,
Hala ki, şaxi-güldə təcəlla zamanıdır.

Badi-səba əbirfişani-çəmənmidir,
Ya bustani-hüsn ruxün busitanıdır?

Şövqi-toranə, qüvvəti-pərvaz olurmu hiç,
Ol əndəlib üçün ki, qəfəs aşiyanidir?

Dilbər bəyani-halim eşitməzsə,yox əcəb,
Pərva qılurmu əhli-cünun dastanıdır.

Qüdsi, üzari-zərdimi əşk etdi laləgun,
Bu gülşənin baharı, zəmani-xəzanıdır.



7

* Dil eşq yolunda zar olubdur,
Bir gül həvəsində xar olubdur.

Xunabə dönübdü rəngi-zərdim,
Bu gülşən üçün bahar olubdur.

Dövrani-fələk müxalif olmuş,
Can düşməni-ruzigar olubdur.

Dilbər qəmi, dustlar fəraqi,
Dərdim bir ikən həzar olubdur.

Mən etmə kəlamım olsa dilsuz,
Söz mənşəi pürşərar olubdur.

Xunin ciyərim bəsani-lalə,
Əfsurdəvü dağidar olubdur.

Qəm bihədü dərd banihayət,
Möhnət dəxi bişümar olubdur.

Hicran sitəmi alıb qərarım,
Gün nuri gözümdə tar olubdur.

Hicrində düşüb bəlayə, Qüdsi,
Sərgəştəvü biqərar olubdur.1

[1] "Kitabi-Əsgəriyyə"də bu qəzəlin 5 beytindən istifadə edilmişdir (*M.S.*)

8

Bu qaranlıq gecə yarəb çəkecəkdir nə qədər,
Olacaqmı bitə hicran, gülə nurani səhər?!

Bir ömürdür çəkirəm nalə ömür yazında,
Bəlkə tutsun ürəyimdən o gözəl yar xəbər.

Aman ey badi-səba, sal yada bu halımı sən,
Ol vəfasız yarımın kuyinə gər düşsə güzər.

Sevginin ovlağı çox qorxulu bir səhə tutur,
Orda qartalı vurar bircə oxu ilə nəzər.

Düşdü töhmət toruna qəlbimiz, ey yar gərək,
Zülfün olsun bizə rəhbər ki, keçə bəlkə xətər.

Təkyə verdimsə yarın zülfünə, zahid, qınama,
Sevginin yorğunuyam, başqa xəyal etmə hədər.

Ol xumar gözlə üzün əldən alıb taqətimi,
Çıxmaz eşqin ürəyimdən də çalışsam nə qədər.

Nuh kimi kuyinə düşsəm o sitəmkar gözəlin,
Qorxuram göz yaşın axır məni siylaba verər.

Qüdsi, ömründə tutub guşeyi-ismət daim,
Qanı axsın hədərə çıxsa bu ismətdən əgər.



9

Hüsn mülkündə saçın tapdı böyük bir şöhrət,
Bu qəra üzlüyə bax gördü nə ali hörmət!

Gözlərin keçmiş idi, yar, qanımdan, niyə bəs –
İntiqam almaq üçün indisə vermir möhlət?

Eşq rahində itən qəlbimi mən tapmayıram,
Görünür çoxdu bu yollarda itən cəmiyyət.

Zülfünü mənzil edibdir özünə mürği-dilim,
Qəribin mənzili daim olur axşam zülmət.

Saqiya ver mənə bir badə içim fürsət ikən,
Bu orucluq ayı sonra mənə verməz fürsət.

Qara xal məhrəm olubdur dodağın guşəsinə,
Qara hindu nə gözəl yerdə olubdur rahət!

Çoxları cəhd eylədi vəsf edə bu hüsnünü yar
Xoş kəlam Qüdsiyə oldu belə nemət qismət.

10

Kuyindən alır daim rövnəq gülü bustanlar,
Torpağını ol kuyin təşkil eləyir canlar.

Ruxsarını əks etmiş, sanki gülü bülbül bax,
Gülzarda gülər hər gül, bülbül edər əfğanlar.

Leyliyə deyən dəmdə Məcnundakı bərqi-eşq,
Əfsanə kimi gəzdi dillərdə bu dastanlar.

Məşuqə və aşiqçin varlıq ilə sərxoşluq,
Həm ruzədir, həm bayram açılsa giribanlar*.

Yar zülfünün hər bəndi san qəlbimi gizlətmiş,
Hər həlqəsinə guya bağlamada çovkanlar.

Hər guşəsi bu qəlbin bənzər çölə, səhrayə,
Sığmaz ona bu üzdən səhravü biyabanlar.

Saqi, nə gözəl, mey – xoş, əğyar gözündən dur,
Qüdsi, belə keyf olmaz dövr eyləsə dövranlar.



11

Hər zülmün rahatlıq bəxş edir inan,
Şövqindir qəlbimi işıqlandıran.

Hər yerdə camalın bir gözəlliklə,
Gözlərim önündən çəkilmir bir an.

Qəbulun şübhəsiz bəxtiyarlıqdır,
Olmadım lütfündən mənsə kamiran.

Bəs hanı mənzilin, sənə yol hanı?
Geriyə qalmışdır bizim karivan.

Nakamlıq özü bir kam oldu bizə,
Bu imiş eşqdən bizə ərməğan.

Əlində xəncərdir, ləbində gülüş,
Qəribə qatilmiş bizim canalan.

Qüdsi, heyrətdəyəm, məni rədd edən,
O gözəl olmuşdur indi mehriban.

12

Qəlbimi, dinimi aldı gözəlin hicranı,
Dəlilik zənciri saldı saçına bu canı.

Qafiləm mən gecə-gündüz özümün halimdən,
*Bir qaranlıq bürüyüb sanki bütün dünyanı.*

Mən ki möhkəm deyiləm dinimə, qorxum budur ah,
Axiri səcdə edim bir bütə mən pünhani.

Hər cəfana dözürəm kaş ki, məni atmayasan,
Sevməsən barı düşün, kin ilə bu nalani.

Qorxmuram eşqdə töhmətdən, usan ey naseh,
Danlağın tərif edər məndə olan peymanı.

Qayıdıb qafilədən Leyli olar bir Məcnun,
Xosrovu Şirin olar dərgahimin dərbanı.

Qüdsi, tərk et bu yolu, burda əziyyət çoxdur,
Deyəsən sözlərinin yox daha bir payanı.



13

Könlümü bağlamışam zülfünə, ey laləüzar,
Qalmamış qəlbdə heç tabü təvan, səbrü qərar.

İstədim meylə yuyam dəftərə yazdıqlarımı,
Eşq təsiri etdi məni əqildən bizar.

Bu riya əhli məni saldı elə şurişə kim,
Edirəm rindliyi, rüsvalığı mən indi şüar.

Eşq əgər olsa qəzadan bizə qismət nə üçün –
Bu qədər hüsnü vəcahət alıb ol nazlı nigar?

Hanı ol zülfü pərişan ki, məni bəndə sala,
Qoya bu canimə minnət edərək məstü-xumar.

Heç kəsin sağərinə tökməz inan mey bu fələk,
Özü peymanəsini döndərib etmiş xunbar.

Bu əcəbdir ki, tapılmaz yenə də, ey Qüdsi,
Belə bir dilbəri-şirinsüxənü gülrüsxar.

14

Saqi, yuyub apar yuxunu didədən bir an,
Gün tək şərabə cilvə verib parlat hər zaman.

Örtəndə sən niqabı tapır qəlbimiz ümid,
Bu pərdəni yaxar deyirik atəşi-dəhan.

Qaşla üzün nə əcayib qiyamət etmişdir,
Vermişdir aləmə günü ay ilə bir nişan.

Yaqutumdur dodaqların, aya, bəyan elə,
Ya canə qutmudur de ki, ol ləli-dürfəşan.

Dün məclis içrə gülüb verdi vədlər,
Heyrətdəyəm bu vədi kimə verdi mehriban?

Eşqə düşən, bəlayə düşər, bilmişəm bunu,
Bəs kim edib bu can evini eşqə aşiyax?

Ey Qüdsi, bax cigər odu yandırdı qəlbimi,
Eşqinlə bu kəbabə çilə duzlu su hər an.



15

Hər kim edərsə vərdiş eşqü səfayi-yarə,
Əvvəlcə ixtiyari atsın gərək kənarə.

Bizdən ərzü təmənna, rəddü qəbul yardan,
Bu işlərin nə xeyri var imiş intizarə?!

Ənbər saçan o zülfün aşütfə olmasından,
Verdin bir asudəlik bu qəlbi-biqərarə.

Bu eşqin aləmində vardır behişt-cəhənnəm,
Baxsan fəraqi-yarə, ya vəsli-gülüzarə.

Bağban icazə versə bağə girim, nə fayda,
Dözmək olarmı, aya, gülçinə, zülmi-xarə?!

Bülbülləri salardım qəfəslərə bir anda,
Dağıdıb son qoyardım xəzanə, novbaharə.

Qüdsi, bu xoş çəməndə bir laləüz həvası,
Xakə salıb qan etdi, dağ çəkdi qəlbi-zarə.

## 16

Bica yerə etmir qaşına səcdə hər əhbab,
Çünki sayılır qiblə hər an guşeyi-mehrab.

Heyrətdəyəm, aya, nə edir bəh münəccim,
Basmış ki, sənin qul dağını alnına məhtab.

Dövlət diləyirsənsə, burax dövləti, varı,
Bu ali yer olmaz sənə başqa cürə icab.

Pak eylə ürək qanını qəlbdən nə ki, gözdən,
Dağlarda tutulmaz yolu, artar daha silab.

Üzdən görünər batini hər aşiqin əlbət,
Dağ aldı dəvadən necə gör laleyi-sirab.

Dəvət eləmə sən məni artıq o behiştə,
Mən istəmərəm ol yeri, var orda da xunab.

Qüdsi, nə qəmi yansa cəhənnəmdə bu cismin,
Od vurdu mənim qəlbimə bir mehri-cahantab.



## 17

Əqlim olursa mane bu eşqi-purhicabə,
Gəlməz fəqət bu eşqin sevdaləri hesabə.

Eşqin müqabilində gücsüz qalır düşüncə,
Şam da işıq verərmi heç nurlu aftabə?!

Dostun yanında bir dəm, başım həvasız olmaz,
Gözlər düşər məlalə, qəlb isə iztirabə.

Yuxuda da rahatlıq yoxdur o zülfü xaldan.
Qoymazlar ki, bu gözlər getsin bir azca xabə,

Xanəndənin sədası, mey camı, bağ səfası,
Bir od vurar bu canə, necə ki, od kababə.

Vəslində heyrətdəyəm, hicrində intizarda,
Kim rast gəlib bu halda bir eşqi-kamiyabə?!

Qüdsi, bu eşq ürəkdən çıxmaz, nahaq çalışma,
Qoy eşq ömr versin artıq bu dilxərabə.

18

Əldə mey, üzdə gülüş gəldi nigarım bu gecə,
Pis nəzərdən uzaq, ol çeşmi-xumarım bu gecə.

Yar üzü meylə qızarmış, meyi etmiş üzü al,
Nə məharət eləmiş saqiyi-yarım bu gecə!

Mən bilirdim ki, kimə lütfi və ya nifrəti var
Almasaydı əgər o səbrü qərarım bu gecə.

Üzünü yad eləyib gözlərimə axdı qanım,
Batinü zahir olub güllü baharım bu gecə.

Qaşla üz, ayla günəş misli çıxıb bir yerdə,
Nə qiyamət eləyir laləüzarım bu gecə.

Kuyinə düşmək üçün sinəmi yırtmış könlüm,
O çəmənzari dilər bülbüli-zarım bu gecə.

Kakilindən hələ mən bircə dügün açmamışam,
Tökülür, Qüdsi, qələmdən nəki varım bu gecə.



19

Səhər ki, badədən aldı üzün bu rəngilə tab,
Şəfəq utandı, günəş ruyi üstə çəkdi niqab.

Məhəbbət əhlinə verdi o zövqi qəmzə ilə,
O yar gözlərinin təsirilə axdı şərab.

Cahanda şöhrət alıbdır ətirdə Çin mişki,
Onun saçı bu sözə qıvrılıb da verdi cavab.

O gülüzar vüsalı xəyalə gəldikdə,
Nədənsə gözlərimi bağladı bu yersiz xab.

Tükəndi səbrü qərarım vüsali-eşqində,
Ürək bu intizarə necə səbr edib gətirsin tab?!

Zavallı könlüm onun zülfü içrə bəndə düşüb,
Nə qədər axtarıram tapmıram, olub nayab.

Şikayət etməyirəm, eşqdən bir an, Qüdsi,
Üfürdüyücə odu şölələr edər portab.

Yarəb, bu od nə oddur kim, düşdü cismü canə?
Od düşdü bir ürəkdən bax cümleyi-cahanə.

Qorxum budur, nəhayət, qiyamətə şur salar,
Bu fitnə ki, onunla qarışdı bu zamanə.

Tufan gərəkdir indi gül şaxəsin sovursun,
Orda ki, miskin bülbül salmışdır aşiyanə,

Bağban ilə o gülçin nə mənfəət görəcək,
Bir yazdan ki, oxşayır hər tərəfi xəzanə?

Hər könül ki, bəladan qorxub geri qaçmadı, –
Mərdanə qarşı durdu bu zalim asimanə.

Mən susmuşam, etmərəm dərdlərimdən şikayət,
Amma bu dərdlərdən ki, bənd vurmuşdur zobanə.

Qüdsi, əcəb bənzərəm o zavallı bülbülə,
Ki, əzilmiş qanadla atar can gülsitanə.





Gül yanağın mişk ilə ənbər tutub,
Bax gümüşün haşiyəsi zər tutub.

Mur oturub təxti-Süleymanə, ah,
Hind qoşunu Şərqi sərasər tutub*.

Pozdu camal səfhəsini indi xət,
Dadımı səndən o dilavər tutub.

Xirməni-pərvanəni yandırdı şam,
Bax özü də şöleyi-azər tutub.

Aşiqi-dilxəstə işıq gündüzü,
Gör necə zülmətə bərabər tutub!

Naz eləyər indi sənə aşiqin,
Çünki o bir başqanı rəhbər tutub.

Qüdsi, cahandan bir ümid gözləmə,
Çünki o da surəti-digər tutub.

22

Min bir bəlaya düşdü, budur əhli-ruzigar,
Bir saqidir edən məni dünyada payidar.

Heç gizlədə bilərmi könül yar eşqini?
Etmiş bu dərdi çaki-girbanım aşikar.

Sakit deyil könül ki, onun ahu gözləri,
Etmiş xədəngi-tir ilə bu qəlbimi şikar.

Bir ömrdir ki, verdim ona xəstə könlümü,
Mən bilmədim ki, yoxdur ona zərrə etibar.

Daim qəm içrə düşdüm onun vəslin axtarıb,
Oldum obəs o qaniçənə mən ümidvar.

Verdim firib qəlbimə xabü xəyal ilə,
Bəlkə bir az keçə yüngül bu intizar,

Yada salarmı heç bu əsr bülbülü o şux,
Gülzar içində yan-yana minlərcə Qüdsi var.



23

Demə ki, ayrılığın ey nigar asandır,
Sənin məhəbbətin axır bu cism üçün candır.

Min il yazarsam əgər mən, fəraqi qurtarmaz,
Bu namənin sonu yoxdur, tükənməz ümmandır.

Canı fəda edər olsam, deyinmə ey naseh,
Bu sirlər sənə axı, həmişə pünhandır.

O şah ki, nəfsinə tabe olub, o qafildir,
Onun əlaltısı xain, diyarı virandır.

Kirpik içində onun qarə gözləri sanki,
Çəmən içində gəzən xəttü-xallı ceyrandır,

Ürək olubdur əsirin zavallı Yusiftək.
Züleyxa qeydinə düşmüş əsiri-zindandır.*

Təəccüb eyləmə, Qüdsi, cırıb giribanın,
Zavallı eşq yolunda həmişə nalandır.

24

Könlümdə nə şandır, nə də ki, namü nişandır,
Pojmürdə edən xatirimi muyi-miyandır.

Hərçənd ki, zülmündən usandım nə edim ki,
Bu dideyi-qəmdidə, yolunda nigərandır.

Heyrət çölü içrə özünü bax ki, itirmiş,
Bu namü nişandır, bu nə namdır nə də şandır?

Can zülməti içrə görərək abi-həyatı,
Bildik ki, ələ az düşəcək, vəhmü gümandır.

Bax hüsnü məhəbbətdə olan nazü niyazə,
Qaib və əyan içrə onun ruhu nihandır.

Hər kim ki, bu dünyada dalıb həşmətü cahə,
Söylə ona vaz keç ki, bu aləm güzərandır.

Xalində düşüb damə budur can quşu, Qüdsi,
Zənn etmə onu bənd eləyən zövqi-cahandır.



25

Aman ki, ol zalim canan ğarəti-can edib getdi,
Bu sinəmi bir şuridə qələ, zindan edib getdi.

Fəraqında işıqları, yuxuları aldı gözdən,
Gün-gecəni aşiqinə necə yeksan edib getdi.

Canan getdi yanımdan ah, mən əl çəkdim canımdan ah,
Ruhum onun arzusuyla belə cövlan edib getdi.

Qəlbim onu görmək üçün gəlib çıxdı gözüm üstə,
Ətəyimi qan yaşilə bir gülüstan edib getdi.

Belə çətin vəziyyətdə heç xatirim cəm olarmı,
Ki o pəri şanlı məni çox pərişan edib getdi?!

Gözlə ürək abü tabi almış qəhrü kərəmindən,
Bir şam üzlü məni necə ağlar, xəndan edib getdi.

Bu sadəlövh Qüdsini yar vəslə ümid verə-verə,
Nə hiyləgər məharətlə bəndi-hicran edib getdi.

26

Ah ki, o itmiş gözəldən pirəhən peyda deyil,
Pirəhən yox, bəlkə bir beytül-həzən peyda deyil*.

Bənzədibdir gülşəni bütxanəyə bu lalə, gül,
Laləüzlü, gülsifət bir bütşikən peyda deyil.

Mən çəmənzar içrə bu abi-rəvani neylərəm,
Burda ki, bir səbzəxət, şirin dəhən peyda deyil?!

Şaxəsindən güllərin mən almaram peymanəni,
Əldə sağər saqiyi-nazikbədən peyda deyil.

Səbzə örtmüş ruyini bir tazə pərdəylə, neçin,
Səhnəsində bir gözəl xoş yasəmən peyda deyil.

Bülbülün avazəsi gülüzaridə verməz fərəh,
Çünki, bir canlar alan şirinsüxən peyda deyil.

Sevgisi bir nəqşdir könlündə Qüdsinin inan,
Orda bişək hiyləgər bir Əhrimən peyda deyil*.



27

Çəməndə sərv də qalıbdır heyran,
Nazlana bilmir o utandığından.

Nazənin qamətlər gələndə rəqsə,
Könül, göz olarmı rahət bir zaman.

Ömür tək keçirlər sürətlə bir-bir,
Bu lütfü görməyə qalmayır imkan.

Uçurlar həvayə pərilər kimi,
Heç uça bilərmi həvayə insan?

Hər yanda can alan bir nazənindir,
Əlində xəncəri verməyir aman.

Yusif köynəyini Züleyxa yırtdı,*
Başqadır məzmunca bizim bu dastan.

Qüdsi, bu güllərə əl vurmaq olmaz,
Baxmaqçın yaratmış onları dövran.

28

İndi şəhərimiz əmin-amandır,
Hər kəs öz işində bir kamirandır.

Başqa cür zülm olur burada xalqa,
Dadrəs tapılmır, bu iş yamandır.

Nə bilim bu yolda kimdir yoldaşım,
Baxıram bir yoldur, bir karvandır.

Bir eşqə qalıbdır ümidim ancaq,
Başqa şey qəlbə dərd, cana ziyandır.

Əğyardan nə qorxum şahin önündə,
Çibinlər çox miskin və natəvandır.

Canan vüsalını istər xüdpərəst,
Eşqdən dəm vuran həvəsdən yandır.

Bir günün qəmindən yüz il deyərdim,
Heyif ki, bu ömür tez cansitandır.



29

İndi zəmanə içrə fəzilətlə olmur intixab,
İşlər dolaşmış, oylə ki, yox işdə haqq-hesab.

Hər kəs nə istəyir eləyir, yox sənəd, sübut,
Guya ki, ən zəif şey imiş dünyada kitab.

Axırda boş xəyal ilə bir iddia olar,
Kim göydə heç də dövr eləmir mahü afitab.

Bir fiqhə bağlıdır görürəm işlər ah, əsəf,
Hər kəs özün görür, başa düşmür günah, səvab.

Şöhrət adıyla hökm edilir, ədlə yox baxan,
Düzlüklə əyrilik qarışıb, artmış iztirab.

Cənnət içində də elə bil əyrilik düşüb,
Allah şərikidir deyəsən orda hər cənab.

Axtarma Qüdsi, sözdə dəlilü sualı sən,
Küfrə gedib çıxar sonu hər verdiyin cavab.

30

Yol saldım onun zülfünə sevdası gözəldir,
Hər şeydən onun gün kimi siması gözəldir.

Geysusi gözəl, lalə üzari gülə bənzər,
Məşşatə nə lazım ki, hər əzası gözəldir.

Hər acı sözü yarın olar qəndə bərabər,
Bəh-bəh, nə əcəb şivəsi, qovğası gözəldir.

Zəncirə düşüb rahət olar bu dəli könlüm,
Çünki, yarımın zülfi-çəlipası gözəldir.

Bir sərv kimi cilvələnər qaməti gözdə,
Çeşmə yanında onun qaməti-rənası gözəldir.

Ulduzmudur aya, xalı ol ləbləri üstə,
Ya hindli edir səcdə, tamaşası gözəldir.

Tus əhli olan Qüdsi tapıb feyzi o yerdən,
Bu Bakılı Qüdsi deyir ixlası gözəldir.



31

Ey bəxt, nədir səndə bu əhval, bu halət,
Yoxdur sənə dünyadan eçin azca fərağət?!

Gah Qaf dağına çıxmadayam, gahi cahanda,
Avarə dolannam da vilayət bə vilayət.

Gah Qıpçağa, gah Rumə, gah İranə gedib mən,
Gah da edərəm Rus, lehistanə əzimət.

Mən bixəbər oldum bu cahandan, o da məndən,
Bir itmişə bundan da gözəl varmı əlamət?

Qürbətdə bu bəsdir ki, tapılmaz elə insan,
Yaxşı, pisimi eyləyə təhsinü məlamət.

Bir xeyr yoxmudur ki, nə qürbət nə vətəndən,
Bihudə olur ömri-giranmayə də ğarət.

Bundan belə bir künci-xərabata düşərdim,
Qurtarsam əgər, Qüdsi, bu dəm canı səlamət.

32

Cəfa etsə gözəl bir mehribandır,
Açıq rəddi yəqin cəzbi-nihandır.

Canı qurban elə canana hər dəm,
Bu cür ölmək həyati-cavidandır.

Hər Azərdən Xəlil olmaz cahanda,
Əgər olsa, hər od bir gülsitandır*.

Əcəb mənası var reyhani xəttin,
Demə hər səbzəyə kim, bizabandır.

Bu yerlə göy ki, bir arpaya dəyməz,
Hər arpanın özü yer asimandır.

Əgər dərddən xilas olmaq dilərsən,
Əlacı bil şərabi-ərğəvandır.

Olanda məst açarsan eşq rəmzini,
Bəli, Qüdsi, ki, məstlik sirr açandır.



33

Xoş ol qəlbə ki, hər mövqe ona bir eşq rəhbəridir,
Odur həm Cəbrəilü vəhy, o Qurandır, peyğəmbərdir.

Əgər aləm desə aşiq olubdur kafər, eyb etməz,
Bu sözlər macərayi-haləti-Səlmanü Buzərdir*.

Yəqin məslək cahanında bulunmaz xasü am əsla,
Ədalət – imana, zülmü sitəm – küfrə bərabərdir.

Bu incə nöqtə həll olmaz ağılla, mey gətir saqi,
Sənə ta kəşf edim halı, bu dəm hər şey müqəddərdir.

Əlindən yaxşı bir iş çıxmayan kəslər deyil mömin,
Həqiqət və ədalətdən kənar hər kəs də kafərdir.

Əməksiz bil bu aləmdə iş aşmaz, ruzi bəxş olmaz,
Bizimdir hər əməl, hər iş, bizə bunlar müyəssərdir.

Nə çatsa dostdan, ey Qüdsi, təşəkkür eylə, razı ol,
Ki, hər qəmdən sora şadlıq bu dünyada müqərrərdir.

## 34

Bu aləmdə feyzdən bir pay almış xasü am,
Onunladır roxnolər, onunladır hər nizam.

Nə vüsal, nə də hicran aram etməz könlümü,
Mənə bu zindəganlıq əbədi olmuş həram.

Bu dünyada var isə bircə təsəlli əgər,
O da ancaq tutmaqdır əldə meylə dolu cam.

Məhəbbət bazarında naz satma çox, əzizim,
Burda çox Əzizi-Misr dağlanıb olmuş qulam*.

Ovçum, gülüstan mənim yürəyimə dar gəlir,
Bir tora sal könlümü, bəlkə tapım orda kam.

Fırladır boş-boşuna məni dolanan ay, il,
Məgər mümkünmü mən də bu aləmdə şad olam?

Bəsdir daha, ey Qüdsi, sözlərini xətm elə,
Nə qədər desən yenə söz qalacaq natəmam.



## 35

O zərər ki, xəzandan dəymişdir gülsitanə,
Söylə nəsim, nə etdi bülbüllərə zəmanə?!

Payız dərdi, əzabı güldərənin, bağbanın,
Bir fəsli hanı ki, rahat keçsin zavallı canə?!

Xəzan xoşdur, ardınca vardır bahar ümidi,
Sən şadsan ki, gül gəldi, son qoyuldu xəzanə.

Dəm vurursan eşqdən səlamətlik eşqinə,
Candan keçmək yoluyla çatmaq olar cananə.

Heç bir təsir etmədi daş qəlbinə bu ahım,
O ah ki, rəxnə salmış bu yeddi asimanə.

Qol qanadın sındırıb buraxdın bir quşu ki,
Qəfəsinçin əlvida etmişdir aşiyanə.

Qüdsi, bu dilbərlərdən sən könlünü geri al,
Çünki, onlarda yoxdur sədaqətdən nişanə.

36

Qəlbim bəndə düşübdür yar zülfündə, a dostlar,
Əsir könül özünü hesab edir bəxtiyar.

Meyxanələr yolçusu çəkməz dövlət qəmini,
O da duyur özünü kölelikdə hökmdar.

Naseh, sevda yolunda mənə vermə nəsihət,
Nəsihəti dinləməz bəladan zövq alanlar.

Sən özünü duyarkən, mən qafiləm özümdən,
Özündən xəbərsizə nə ümid, nə etibar?

Vəfadarlıq yolunda can verənə qulam ki,
Yar yolunda hər iki aləmdən olmuş kənar.

And olsun dost canına, dostdan başqa dostum yox,
Dostumdan xoş dünyada bir vəfalı dostum var?

Qönçə kimi Qüdsinin dili bəndə düşübdür,
Yar ağzının sirrini etmək istər aşikar.



37

Eşqdən zərrəcə yanımda nişan vardır? Yox,
Ya vəfa etməsinə azca güman vardır? Yox!

Sevməyə söz verərək zülmü cəfa eylərdi,
Dildəki ilqarına şərhü bəyan vardır? Yox!

Yüz ümidlə bu yerə danə səpərdi könlüm,
Ortada meyveyi-ümmidi əyan vardır? Yox!

Eşqi fariq elədi qəlbimi bu dünyadən,
Mənə bu fitnə əlindən bir aman vardır? Yox!

Boş yerə şöhrət üçün cəhd eləmə son dəmdə,
Sabah olduqda bu şöhrət, bu cahan vardır? Yox!

Ömrümün mayəsi sevdayi-səri-zülf oldu,
Soruşursan ki, bu sevdada ziyan vardır? Yox!

Qüdsinin şeri dönüb şəkkərə vəsfində sənin,
Başqasında belə bir şeri-rəvan vardır? Yox!

Öyrəşib bu qürbətə, oldum vətəndən bixəbər,
Qəmlərə düşmüş könüldən getdi ümmidi-səhər.

Mən ki, dərddən etmirəm bir an şikayət, dinmərəm,
Ki, neçin ovçum unutmuş torda, etməz bir nəzər.

Vardı qəlbimdə ümidim, arizum, ancaq nedim,
Oldum avarə, bu ömrüm, ah, keçdi çox hədər.

Mən salıb yadə keçən xoş günləri dostlar ilə,
Ağlaram fəryad ilə qəlbimdə sonsuzdur kədər.

Yar yanında dərdi mən bir an da duymazdım aman,
Gör ki, bu zalım fələk etdi mənə nə zülmlər?!

Gər zaman bundan sonra gülsə mənə mənası yox,
Bir balıq çıxsa sudan başqa nəvaziş nə edər?

Mən daha bir an belə vaiz sözün etməm qəbul,
Tiflisin küncündə bu ömrü keçirrəm bəxtəvər.





Düşübdür əksi-ruyin al şərabə,
Qəmər möhtac olar çün afitabə.

Alarkən odlu busə yar ləbindən,
Düşər qəlb şurişə, can iztirabə.

Kənar ol zahida, eşqin hədisi
Sığışmaz tutduğun dəftər, kitabə.

Salubdur gülşəni yüz rəngə guya,
Cəmali-yar salmış əks abə.

Günəş gizləndisə qarə bulutda,
Ruxi-canan işıq saldı türabə.

Salıbdır laləyə sünbüldən örtük,
Üzə bax ki, özün salmış niqabə.

Bu bəzmə, Qüdsi, sən biganəsənmiş,
Səni burda alan yoxdur hesabə.

## 40

Bu könlümüz daima yar üzünə mayildir,
Bundan başqa nə varsa, cümləsi boş, batildir.

Sinəmdəki atəşin tüstüsü yox, nuru yox,
Bircə sözlə bu sirri şərh eyləmək müşküldür.

Canla canan eynidir, qəribə deyilmi ki,
Can mənimlə cananın arasında hayildir.

Öz işinin üstündə olmalıdır hər bir kəs,
Özündən xəbərsizlik ancaq bizə şamildir.

Ağıl yüz cür maneə törədir bizə hər an,
Divanəlik eyləyir hər şəxs ki, aqildir.

Kim mənfəət arasa, sevdayə meyl etməsin,
Çünki onun çəkdiyi hər bir əməl zayildir.

Hər kəs ondan özünə layiq bir murad aldı,
Təkcə Qüdsinin qəlbi bu feyzə naqabildir.



## 41

Fitnə-fəsad düşəndə şurişlə bu cahanə,
Təcridə meyl edərmi yazıq əhli-zəmanə?!

Məqsəd zühur isə, bəs nədir məscid, kəlisa?
Qovqa düşüb bu üzdən dərslərdə hər dəhanə.

Bir yerdə ki, bulutdan atəş yağır yağış tək,
Yer üzündə olarmı hasilatdan nişanə?!

Hər kəs bir yol tutubdur qışqırır ki, haqq mənəm,
Başqası da ayrı cür düzəltməkdə bəhanə.

Vücud isə bağlıdır eşqə, nəfsə, ağıla,
Hər üçü də bunların çəkilmiş asimanə.

Xət yarı saldı dərdə necə ki, Ali-Sami
Yafəslə Ham nəsli gətirmişdi fəğanə*.

Səhrada, dağda, Qüdsi, öz ömrünü bitirdin,
Varismisən Fərhada, Məcnuni-natəvanə?!

## 42

Başda ki, yox şüurun neçin,
Yara vurulmusan əbəs,
Əhdi pozan nigar üçün,
Bunca kədər, fəğan əbəs?!

Cilvə edər məhəbbətə,
Pərdə çəkər sədaqətə,
Səndəki bu şərafətə,
Rəşk edər asiman əbəs.

Yerdə belə qəmərliqa,
Yaratdı sənəti-qəza,
Azər edərmi bir daha,*
Sənətini əyan əbəs?!

Rahibü şeyxə sal nəzər,
Hər biri eyni söz deyər,
Bir-birindən edib həzər,
Olurlar bədgüman əbəs.

Səfadədir zövqi-vəfa,
Eşqdə xoş olar bəla,
Xəncəri çəksə aşina,
Axıb getməz bu qan əbəs?!

Ey təbinə dövlət verən,
Dünya dolu qüdrətindən,
Bəs nə üçün özünü sən,
Qəni verdin nişan əbəs.

Qudsi, sənə deyil mübhəm,
Ki, sonsuzdur bu dərdü qəm,
Şikayətlə neçin bilməm,
Verdin xalqa ziyan əbəs?!



## 43

Bir mey gəmisinə olmuşam möhtac,
Tufandan çıxmağa tək budur əlac,

Nə hisslər iş görür, nə ağıl, çünki,
Rəfrəfsiz deyildir, mümkün bu merac*.

Hüsnün ləşkərini belə düzəltdi,
Yardakı xalü xət, gözlə qara saç,

Ki, aşiq məst olub öz varlığını,
Eyləsin eşqinin yolunda tarac.

Səndədir hər şeyin əsil mənası,
Özünü dərk elə, əzizim göz aç!

Həmişə dolaşıq işdən kənar ol,
Ox atan heç daşı edərmi amac?

Yaraşmaz çıxasan sən öz evindən,
Et Qüdsi, rəqibi evindən ixrac.

44

Fəqrlə tapdım özümə mən əlac,
Qalmadı dərmanə daha ehtiyac.

Bax ki, bu dərgahda duran bəndələr,
Səltənət almış, özü bitəxtü tac,

Şəhdi-ləbindən acı sözlər belə,
Ruhə verir ləzzətü zövqilə bac.

Gözlə ürəkdən əcəb aldın təvan,
Almamış heç kəs bu cürə bir xərac.

Mənfəət axtarma bu bazardə,
Qəlb yolu tapmaz belə yerdə rəvac.

Piri-Muğandan dilədim hümməti,
Söylədi dərddir yenə dərdə əlac.

Cami-mey al dəstinə, ey Qüdsi, sən,
Gizli qalan sirləri dünyayə aç!



45

Bir səhər vaxtında birdən gəldi hatifdən nida,
Müjdə olsun zöhddən, dindən qaçan hər insana.

İndi ki, yoxdur ağılda, nəfs əlində ixtiyar.
Yox olur başlanmadan hər eşqə bağlı macəra.

Dur gətir, saqi, o meydən kim, verər zövqi-əbəd,
Bir odur qəlbə təsəlli bəxş edən bu dünyada.

Etibar olmaz budaqda güllərin dövranına,
Soldurar badi-xəzan, bu dövlətə yoxdur vəfa.

Eşq mülkündə əcəb qanun qoyulmuş müntəzəm,
Bu sarayda zülm – adət, qan – mubahdır daima.

Gözlərin min işvə ilə öldürür min aşiqi,
Heç kəsin qalmaz məcali, dəfini bilməz rəva.

Qüdsinin hər nəğməsindən yarın ətri pəxş olur,
Bir adındır bəxş edən ətri onun asarına.

İsa nəfəsitək bəxş eyləyər can*,
Səhərin badəsi, nazənin canan.

Dün gecə səssizcə söylədi bir söz,
Açdı gözlərimdə bir sirri-nihan.

Dedi: "Mey halaldır gözəl verərsə,
Heç həram olarmı meyi-ərğəvan?!"

Ağılı sərf etmə eşqin işinə,
Ki, ağıl qarışsa verəcək ziyan.

Ey zahid, sən indi özün tövbə et,
Sağlama nə lazım bu cürə dərman?!

İlahi, nə gözəl yarın kuyu var,
Hər günü bayramdır, hər yanda qurban.

Ey Qüdsi, sən çox da kamal axtarma,
Bu yerdə dərrakə görünər nöqsan.





Mən paxıllıq edirəm quş və qarıncayə müdam,
Ki, xoş, asudə yatırlar yuvada hər axşam.

Belə sonsuz görünən göydə də bir vüsət yox,
Bəlkə orda ola bir azca bu könlüm aram.

Saqiya, bu gecə ver badələri peydərpey,
Ta ki, qəlbimdəki bu dərdlərimi yarə açam.

Belə məclisdə necə dinü bilik əldə edim,
Ki, ədəb qalmamış əsla bu gözəllərdə tamam.

Yarımın surəti cənnət kimidir, zülfü ləbə,
Kölgə salmış, biri baldır, o biri verməde kam.

Zülfünün hər bükümündən görünür bir göz bax,
Zülfü olmuş necə gör bixəbər aşiqlərə dam.

Qüdsi, təbin pozular, nəfsinə uysan, ayıq ol,
Su tapıb çirki təmizlə, elə bu nəfsini ram.

48

Pisləyirsən gözəli sən necə hər an, ey şeyx?
Bu necə əql, nə insaf, nə iman, ey şeyx?

Sevgini xəlqə həram etdin əzəldən, lakin,
*Qəlbini* çaldı *sənin huriyi-qılman*, ey şeyx!

Hər nədən məst olursan, nə təfavüt, məstsən,
Məstliyinlə bizi sən eylədin heyran, ey şeyx!

Nə üçün inciyəsən üzr varındır, bişək,
Olmusan cümlə təriqətlərə nadan, ey şeyx!

Bir baxaq, biz içirik, məst oluruq bir meydən,
Söylə verdik bu işilə kimə nöqsan, ey şeyx!

De görək ki, nə olub hasilin ol məsciddən,
Nə verib ömrünə bu naləvü-əfğan, ey şeyx!

Qüdsiyə vermə nəsihət bu pərişan hal ilə sən,
Onu almış ələ bir zülfi-pərişan, ey şeyx!



49

Bəh necə hüsndür ki, can bəslər,
Ürəyi daima cavan bəslər.

Solmayan gənclik ona yaraşır,
Cənnət içrə bir ərməğan bəslər.

Qəddini fikrinə salıb bağban,
Gör necə sərvi-bustan bəslər.

Dilbərin surətilə saçından,
Gülü sünbüldə bir nişan bəslər.

Haq yerə feyz vermək üçün,
Göydə bir nurlu kəhkəşan bəslər.

Qara torpağə bir işıq saçaraq,
Günəşi yerdə hər zaman bəslər.

Qüdsi, tərif üçün nigarını, bax,
Ağzı içrə şirin zəban bəslər.

## 50

Dərdim elə bir dərd deyil izhar ola bilsin,
Ya hər sənəmə taqəti-didar ola bilsin.

Qorxum budur axır mən edim çaki-giriban,
Axır canıma qəsd edəcək yar, ola bilsin.

Kuyində fəqət hüsni təcəlla edər hər an,
Bir yer daha yox kim, belə aşkar ola bilsin.

Hər guşə tikansız gül ilə dolsa baharda,
Kim gördü xəzan içrə də gülzar ola bilsin?!

Qurban gedib aşiqlər əgər bunda cəfa yox,
Mümkünmü o canbəxş cəfakar ola bilsin?!

Xudbin əgər olmazsa o bihuş düşən şeyx,
Biz mey vurarıq ruyinə hüşyar ola bilsin.



## 51

Çox olarlar mahrulər əvvəl-əvvəl aşina,
Lütflər izhar edib də görsənərlər dilrüba.

Öylə ki, gördü səni bəndə salıbdır eşqdə,
Ülfəti atıb səbəbsiz ayrılarlar daima.

Hər gözəl simayə baxmaq səhvdir sevda ilə,
Üzdə hər hal göstərir kim əhdə etməzlər vəfa.

Gülşən içrə bülbülün şuri deyil bihudə heç,
O mənim dildarımı tərifə qaldırmış səda.

Mən necə üz döndərim bir astandan, kim budur
Orda dünya şahları üz sürtərək olmuş gəda.

Güllə bülbül şur ilə, mütrüblə saqi saz ilə,
Yar bəzmin süsləyib daim deyərlər mərhəba!

Xoş olar meyxarəlik zahirdə də, batində də,
Qüdsiya, zahidlər eylər hər əməldə bir riya.

52

Ahim göyə aşikar qalxar,
Ondan fələyə şərar qalxar.

Qoy bir gözələ verim bu canı,
Bundan ki, bir ahü-zar qalxar.

Yarın üzü, eşqi cilvələnsə,
Yüz fitneyi-ruzigar qalxar.

Rahatlıq üçün xəzan gözəldir,
Yazda bütün ixtiyar qalxar.

Bağbanı görüncə gül dərəndə,
Bülbüldən hər iqtidar qalxar.

Aşiq qanıdır çəməndə bir bax,
Hər lalə ki, dağdar qalxar.

Bir qönçə kimi qısılma, Qüdsi,
Bir gün aradan bu xar qalxar.



53

Xumar gözlə mənə bir dəm baxarsa nazənin canan,
Tənim titrər hərarətdən, düşər min dəhşət içrə can.

Onun nazı salıb şurə bütün xalqı bu aləmdə,
Amandır bir də mey şuru əlavə salmasın həycan.

Xəyalı hər yana baxsam edər cövlan xəyalımda,
Necə kim dalğalı suda edər ay şöləsi cövlan.

Rəqiblə söhbət eylərkən yarın didarına getmək,
Ona bənzər ki, bir təşnə su axtarıb tapa tufan.

Bu dünya çox sitəmkərdir, onun heç rəhmi yoxdur kim,
Həmişə od salıb eylər bir aşiq qəlbini büryan.

Nə qədri mən sağam səndən kəramət gözlərəm dilbər,
Öləndən sonra mahini nə xeyri var, suya atsan.

Əgər bəxt ulduzum gülsə sənin qarşında, ey Qüdsi.
Düşər xakə günəş göydən, olar torpağilə yeksan

## 54

Gözlərim üzünə nəzarə istər,
İstəməz nə günəş, nə nurlu qəmər.

Kimdir ki, qəminin şərarəsindən,
Yanmasın tənində onun can, cigər?!

Aşiqlik iddia edən gərəkdir,
Axtarsın dünyada vəfalı dilbər.

Gözəllər əgər çox sevərlər nazı,
Nazın da bir həddi olmazmı məgər?

Hünərə heç kəsdə bir rəğbət yoxdur,
Cəmaət axtarır ancaq simü zər.

Qapında bəndəlik eyləyir Qüdsi,
Bu dövlət etmişdir onu bəxtəvər.



## 55

Biganə əgər xoş gələn iş görsə də zinhar,
Fikr eylə, ürək vermə ona, olma tərəfdar.

Ömrüm də keçər, gül də keçər, saqi də, mey də,
Mümkünmü cahanda əbədi iş ola təkrar?!

Lütf ilə məlahət deyə fəxr eyləsə hər kəs,
Ancaq gülü bülbül deyərək düzmədə əşar.

Kim gördü bu gülşəndə deyən incə kəlamı,
Bülbül kimi cəh-cəh vuraraq qalmaya bikar.

Silabə verib didələri can ala canan,
Könlüm necə dözsün belə bir zülmə, a dostlar?

Ta bilməyə əğyar onun cövrini, susdum,
Xoşdur mənə, bu cövr-cəfa, olmasın izhar.

Nəfsin İsgəndər olub zülməti-təb içrə, a Qüdsi,
Eşq oldu həyat çeşməsi, Xızr oldu həvadar.*

56

Gözəllər qəmzəsi xunxar olubdur,
Sevənlər vasili-didar olubdur.

Nə məqsəd oldu bilməm ortalıqda,
Ki, gözlər sübhədək bidar olubdur.

Vurublar surətə yüz rənglə zinət,
Xəyaldan güzgüsə aşkar olubdur.

Verildi qəlbə əhdə sadiq olmaq,
Nigarın çöhrəsi gülnar olubdur.

Olub fərvərdinə dey bir bəzək kim,
Çiçəklər zinəti-gülzar olubdur.*

Olub can xərməni oddan kənarə,
Ki, canan atəşin rüxsar olubdur.

Tutub Qüdsi sorağ dünya və dindən,
Nişanı xaneyi-xümmar olubdur.



57

Xəbərsizə xəbəri mahiranə verməliyəm,
Rəqibimə ki, deyil aşina, nə verməliyəm?

Zəmanədən görərək min cəfa, vəfa tapdım,
Bu sirrdən yarıma bir nişanə verməliyəm.

Sənin məlahətinin misli yoxdur aləmdə,
Kimin ki, şübhəsi var imtahanə verməliyəm.

Gedək bağa bizi görsün o şeyda bülbüllər,
Ki, canımı gülə mən aşiqanə verməliyəm.

Sənin bu hüsnü lətafətlərinlə bir dəstur,
O qönçə ilə bu sərvi-rəvanə verməliyəm.

Səninlə söhbət edib, ləzət aldığım anı,
Bütün bu ömrə və ya bir cəhanə verməliyəm.

Bu çirkli xirqəni Qüdsi, təmizləmək lazım,
Onu sirişk ilə abi-rəvanə verməliyəm.

Afitab iqbal Şərqindən çıxıb güldü həyat:
Gülşənin eşqilə mürği-dil yenə açdı qanad.

Bu nə haldır Allah, Allah, asiman dönmüş nədir?
Hər zaman bir başqa şənliklə qurur yerdə busat.

Bir zamanlar mars qalıb heyrətdə keçdi ömrümüz,
Çüt şeş atıb tapmışam indi ələmdən mən nicat.*

Bir yerim vardır ki, burda dincəlib Nuh bir zaman,
Qorxmuram indi əgər dəryayə dönsə kainat.*

Bu gədalıqda əcəb yüksək məqamü rütbə var,
Tac qoyar qeyslərin başına zərdən qəlbi şad.

Rindlərə tənə vuran ol zahidi gəl indi gör,
Musiqi dinlər, şərabə meyl edər, istər murad.

Bəndəlik azadəlikdir, anlayar bu rəmzi bil,
Qüdsitək hər kim başından keçsə, göstərsə səbat.





Bu dövrandan bizə məqsəd olar hasil? Bu şəksizdir.
Onunla qəlbimiz yarə olar vasil? Bu şəksizdir.

Deyirlər ki, ömür durmaz keçər surətlə, ah-əfsus,
Bu sürətlə görən axır çatar mənzil? Bu şəksizdir.

Ölümdür aşiqin halı ona dirlik nə lazımdır?
Edərmi bəs qana qəltan onu qatil? Bu şəksizdir.

Onunçundur səvar olmaq ki, tez asan bitə yollar,
Olan varmı gözəl atla buna nail? Bu şəksizdir.

Yüz işkəncə çəkib dövlət qazansan da sonu yoxdur,
Açılmış bir kəsə aya, ağır müşkül? Bu şəksizdir?

Bir an içrə gedir badə ömür yarın həvasilə,
Olarmı bəs bu xoşbəxtlik bizə şamil? Bu şəksizdir?

Sözə qiymət qoyan yoxsa cahan içrə, görən Qüdsi,
Bu şairlik məqamında olar kamal? Bu şəksizdir.

Mey rəngi yarın lalə üzündən alar hər an,
Ney də od alar sızlayaraq odlu baxışdan.

Aləmlərə yüksəldi məlahətləri yarın,
Ulduzlar arasında salıbdır cədəl hər yan.

Bir boş dəvə səhradə gedərkən, nə əcəbdir,
Ardınca düşüb qafilətək getdi, könül, can.

İsmət ətəyin yırtdı Züleyxa, bu səbəbdən,
Oldu onun öz pərdəyi-namusu pərişan.

Bülbül yuva tikmək diləyirkən bu çəməndə,
Yaz keçdi, çəmən soldu, gəlib çatdı zimistan.

Sordun ki, nədir vəslinə naz, hiçrinə nalə,
Heyfa yarilə olmadı bu işlərə imkan.

Qüdsi, bu cahan dövlətinin payəsi yoxdur,
Kavusi-Keyin halına bax, ibrət al ondan.*





Həvayi-zülfü qoy olsun başımda hər ovqat,
Başım gedərsə bu yolda mən etmərəm fəryad.

Bu ömrüm içrə əsirəm, cəzası qatilimin,
Odur ki, axırı bir bəndə eyləmiş azad.

Könül ki, duydu bu dünyada ləzzəti-təcrid,
Nə qəmlidir əziyyətdən, nə kamdən dilşad.

Rəqibə vermə könül, başqa könlü incitmə,
Budur bizim şəriətə ancaq iki əsil bünyad.

"Könül ki, vermədi bir kəs, o qeyri incitməz",
Xoşam, bu sözləri öyrətdi bizlərə ustad.

Bahar zamanı açar lalələr qara torpaq,
Sənin ki, bar yoxundur necə qoyaq sənə ad?

Nə zıövqi var qəfəsin, ya torun, düşün, Qüdsi,
Ki, quşları özünə gör nə cəlb edib səyyad.

62

Niqab düşdü, yarın xoş hilalı oldu əyan,
Ayı görüb dedilər, bayram oldu, güldü cahan.

Busati-hüsnə məhəbbət sübutu söylədilər,
Unutdu varlığı gördükdə aşiqi-nalan.

Fələk də bilsə baxar tənə ilə öz-özünə,
Ki, nə məram ilə gəlmiş bu aləmə insan.

Gözəllərin şahı, zənciri-ədl edib zülfü,*
Məhəbbət ölkəsinə verdi ədlilə fərman.

Müəllim etmədi təlim eşqdən qeyri,
İlahi, sən onu saxla cəmii afatdan.

Nə qorxusu ola sərvin payız hücum etsə,
Ki, barı yoxdur əlindən gedə qala üryan.

Cahanda heç bir adam doğmamış pəri, Qüdsi,
Bu hüsni-dilbəri gördükdə qalmışam heyran.



63

Ruxi-alın necə nur saçdı bu şirinsüxənə,
Şöleyi-pürşərərin qalxdı ürəkdən dəhənə.

Nəzər əhlində salıb şur sənin cilvələrin,
Gör nə hal üz verəcəkdir səni qəlbdən sevənə.

Bu cahan içrə mənim başqa məramım yoxdur,
İstərəm ömr keçə şövqilə baxdıqca sənə.

Keyfə bax, fəsli-bahar oldu qənimət çağıdır,
Az zaman keçsə xəzan rəxnə salar bu çəmənə.

Canan olmazsa nə lazım mənə bu canü cigər,
Kim nə qiymət qoyacaq onda bu cansız bədənə?!

Göz, ürək olmasa bil ləzzəti-didar olmaz,
Necə ad qoymaq olar indi o peymanşikənə?!

Qüdsiya, səbr eləmək pirəhənə bənzər kim,
İtmişindən gələrək çatdı o beytül-həzənə*.

Nigarımın rəftarı da hər ləhzədə bir rəng alar,
İndi budur mənə onun həddən artıq səxası var.

Nə lütfünə bel bağlaram, nə qəhrindən narazıyam,
Çünki onun nə lütfünə, nə qəhrinə yox etibar.

Məcnun halın soranlara bu məlumat kifayətdir,
Səhra, Leyli karivanı, vəhşilər və cismi-nəzar.

Yar qaməti bir sərvdir, sərvi çəmən ona məftun,
Bu qamətlə zühur etsə aləm ona heyran qalar.

Naseh, səni dinləyərək ağlım ilə iş görərdim,
Əgər bu eşq bir anlığa versə mənə bir ixtiyar.

Hüma quşu kölgəsi tək tale üzə gülsə əgər,
Səadətə çatar zülfü kölgəsində yaşayanlar.

Hər eyş ilə aram olmaz bu Qüdsinin ürəyi bil,
Ancaq sənin eşqin ilə tutar onun qəlbi qərar.





Əgər bir başda eşqə şur yoxdur,
Deməк ki, ömrdə mənzur yoxdur.

Nə hasil sevgisiz qalmış ürəkdən,
Nə fayda gərçi göz var, nur yoxdur.

Məhəbbət cilvə eylər daima bil,
Gözəl sima üçün məstur yoxdur.

Məni zəncirə çəkməkçin darıxma,
Torundan qaçmaq üçün zur yoxdur.

Nə üzri zahidin var eşqi mənə,
Budur təqsiri kim məzur yoxdur.

Yolunda gözlərimdən su axıtdım,
Bu işdən qeyriyə məqdur yoxdur.

Səri-kuyində, Qüdsi, qaldı daim,
Onunçün cənnət içrə hur yoxdur.

Çox zamandan bəridir etdi fələk yarı cüda,
Saldı axır canıma gör necə möhnətlə bəla.

Yüz ümidlə səhəri gözlərəm hicran gecəsi,
Bəlkə peyğam gətirə səndən o xoş badsəba.

Heç də şad olma əgər gülsə sənə gövri-fələk,
Verəcək sonra yəqin min ələmü dərdi sana.

Nə olardı o gözəl bir dəfə də lütf etsə,
Bu qədər ki, bacarır zülmü sitəm, cövrü cəfa.

Hər zaman bir tərəfə sövq eləyir bəxt məni,
Bilmirəm qəsdi nədir, bu nə əməldir, nə cəza?

Ey deyə ki, kəsilib kuyi-dilaramə yolum,
Allaha yol tapar hər kəs ki, tuta rahi-fəna.

Qüdsitək qaldı xəcalət axırı hər kəsdən,
O adam ki, sitəm əhlindən umar əhdə vəfa.





Qədi-dildarə aşiqlər hər an şümşad söylərlər,
Bu boş təşbih edən şəxsə neçün ustad söylərlər?

Hər işdə bir nişan lazım, quru sözdə nə məna var,
Ayağı bənd olan sərvə neyə azad söylərlər?

Gözəl yarın cəfasında şikayətlər edər aşiq,
Əcəb haldır belə lütfə neçin bidad söylərlər?!

Ürəkdən yar eşqindən gələn hər qəm səadətdir,
Nədəndir bəs belə qəlbə hər an naşad söylərlər?

Məni mən eyləyir vaiz gedim meyxanəyə bir dəm,
Neçin qəlb dincələn mülkə xərababad söylərlər?

Yerə bica deyil, dünya üçün mərkəz deyirlər çün,
Hərə bir söz tapan dəmdə ona icad söylərlər.

Uyub sən zahidə, Qudsi, bu dünyada, dini tərk etmə,
Yolundan azmışa bəzən budur irşad söylərlər.

O zülfün üzdə, a dildar, titrəşib tökülər,
Baxıb ona güli-bixar titrəşib tökülər.

Külək əsir, nə edim? Qorxuram ki, zülfündə,
Rahatlanan bu dili-biqərar titrəşib tökülər.

Ləbin hədisi yazılsa mənim sözüm dərhal,
Qələmdə olmaz o asar, titrəşib tökülər.

*Xumar gözünə baxınca itirmişəm özümü,*
Əlimdə cami-mey aşkar titrəşib tökülər.

Yanar şamın ürəyi can verəndə pərvanə,
Onun da göz yaşı biixtiyar titrəşib tökülər.

Bahar hicrini bilcək çəmən gözəllərinin,
Üzlərində bəzək hər nə var, titrəşib tökülər.

Cigər odu əridər qəlbimi necə, Qüdsi,
Yarın üzündə tər oynar, titrəşib tökülər.





Bihünər əlləşəcək başqası bifər olsun,
İstəməz bəs nə üçün özu hünərvər olsun?!

Çox əziz var quyuya cahü cəlal ilə düşər,
Qeyrə aldanma əgər doğma bərədər olsun.

Kami-dil söylə nədir? Yoxsa, şikayət kimdən,
Kimsəni istəmərəm qəmli, mükəddər olsun.

Yaxşılıq *hasil* olar *zahiri çirkindən* çox,
Qoy büti məhv eləyən dəhrdə Azər olsun*.

Hilmü ehsan yaranar gözləri toxluqdan bil,
Rüşvətə meyl edər ol şəxs ki, müztər olsun.

Tərinin dövrü ilə fitnə düşər yar üzünə,
Bavərim yox səbəbi kövkəbü əxtər olsun.

Qüdsi, tərif edər idi səni gər bilsə idi,
Necə bu hüsilə bu ruh müsəvvər olsun.

Dünyada hər kim aşiqi-rüxsareyi-gülgün olar,
Sarı rəngli üzü daim göz yaşından pürxun olar.

Bax məcnunun didəsində cilvələnən bu qan rəngi,
Leylinin al yanağının əksidir ki, əfzun olar.

Saçlarının zülmatında nurdan qaçan o şey nədir?
Bu zülmata öyrənənlər axı ona məftun olar.

Sevdalılar danlaq altda çatmaq istər bir rütbəyə,
Qəlbi sınmış aşiqlərin əhvalı çox məhzun olar.

Ünqa kimi bu dünyadan axtaracaq izlət küncü,
O adam ki, bəxti ona həmişə rəhnümün olar.

Sonsuz qəmdir dilşadlığın vasitəsi, çarə budur,
Xoş ona ki, həmişə bu dairədən birun olar.

Qəddin şerin ölçüsüdür, nazü qəmzən qafiyəsi,
De bunlarsız Qüdsi təbi, necə lətif, movzun olar?!





Az-az ruhun meyli artar, sonra dönüb sevda olar,
Damа-dama cəmləşərək axırda bir dərya olar.

Hər sübutu heçə vuran yarın qara zülfünə bax,
Ürəklərə hər bir teli şirazəli qəba olar.

Zahidlik və təqva mənim töhmətimə səbəb oldu,
Hər kəs yaxşı ad axtara axır belə rüsva olar.

Çox-çox şeylər gizli qalar aşkar olan əlamətdə,
Gizli olan aləmdəsə çox əlamət peyda olar.

Həqiqətdə heç bir nazın fərqi yoxdur, niyazlardan,
Məhəbbətdə xas sifətdir ki, daim biperva olar.

Qəlb aynası arzunun gözəlinin cilvəsidir,
Çox göz var ki, bircə dəfə baxmaqdan nabina olar.

Qüdsi, şerin bir qədər də yüksələrsə qorxum budur:
Fəvvarə tək qalxıb düşər hər zərrəsi yeğma olar.

Söz düşəndə qıvrım saçdan bilmirəm –
Neçin mənə hücum edir dərdü qəm?!

Qəmlə xoşam həsrət odu yananda,
İlk şölədən yanıb külə dönmüşəm.

Səbr etməli aşiq gərək, əsir quş
Çalışdıqca olar daha tor möhkəm.

Mələk bica tənə vurmur, bilir ki,
Hər bəlanı törətmədə bu adəm.

Belə fürsət əsirə çox az düşər.
Qəfəs zəif, bülbül şurda, gül bərhəm,

Öz ovundan yara almaq nə xoşdur,
Əvəz etməz bu ləzzəti heç mərhəm,

Yar qaməti qiyamətdir sus, Qüdsi,
Qiyamətə düşdü deyən bu aləm.





Aləmə ol işi kim, ləşkəpi-xunxar eylər,
Bircə göz vurmağilə qəmzeyi-dildar eylər.

Müddəilər ki, bu rüsvalığı şərh eylərdi,
İndi gör bu hünəri düşmənim iqrar eylər.

Qəmimin şərhi nigarı daha sərt etdisə bəs,
Nə ümidlə bu könül hali-dil izhar eylər?!

Yarı əğyar ilə görmək ki, fəraqdan pisdir,
Kim qəfəsdə oturub fikri çəmənzar eylər?!

Can qəfəsdə, diləyən rahəti, ol quş kimidir,
Kim qəfəsdə oturub fikri çəmənzar eylər?!

Dilbərim vədə verər sevgiyə, eylər məhrum,
O vəfa eyləməyən bəs niyə azar eylər?!

Qüdsi istər ki, torunda düşə daim bəndə,
Bu duanı gecə-gündüz dili təkrar eylər.

Cahan əhli bu iczilə özünü zənn edər sultan,
Sözü "düzlük" olar lakin oğurluqdur işi hər an,

Sənə möhtac olan dəmdə əgər baş, qul olar, lakin,
Ona düşsə işi dərhal vurar dəm kətxudalıqdan.

Başında bir papaq yoxdur, həmişə təxtü tac istər,
Saray, dövlət dilər amma gəzərkən ac, susuz, üryan.

Səhər durcaq deyər şahəm, mənimdir söyləyər aləm,
Günəş batcaq qapı-qapı gəzib istər çörək nalan.

Edər zülmü sitəm, lakin hünər söylər buna hərdəm,
Gəzər işsiz və avarə, deyər nə xoş keçir dövran.

Vüqar ilə dolansan sən təvazö göstərərlər bil,
Təvazö eyləsən dərhal edərlər üstünə tüğyan.

Sən ey Qüdsi, uzaş cəncəl bu dostlardan uzaq ol,
Nəhayət, ömrünü badə verər bu hiyləgər düşman.





Ey könül, müjdə sənə, arzu müyəssər oldu,
Fələk ol çəkdi cəzadən sənə yavər oldu.

Doğdu hicran gecəsindən necə gör sübhi-vüsal,
Şükr olsun belə gün indi müqəddər oldu.

Sən tutursan əməli, biz əməli ey zahid*,
Deməli, taətimiz döndü bərabər oldu.

Belə bir rəmzi də var: Kəbədə büt qırmaq üçün
Mustəfa çiyni Əli payinə mənbər oldu.

O adam ki, bu vilayətdə verib dinə rəvac,
Ürəyi sidq ilə tək Allaha müncər oldu.

Qüdsinin isminə bax, çıxmamış əqlü dindən,
Hər yerə qoydu qədəm şöhrəti digər oldu.

Qüdsi, Məcnunə düşüb Leyli cəmalindən işıq,
Cilvəsindən necə gör dəhr münəvvər oldu.

Ah o gündən ki, fərəh yurdu bizim mənzil idi,
Necə tez keçdi o günlər ki, murad hasil idi.

Bilmədi qürrələnən qəlb cavanlıq qədrin,
Bilmədi eşq nədir, fitnələrə ğafil idi.

Hanı ol şur ki, başımda yaranırdı hədsiz,
Hara getdi o şətarət ki, mənə şamil idi?!

Yüz ümidlə aparır yar tərəfə şövq ilə,
O həvəs ki, aramızda görüşə hayil idi.

Yoxdur əfsus bu xoş güzgüdə yarın əksi,
Noldu ol surəti-ziba ki, könül mayil idi?!

Sürdü dəryadə gəmi söylədi tez-tez gəmiçi,
Hanı ol dalğa ki, hər zərbəsi xoş sahil idi?!

Qüdsiya, keçdi ömür, söndü deyən ilahamın,
Hanı ol nüktə ki, təbin ona çox qabil idi?!





Sənin zülfündə bənd oldu könül tərk etdi dünyanı,
Nədir azədlik bilməz əsiri-bənd olub canı.

Deyil bihudə giryanlıq, yəqin bir sirr var bunda,
Bu sudur söndürən qəlbimdə çünki nari-suzanı.

Mənə qasid dodağından hədis nəql etmək istərkən,
Həmən dəm qönçətək bəndə düşüb bağlandı dastanı.

Könül istədi sevdadən bir az asudə olsun, ah,
Zavallı səy qıldıqca bir az da artdı həycanı,

Nigarım üzdən atdıqda niqabı bəzmdə birdən,
Ucaldı asimanə hamının heyrətlə əfğanı.

O əyri qaşların saldı cahanə şurişü ğovğa,
Əcəb həycanə salmışdır o bal ləblər bu dövranı.

Həmişə xalqa sevdadən nəsihətlər verən Qüdsi,
Özü möhtaci-pənd oldu, yetiş ey eşq sultanı!

Hansı yerdən görəsən afəti can gəlmədədir?
Unudubdur özünü, Allahı, yan gəlmədədir.

Beldə qaş xəncəri, kirpik oxunu əldə tutub
Gözlərilə tökəcək, indicə qan, gəlmədədir.

Zülfü Məcnun eləmiş könlümüzü sevdadə,
Kakili ətr saçıb, sərvi-rəvan gəlmədədir.

Bu gözəllik ola bilməz yarana torpaqdan,
Bu pəridir ki, səmadən nigarən gəlmədədir.

Ya nəhaldır ki, bitib qəmzə gülüstanında,
Ya maraldır dolanıb külli-cahan gəlmədədir.

Fikri yoxdursa əgər yandıra aşiqlərini,
Bəs neçin al yanağı lalənişan gəlmədədir.

Qüdsi, ol afəti-can cilvə edir, qorxum var,
Eşq sərgəştəsinə verməz aman, gəlmədədir.





Mənim o məhliqa yarım hüsnü edib fəna gəlir,
Başdan-başa qarə geyib sanki tutub əza gəlir.

Sünbülündə dağıntı var, təravətdən düşüb gülü,
Baharının arxasından sanki payız, bəla gəlir.

Qarşımızdan keçən zaman gördük daha rövnəqi yox,
Hər tərəfdən eşitdik ki,belə qərib səda gəlir:

“Şahlar şahı, gördük necə əldən verib təxtü tacı,
Qəribə hal deyilmi ki, indi misli-gəda gəlir?!”

Sultan ikən bəndə olub, zəlil olub əziz ikən,
Bəs nə üçün bu bazarə belə üzü qara gəlir?!

Bu aləmdə çoxları var – zülmü cəfa sənətidir,
Şübhəsizdir nəhayətdə ona qəhri xuda gəlir.

Qüdsi, tanı bu hamandır, saldı bəlayə aləmi,
İndi, özü bəladədir aldı əcəb cəza, gəlir.

## 80

Gözlərimdə arizin hər dəmdə cövlan eylədi,
Hər yerə baxdımsa ruyin qəlbi büryan eylədi.

Saçların heç də pərişan olmayırsa bəs neçin,
Saldı bəndə ruhumu hərdəm pərişan eylədi?!

Vəsli-hicranın əgər zahirdə zövqi-dərdi var,
Eşq, sevda onları gördüm ki, yeksan eylədi,

Təkyə qılmaq taətə bir bəndəlikdir, şübhəsiz,
Küfrdir zahid sənə hər kəs ki, iman eylədi.

Ülfətin cəzbinə bax ki, bağda bülbül naləsin,
Atəşi onlar bizə misli-gülüstan eylədi!*

Sən qiyas et yar üzün Nəmrud oduyla gör necə,
Atəşi onlar bizə misli-gülüstan eylədi!

Yox təəccüb Qüdsiyə bir cami-mey verdikdə o,
Meykədə astanəsində canı qurban eylədi.



## 81

Yenə bülbüllər əcəb başladılar şuru nəva,
Eşqdən qissə açıb söylədilər min məna.

Zahiri surətdə eşq əhli nəzər salmaz heç,
Üzünə baxmaq ilə qəlbdə görər başqa səfa.

Belə bir aləmə dil verməyin heç faydası yox,
Kimə dil verdi könül sevgilidən çəkdi cəfa.

Rəsmidir aşiqə rüsvaçılığı aləmdə,
Necə zahidlər üçün adət olubdur təqva.

Hicrə dözdüm gözəli vəslinə ümmid edərək,
Ortalıqda əzilib tapmadım heç dərdə dəva.

Onların ki, var idi dilbəri, çox gördüm mən,
Daha çox canlarını sardı qəmü dərdü bəla.

Qol-qanadsız bu ürəklər ki, görürsən Qüdsi,
Uçdular eşq fəzasında əcəb misli-hüma.

Ləzzətin şövqilə hər kəs vəsli-canan istəyər,
Nəfəsini təmin üçün eşq əhli imkan istəyər.

Dostu yad etdikdə, düşmən qorxusu yaddan çıxar,
Çünki sərvərlik həmişə şövkətü şan istəyər.

Ruzigar cövrilə əğyar tənəsi, hicran odu,
Aşiqi Məcnun edib qəlbini al qan istəyər.

Ey, mənə "hər müşkül iş səbr ilə asandır" – deyən,
Eşq müşkül dərddir, dərmanə Loğman istəyər*.

Rəhnüma oldu, dəlilsiz çıxdı azərdən Xəlil*,
Çünki eşqin varlığı hər sirri pünhan istəyər.

Qəlb yarandı, arzular doldu qəlbə, çünki eşq,
Atəşi-Nəmrud içində xoş gülüstan istəyər.*

Vermə işrət fürsətin əldən bacarsan Qüdsiya,
Eşq aşiqdən həmişə əhdü peyman istəyər.





Boylə qaşla qamətə etsən nəzər,
San qiyamətdir olub şəqqül-qəmər.

Var gecəylə gündüzün bir adəti,
Olmaz onlar bir-birində cilvəgər:

Ağ üzilə qapqara zülfü onun,
Gecəni gündüzlə etmiş həmsəfər.

Başqa aləmdə gəzər aşiqlərin,
Gözləyər, bitməz gecə, gəlməz səhər.

Bağ, meşə, bostan, çəmən, gülşən ki, var,
Cümləsi eşqin suyundan dirçələr.

Mey içəndən öyrənin hüşyarlığı,
Sərxoş olmaqdan ayıl, bəsdir yetər!

Varsa, Qüdsi, cazibəyi-qəlbin sənin,
Yetgilən canana candan bixəbər.

Mən özüm də bilmirəm işlər nə cür əncam tapar?
Xalq içində hörmətim yox, həm də haqdan şərmsar.

Hər kəs haqdan əl üzə, hərgiz qovuşmaz xalqa o,
Xalq ilə birləşsə olmaz heç zaman haqdan kənar,

Darda qaldıqda çalışdım, vermədi səyim səmər,
İstədim bir iş görüm, əngəl törətdi ruzigar.

Məşğul oldum eyş ilə bu dünyada qafil olub,
İztirabü möhnət etmişdir məni zarü nizar.

Can uyubdur qəflətə, tən hissə olmuşdur əsir,
Gör şahın zəfin ki, bəndə əldə etmiş ixtiyar,

Gərçe eybim çox, hünər yoxdur, budur eyni hünər,
Olmuram mən lütfi-hoqdən qeyriyə ümmidvar.

Fəxrü istiğna zəlalətdir, inan, həm ehtiyac,
Qüdsiya, sən fəqrilə et qarşısında iftixar.





Bu nə zülfdür bitməyir söhbəti,
Ki, idrakın artır ona heyrəti.

Bu üzdürmü, aydırmı mən bilmirəm,
Yayılmış bütün aləmə şöhrəti.

Qəza Yusif hüsnündə öz fırçasın,
Edib imtahan çəkdi bu surəti*.

Dodaqlardakı rənglə həmrəng olub,
Çoxaldı onun hüsnünün zinəti.

Əqil, ixtiyar, iş görən bir deyil,
Ki, tədbirə yox, heç kəsin cürəti.

Nə xoşdur əgər bir yerdə olsa cəm,
Qoca hümmətilə, cavan qüdrəti.

İşi, Qüdsi, təmkinlə çatdır başa,
Tələsməklə toxir pozar niyyəti.

86

Qarşıda gül, mütrübü mey, təmtəraq,
Sahibi-məclis oxuyur xoş damaq.

Bəh nə büsatdır bu sevinclə dolu,
Qoy ola bədgöz bu busatdan iraq.

Cilvələnir gül elə bir hüsnilə,
Turdə Musa odudur sanki, bax!

Zülfü ərə gül üzü, dilbərlərin,
Sanki yanır zülmət içində çirağ.

Bu nə nizamdır ki, nə sülh var, nə cəng,
Aləmi təşvişə salıb bir uşaq.

Ərz eləyək bəs kimə bu dərdi biz,
Hər gecəmiz keçmədə məhşər sayaq.

Qüdsi, sən israr eləmə yarə çox,
Zorla o dilbərdə yaranmaz maraq.



87

Cövrün ilə ürəyim dopdolu qandır hələ də,
Eybi yoxdur belə cövrün mənə şandır hələ də.

İstəmirsənsə də yar olmağa hərçənd mənə,
Çeşmi-biçarə yolunda nigarandır hələ də.

Tənədən qeyri sözü dinləmədim kuyindən,
Adı bu mərhələnin virdi-zəbandır hələ də.

Yaz ümidlə olub nəğməsəra bülbüllər,
Duymayırlarmı məgər fəsli-xəzandır hələ də.

Mən ki, gənclikdə qocaldım, zəif oldum qəmdən,
Yüzü gər keçsə də yaş, qəlb cavandır hələ də.

Nə sevincdir ki, bu cür şur dolu məclisdəki şam,
Yanaraq ağlasa da xəndəzənandır hələ də.

Qəlb dildar ilə birləşməsə, kam axtarma,
Qüdsinin qəlbi budur, yar həmandır hələ də.

88

Saqiya, dur yenə sübhün yaxası çak olsun,
Yandırıb suyla havanı yerə səp pak olsun.

Məşəl axşam çağı yandır günəşin şəmindən,
Sübh saç nurini əflakə şərərnak olsun.

Oxumaq zövqün əgər varsa oxu türfə məqam,
Dinləyib dərdli könül bəlkə fərəhnak olsun.

İstəsən öldürəsən abi-həyatdan ver içim,
Ya et azad yerim qul kimi fitrak olsun.

Bütlərin zülfünə tax həlqeyi-zünnari bu gun,
Rəxnəsindən dağılan səbhəvü misvak olsun.

Nə qədər bağlanacaqsan bu cahan qeydinə sən,
Qəlbini bənd eləyən dilbəri-çalak olsun.

Qüdsi, kami-dilü din istəmə dünyadan sən,
Qismətin bütkədə, ya məzrəeyi-tak olsun.



89

Bilmirəm bu dili-zarimdə nələr var yenə də,
Hansı bir zülfi-pərişandan əsər var yenə də.

Səpilir hər tərəfə gülşəni-kuyindən ətir,
Bülbülün gülşənə fikrində səfər var yenə də.

Qulağım səsdədir əlan belə zənn eyləyirəm,
Yardən elçi gəlib tazə xəbər var yenə də.

Çəkirəm ah salıb yadə o sərvin boyunu,
Vadiyi-eymən əra narü şəcər var yenə də.

Arxalanma belə bir yolda gözə, qəlbə Kəlim,
Bu cürə əl və əsa ilə xətər var yenə də*.

Qalx, mərdanə təpik vur ki, uçulsun bu hasar,
Qeybdən ta açıla sirrli dər var yenə də.

Qüdsi, idrak şamı az şölə verir, olmaya ki,
Bu qaranlıq gecədən sonra səhər var yenə də?

90

Bu nə üzdür ki, şur salmış cahanə,
Salıbdır fitnələr cümlə məkanə.

Veribdir badə bu xaki-tənimi,
Bu odlu qəlbdən əşki-rəvanə.

Dünən yar kakilindən söhbət oldu,
Həvasindən təravət gəldi canə.

Bu nə zülmü sitəmdir qəlbi yaxdı,
Vurub xəncər salar od aşiyanə.

Bu sevdadən çoxu olmuş xəcalət,
Gedib Sürxabi-Təbrizdə nihanə*.

Nizaminin yeri eyvanda dardır,
Məgər Dehlidən heç qalmış nişanə?!*

Bax hüsnün cəzbinə, təsiri-eşqə,
Necə Qüdsini də salmış fəğanə.



91

Hümmət heç durmaz həvəslə yanbayan,
Kim görüb şəhbazi milçəkdən qaçan?!

Ey əsir quş, çırpınıb, qır, azad ol,
Bil ki, yox salxax qəfəsdə tab-təvan.

Eşq əqlin pəndinə möhtac deyil,
Bağlamaz coşğun seli çör-çöp, tikan.

Hər kəsə gizlin qəribə halidən,
Gah olur bir çox əcayib iş əyan.

Kamrandır çox ləyaqətsiz rəqib,
Çox da layiq kəslər olmaz kamran.

Yandırar əvvəl ağacda atəşi,
Sonra ümmidlə verər min ərməğan.

Qüdsi, axşam vaxtı yoldan azmışa,
Dərd olar zənglə uzaşsa karivan.

Mən bilmirəm işimdə nədir xeyr ilə ziyan,
Öz arzımın əleyhinədir hər işim inan.

Bais olar təlaşə bu bihudə iztirab.
Hər bir əməl özü yetişər bildiyi zaman.

Cananım "öl" desə, ya da göstərsə mərhəmət
Şükr eylərəm bu nemətə xoşluqla mən haman.

Bir bivəfa sənəm yolunda ömür getdi badə, ah,
Etdi xəcalət əhdimə sadiqliyim aman!

Bel bağladım vüsalə, məni əzdi intizar.
Qəflətdə qoydu canımı bu hicrilə güman.

Çoxdur çəməndə künci-fərağət, nə yaxşıdır,
Biz bir qəfəs tapıb onu etsəydik asiyan!

Qüdsi, tükəndi səbr daha yox ürəkdə tab,
Əksiltməyir cəfanı hələ yari-cansitan.





Dün gecə meykədədə bir belə səs etdi xruş,
Biliyi, huşu burax, al ələ et badəni nuş!

Məclisin əvvəli məst olsan əgər heç qorxma,
İki cam içsən əlavə gələcək başına huş.

Hər tərəf cilvə edər bax əbədiyyət gözəli,
Hər tərəfdən çatacaqdır sənə peyğami-süruş.

Mey içən yarın üzü gül kimi verdikdə şəfəq,
Verdi qəlbimdə, gözümdə su ilə atəşə cuş.

Gündə min zülm edilir mərkü riyadən xalqa,
Degil insaf, ədəb şərti otursan xamuş.

Xalqa səndən o şikayət eləyən vaizə bax,
Ki, çıxırdı özü meyxanədən axşam bihuş.

Qüdsinin sözləri ətrafə ətir saçmadadır,
Hər gecə çünki xəyalinlə olur həmağuş.

96

Nə cünundur ki, ağıl ondan alır dərs müdam,
Bu məhəbbət necə tordur ki, düşən tapdı nizam.

Əridib buteyi-həsrətdə sənin mehrin odu,
Aşiqin qəlbini bir ləhzədə etmiş aram.

Vəslinin incisini ağlamayanlar tapmaz,
İnci tapmaz dənizə cummayan aləmdə tamam.

Eşqdir əsl qərəz, bəzən olur bu yolda,
Xas olan dalda qalır, öndə gedir məstü avam.

Göz, qulaq, ağzım hamı bir-birinə oldu rəqib,
Bu vəziyyətdə necə şərh eləyim dərdimi tam?!

Göz ürək qanına batdı ürək ondan qan olub,
Qana-qan yazdı deyən müshəfi-ruyində kəlam.

Qüdsiya, şam kimi aşiq gülərək ölməlidir,
Ki, bu yerlərdə qəbul olmaz inan aşiqi-xam.



97

Eşqdir can cövhəri, əvvəl odur, sonra həyat,
Eşqdir əsli-təbiət, yoxsa puçdur kainat.

Müşkül isə qeyrdən etmək kənar yar qəlbini,
Bəs neçünmiş onda bunca əhdü peyman, etimad?!

Yaxşını pisdən ayırd et, ey əzizim, hər zaman,
Yaxşı yolla get həmişə, pisdən eylə ehtiyat.

Sən nə məğrursan cəlalə, bir gəda mislindəsən,
Dövlətin uğrar süqutə, beşcə gün tutmaz səbat.

Vermək olmaz dil cahanda məhvə məhkum şeylərə,
Artıq olsa iş, çıxar yaddan ədayi-vacibat.

Qüdsiya, xofü xətərdən dəfələrlə söylədim,
Eşqdir can cövhəri, əvvəl odur, sonra həyat.

Xilqətindən insanın olmazdı hərgiz can qərəz
Olmasaydı dünyada bir surəti-xuban qərəz.

Şam alışdı od tutub pərvanələr yansın deyə,
Oldu güllər şöhrətiyçin bülbüli-xoşxan qərəz.

Hər kəsin cismində can var, nisbəti canənədir
Can sözündən olmuş ancaq aşiqə canan qərəz.

Gül üzündən qəlbimin ayinəsi tapmış cila,
Etmək olmaz bundan ayrı şey o məhrudan qərəz.

Bir bütüm var, bütpərəstin heyranam mən felinə,
Kim neçin olmuş ona bu surəti-bican qərəz?!

Hər kəsin dildarı görməkdə xüsusi fikri var,
Etməmişdir badəni bu məclisi məstan qərəz.

Ta həvasü əql vardır, Qüdsiya, bil yoxdur eşq.
İntizami-məmləkətdir, varsa sultandan qərəz.





Küfrilə imanı yəqin,
Birgə yaratmışdır, xuda,
Kim xətti oldu dilbərin,
Parlaq üzündə cabəca.

Tən fitnəvə olmuş hədəf,
Can zülmilə olmuş tələf,
Bu söz yayılmış hər tərəf,
Xeyrəl ümur ovsətəha[1].

Hər təbdə bir zövq olar,
Hər pəstdə bir fövq olar.
Ləbtəşnədə bir şövq olar,
Çayda su görsə bərməla.

Qəlb eşqə olmuşsa vətən,
Qorxarmı heç bir fitnədən?
Min fəxr ilə uçub həmən,
O baş vurar tufanlara.

Xalı o cananın əgər,
Olmazsa gözdə cilvəgər,
Bir nöqtəyə bənzər nəzər,
Kim səfhədə düşmüş xəta.

İsraqilər, məssailər,
Boş-boş durub bəhs etdilər,
Yanlış yol ilə getdilər,
Esqə olarkən asina.

Qüdsi, canın büryan olar,
Əqlü cünun yeksan olar,
Təbində sərgərdan olar,
Şeri bu cür etsən əda.

[1] Ərəb atalar sözüdür: Yəni hər işdə orta vəziyyət xeyirlidir (*M.S.*)

Çıxdı üzünə sənin cavan, xət,
Fitnə deyə yazdı asiman xət.

Ağzın kimi bir qəşəngcə nöqtə
Heç kimsəyə etməmiş əyan xət.

Gün kölgədə salar həmişə alta,
Zülfünlə olubdu sayəban xət.

Gör bağda çəkib qılıncı səbzə,
İstər ki, tökə yerə o qan xət.

Hərdəm baş əyib qulağa söylər,
Keyfiyyəti-halını nihan xət.

Bənzər xəzanın başı bəharə,
Verməz o gözəlliyə ziyan xət.

Dilbərlərin hər nə xətti varsa,
Qüdsi, hamısı ürəkçalan xət.





Mən ki, rüsva olmuşam, hər sirrimiz olmuş əyan,
Aşiqin qalmış ümidi Allaha naseh, inan!

Arzu etsən əgər cənnətdə qəsri, yan oda,
Yar kuyində olan aşiq gərək yansın hər an.

Fərq edən cananı candan çox gözəl söz söyləmiş,
Qaç yalançı nəfs əlindən, qoy oda düşsün bü can.

Vəsli-yarə meyl edən aşiq şikayət eyləməz,
Çünki bir qəlbə sığışmaz mehr ilə qəhr heç zaman.

Saqiya, torpağıma su tök ki, od qalxsın göyə,
Su dirildər hər şeyi, var onda atəşdən nişan.

Vəslə manedir cahanda gördüyün hər vasitə,
Yarımız da əhdinə qılmaz vəfa, verməz aman.

Qüdsiya, bir camdən canda bu od-atəş nədir,
Kim görüb səyyarəni olsun günəş, ya kəhkəşan?!

Bu nə məclisdir ürəklər açılır onda tamam,
Yox ikən cəngü müğənni olunur rəqs müdam.

Qara saçdan gözəl üz başqa şüa almadadır,
Bu nə zülmətdir işıq tutmadadır onda məqam?!

Hər şeyin xilqətinin illəti eşq oldu, fəqih,
Niyə bəs mən eləyirsən bizi ondan ey əvam?!

İndi kef çək ki, haram oldu bu bayramda oruc,
Görünəndə təzə ay xalq eləyər toy-bayram.

Yetişər oylə çətin fəsl nəhayət bir gün,
Bulutun dayəsi tifli-çəmənə verməz cam,

Mən demişdim bu bəladan çəkilim bir kənara,
Mümkün olmur eləyim könlümü öz hökmümə ram.

Qorxmuram tənə edə bir dəli, aqil olana,
Ya da, Qüdsi, qoca bir püxtəyə irad edə xam.





Bir niyaz ki, sonu puçdur, o niyazdan nə çıxar
Sənə sirri nə verim ki, edəsən sirrimi xar.

Qəlbi eşq ilə dolu şəxsə məlamət yaramaz,
Eşqi insana verib çünki böyük sənətkar.

Xətti-hikmətdə başım mərkəzə pərkar kimidir,
Mən qulam, sən isə bir hakimi-alimiqdar.

Sənə qurban olum ey saqi, ömür keçdi hədər,
Canımın xərmənini odla o mayeylə nolar!

Zülm edir gərçi zəmanə bizə yox eybi bunun,
Gəl sənə ta ki, edim bir neçə sirri izhar.

Dini atdıq necə gör tərk elədik dünyanı da,
Qoyduq hər pis şeyə şərin adını, etmədik ar.

Yar qəm versə yarar, neylərəm əğyar qəmini,
Qüdsinin qəlbini oxşar bu bədii əşar.

Düşüb çölə, daha lalə ürəkdə min bir dağ,
Məgər itirmişi vardır ki, tutmuş əldə çirağ.

Gedib gül əldən, əcəb haldadır yazıq bülbül,
Nə hicrə səbr eləyir, nə edir gülünü sorağ.

Məlamət etmə mənə, yoxmudur sənin xəbərin,
Nəsihətin sənə yükdür, mən isə ondan irağ.

Həmişə gözlərə ver yarın, hüsnü ilə cila,
Bu cür bənəfşəvü badamdır əlaci-dimağ.

O hansı güldür özündən hazırlayır gülşən.
O hansı sərvdir ondan bəzək tapıbdır bağ?!

Bu dövlətin hamısı bağlıdır qəra zülfə,
Hüma qanadlarını gör necə qırıb qara zağ?!

Şikayət etmə, şükür qılıb bu cövrə, ey Qüdsi,
Bu canını elə sən yar pəyaminə iblağ.





Heyfdir əhli-vəfa qəlbi bu gün çak olsa,
Heyfdir yar əgər zalimü bibak olsa.

Şəfəqindən bir üzün olmasa aləm rovşən,
Heyfdir ay və günəş zinəti-əflak olsa.

Elə bir gözdə ki, min hiylə riya cilvələnir,
Heyfdir boylə gözə baxmağımız pak olsa.

Qoy ayaq qəlbimizə, didəmizə, ey dilbər.
Heyfdir cilveyi-nazik hədəfi, xak olsa.

Öylə yer yox ki, qaçam, tapsam əlindən imkan,
Heyfdir ov asılıb siqləti-fitrak olsa.

Qarşıda bülbülü gül, mütrübü saqi, meyü cam,
Çox gülüncdür bu zaman qəlb ələmnak olsa.

Yaxşı məclis qurulubdur hamı şadlıqla gülür,
Heyfdir, Qüdsi bu cür bəzmdə qəmnak olsa.

Heyrətlə baxır arif olanlar bu cəmalə,
Həsrətlə düzülmüş yoluna nərgisü lalə.

Aşiqlərinə bax necə təşvişə düşüblər,
Göz tikmədədirlər hamı ümmidlə vüsalə.

Bir cilvə qıl, ey nazlı mələk, gərçe bu cilvən,
Bais olacaq dünyada min cəngü cidalə.

Göylərdə tamaşana mələklər düzülüblər,
Heyran qalıram səndəki bu cahü cəlalə.

Hicrində hərifIər qan içir mey əvəzində,
Məclisdə gəzir əldən-ələ qanlı piyalə.

Kirpikləri qan-qan deyir heç arxayın olmam,
Qəlbim deyən ondan gələcək gəlsə zəvalə.

Bir qiblədən ötrü belə sərgəştəlik etmə
Yet, Qüdsi, bu mehrabi-ibadətlə kəmalə.





Vəsli-zövqün artırar aşiqlərə rəngi-fəraq,
Dönməmiş əvvəl hilalə bədr olubdur ay haçaq?!

Qaş misalında nə varsa dünyada kəc görsənər,
Çünki bu ali bina əslində olmuş əyri tağ.

Çeşmi – səyyad, xalları – dən, zülfü – tordur, dilbərin,
Ovlamaqçın aləmi, qurmuş məharətlə duzaq.

Atdığın oxlar, nigara, qəlbimin dərmanıdır,
Verdiyin zəhr eyləyir aşiqləri şirin məzaq.

Yar – saqi, mövsimi-gül, içməyim mey neyləyim?
Zahid, insaf et, bu mövsimdə necə biz boş duraq?!

Dost yatıbdır mey içib asudə, düşmən – bixəbər,
Fürsəti fövt eyləmə, çox az düşər bu ittifaq.

Yellədikcə atəşi yanğın daha şiddətlənər,
Çarə xamuşluq olur, Qüdsi, yananda iştiyaq.

Gün, üzünü gördü büründü səhab,
Ay üzünə çəkdi buluddan niqab,

Hüsnünə nəzzarə müyəssər deyil,
Baxmağa çün mane olar afitab.

Qaldım uzaq vüsləti-didarına,
Firqətinə qalmadı qəlbimdə tab.

Səbr elə, ey dil, bu acı hicrana,
Səbrilə güllərdən alarlar gülab.

Qəlb vuranda gəl elə imtahan,
Göz və ürəkdən çəkilir abü tab.

Söylə ki, təqdirə nə tədbir var?
Eşqə ağıldan ki, verilməz hesab.

Qüdsi, bu əyyamda umma məram,
Hər iş üçün birliyi et intixab.





Yarəb, nə edibdir mənə dövran Qarabağda,
Etmiş məni pamal bu hicran Qarabağda.

Tiflisdə də mən günlərimi qəmlə keçirdim,
Olmuşdur halım indi pərişan Qarabağda.

Fərhad ilə dağdır gözümə görsənən hər şey,
Düşmür ələ Şirinlə gülüstan Qarabağda*.

Çox qorxuram əl çatmaya ol daməni-yarə,
Olsun həm əcəl dəsti-giriban Qarabağda.

Qəlbimdə coşar qan, vətəni yada salanda,
Gündüzlə gecəm olmada yeksan Qarabağda.

Yarəb, sən özün eylə xilas – qürbətə düşdüm,
Olsunmu günüm şami-qəriban Qarabağda?!

Bizarəm özümdən dəxi, Qüdsi, darıxıb mən,
Çəkdim bu qədər ah ilə əfğan Qarabağda.

Yıldız deyil əlbəttə, bu ahi-dili-ğəmnak,
Dağdır basılıb sinəsinə, parlayır əflak.

Bil meydən alır ziynəti gülzari-təbiət,
Gül, lalə bəzərmi çəməni olsa susuz xak.

Ey göz, de görüm gülşənə tez-tez niyə baxdın?
Sellər yolunu heç tuta bilməz xəsü xaşak.

Hər şux gözəlin felinə uyma bu cahanda,
Rəngdən pas alar şübhəsiz ayineyi-idrak.

Hər bir gözəlin köynəyi çak olsa yox eybi,
Bilməm niyə bəs köynəyim ondan olunub çak.

Zünnar daşıram, çünki o keysuyə çox oxşar,
Qalsın başına təsbih ilə şanəvü misvak.

Qudsi, çox heyifdir sənə ömrün keçə yarsız,
Ondan da betərdir naz edə dilbəri-bibak.





Bu nə xalü bu nə xətdir ləbi-canana yaxın,
Belə kafir nə səbəbdən olub imanə yaxın?!

Buraxıb əqlü tənü canı yapış Allahdan,
Ki, olarsan belə bir karilə yəzdanə yaxın.

Ey ürək, hər yana getsən ayıq ol, eylə həzər,
Ki, yolun düşməyə ol zülfi-pərişanə yaxın.

Elə bir hal alıram mən səni yad etdikdə,
San qəfəs bülbülüyəm səhni-gülüstanə yaxın.

Çeşmü xalü rüxü kakil törədər xofu xətər,
Ay düşər əqrəbə, Mərrix də ki, Keyvanə yaxın*.

Misrdən Yusifinin ətrini tez hiss elədi,
O adam ki, quyunu görmədi Kənanə yaxın*.

Qüdsi, canana hicab oldu sənin intizarın,
Vəslin ümmidi həmişə olur hicranə yaxın.

Ey qürrələnən tacə, tacdan nə olur hasil?
Məzlumların ahından olma bu qədər ğafil!

Şəksiz ayağın altda can vermək olur asan,
Lakin yaxa qurtarmaq səndən görünür müşkül.

Etdim nə günah sevdim bir sən kimi cananı,
Yüz parça da etsən gər qəlbim sənədir mayil.

Geysulərin ey dilbər, zənciri-ədalətdir,
Xosrovlar içərisində sən tək hanı bir adil?

Addımbaşı zənglər tək fəryadə gəlir qəlblər,
Cəmmal, bu vadidə ahistə yürüt məhmil.

Həngaməli qovğadır, hər yanda tamaşadır,
Üşşaq kəfən geymiş, xəncər siyirib qatil.

Qüdsi, nə utanmazsan indi dediyin sözdən,
Qabil sözün ustadı lazımdır ola kamil.





Deyil bu dərdimə dərman, əbəs fəğan nə edim?
Rəqib əzir məni, dost olmayır, həyan, nə edim?

Nə cür bəhanə ilə mən vüsali-yarə çatım,
Yetirdi canə məni dövrü-asiman, nə edim?

Mürada çatmır əlim, həm unutmuram onu mən,
Yetirdi canə məni dövr-asiman, nə edim?

"Vətən", – deyib, gəzirəm qürbət eldə avarə,
Bu qürbət ölkə mənə oldu xaniman nə edim?

Düşür bu dəhrdə hər şəxsə dərd, qədrincə,
Bu sirri dostlara bəs etməyim əyan, nə edim?

Rahatlığın səbəbi dövlət isə, məndə hanı?
Özün de, varmı belə dövlətə güman, nə edim?

Var oylə mətləb onu fəhm edir ürək, Qüdsi!
Dil eyləməz belə bir qüssəni bəyan, nə edim?

Eşq üzrə bu sərdarlıq,
Bir söylə nədən, ey dil?
Olsunmu bu sər darlıq,
Bir söylə nədən, ey dil?

Darə çəkilən hər sər,
Öz-özünü faş eylər,
Oldun belə sən bifər,
Bir söylə nədən, ey dil?

Hər yerdə sən oldun faş,
Oldunmu belə ovbaş,
Dar üstünə qoydun baş,
Bir söylə nədən, ey dil?

Gəldin yerə bipərdə,
Düşdün bu qədər dərdə,
Qırdınmı darı sərdə,
Bir söylə nədən, ey dil?

Oldun belə sən bəndə,
Düşdün belə sən bəndə,
Düşdün dara bəs sən də,
Bir söylə nədən, ey dil?

Qoş başını bir işlə,
Bir xeyirli iş işlə,
Yoxsan işə gəlmişlə,
Bir söylə nədən, ey dil?

Qüdsi, belə olmazdın,
"Sərdar" – deyə hey azdın,
Tək sözlə əsər yazdın,
Bir söylə nədən, ey dil?*





Çək keyfini zəmanədən axtarma, umma kam,
Etmə uzun diləklər ilə ömrünü həram,

Xalq adətin əsiridir, hətta sübut üçün,
Əfsanəni hesab eləyir doğru bir kəlam.

Kəşf etməyə bu sirri çox alim çalışdısa,
Baş açmayıb bu məsələdən qaldılar avam.

Zahid başında, mədrəsənin qeylü qalı var,
Heyran qalıb o cəhli-mürəkkəb içində tam.

Yox doğru yol bu mərifətə eşqdən səva,
Hər kəs tapar onunla fəqət şöhrətü məqam.

Varsa başında səltənətin zövqü, yoxsul ol,
Yüzlərcə ehtiyac doğurur hər bir ehtişam.

Qüdsi, pozarsa halını yar eşqi qorxma heç,
Hər iş pozulsa şübhəsiz axır tapar nizam.

Mən təmənna yolunu getdim əbəs yordum ayaq,
Yetmədim məqsədə mən hər necə etdimsə soraq.

Qəlbimin həsrətini sözlə bəyan etdi dilim,
Nə xəbər etdisə yarım, onu dərk etdi qulaq.

Hicrə düşmüş könülə bir də rəqib qorxusu yox,
Bu səbəbdən daha xoşdur mənə bu zövqi-fəraq.

Can alır qəmzə ilə, sonra verir can dodağı,
Bu yəqin möcüzədir, sehr ola bilməz bu sayaq.

Xülqi, xasiyyəti heyran eləyir insanı,
Buna insan demək olmaz, bu mələkdir ancaq.

Badədir baisi, ya göz səbəb olmuş bu işə,
Üzünü görmədəyəm, mən ələ aldıqda ayaq[1].

Sən şikayət eləmə Qüdsi, rəqibdən, yardan,
Yaxşıdır bir dəfə də diqqət et öz eybinə bax!

[1] Ayaq – burada: badə





Başda çoxdan bəridir türfə xəyalım vardır,
Alıram zövqü mən ondan gözəl halım vardır.

Vəhşi gözlər nə ki, var ram olar əfsunum ilə,
Görürəm ovlamağa türfə qəzalım vardır.

Tən edib müddəi, gəl sanma məni bikarə,
Belə bir işdə bir anlıq da məcalım vardır?

Mənim halımdan əgər yox xəbərin məzursan,
Qəlbi əldən verən anlar ki, nə halım vardır.

Nə yuvam var, nə də yer yox qəfəsin küncündə,
Nə də gülşən sarı uçsam pərü balım vardır.

İstərəm yarıma yetməkdə rəqibdən imdad,
Mənə bax, gör nə təmənnayi-mahalım vardır?!

Qüdsiya, bəndəliyimdən mən əcəb dəm vururam,
Bir kədakən həvəsi-cahü cəlalım vardır.

Neçə vaxtdır ki, fəraqında məlalım vardır,
Vəsldən qeyri güman etmə xəyalım vardır.

İltifatım mənə küstaxlığa cürət verdi,
Səndən, ey dost, mənim bircə sualım vardır?

Niyə bir yad eləyib halımı sormazsan heç?!
Yorğunam, bənzim uçub, ğəmzədə halım vardır.

Allah-Allah, necə bihudə xəyal eyləyirəm,
Bu nə işdir, nə təmənnayi-məhalım vardır?!

Mən əbəs lütf umuram indi o zalım yardan,
Mən kiməm, ya nəçiyəm, ya nə kəmalım vardır.

Nə malım var edim uğrunda onun nəzrü nisar,
Getməyə bəzminə layiq nə cəlalım vardır?!

Yaxşıdır xamuş olub dinləyim hər an Qüdsi,
Gərçi bu barədə yüz dürlü misalım vardır.





Başımda xeyli zamandır həvayi-yarım var,
Nigar zülfü tək aşüftə ruzigarım var.

O atəşin yanağından alışdı, yandı cigər,
Bu qəlbə dağ çəkən nazlı gülüzarım var.

Xilas qıl məni saqi, ağıl bəlasından,
Mey içməsəm, bunu bil zəhməti-xumarım var.

Günah zahidi, taətsə rindi etdi xəcil,
Mənimsə hər ikisindən ziyadə arim var.

Yarın baxışlarına, zülfünə mən and içirəm,
Nə hicrə tab, nə də səbrə iqtidarım var.

Həyat üçün ən əziz şey olan bu canımı mən,
Ayaqlarında fəda etməyə qərarım var.

Salanda Qüdsi yada gül camalını sanki,
Ürəkdə, gözdə ətirlər saçan baharım var.

Neyləyim mat qalmışam mən öz işimdə sərbəsər.
Gözlərim öz yarımın hicrində qanlı yaş tökər.

İstərəm gülşən salım, gözdən ona arx çəkdirim,
Bəlkə mən bir sərv əkəm yanımda axır bir təhər.

Gülşən içrə bülbül istərdi ki, qursun aşiyan,
Gül ona etdi təbəssüm öz budağından səhər.

Zülfü rüxdən yüz ətir, yüz rəng saç ətrafə sən,
Ta xəcil olsun cülüstan öz yazından bir qədər.

Etməz idim mən səlamətdən məlamət ixtiyar,
Əqlü din olsaydılar öz ixtiyarımda əgər.

Tünd baxmaqla gözəl bənzər acıqlı qartala,
Sanki, hiddətlə baxıb, itmiş olan bir ov gəzər.

Şeyx təsbih, Qüdsi əşar, bülbül isə şur ilə,
Hər kəs halın yarına öz səbki ilə şərh edər.





Zahidin qəlbini salmışsa tora zülfi-nigar,
Bəs nə halə düşəcək görsə onu aşiqi-zar?!

Aləmə fitnə salan qüdrətə sal bircə nəzər,
Kim görübdür ola insanda pəridən asar?!

Xalqa təlim eyləyir sehr yarın didələri,
Cüt mələkdir quyuya nazil olub sanki xumar*.

Kaf onun kakilidir, nun isə əyri qaşıdır,
Nə məhəbbətlə yaratmış onu gör sənətkar?!*

Eyşü işrət dəmidir, fürsəti fövt eyləmə gəl,
Köhnə dünyaya bəzək vurdu bu gün tazə bahar.

Gülü lalə, meyü rüxsareyi-gülrəngə baxın,
Sanki, oddur alışıb, yanmada səhni-gülzar.

Qüdsinin qüssəsini qissədə söylər bülbül,
Onun hər nəğməsinə qoşdu könül xoş əşar.

Sitəmkarım, neçin sən etmədin vədə vəfa bir an,
Məni aldatdın həm də öz işimdə eylədin heyran.

Xilafi-vəddən bədtər eyib dünyada gördünmü?
Neçin bəs əhdini qırdın, nə oldu verdiyin peyman?

Dilə gəlməz sənə mən bivəfasan söyləyim hərgiz,
Özün bax vədinə və felinə, ey bivəfa canan!

Nə qorxun var o bülbüldən, nə cür naz eyləsən xoşdur,
Həmən səhnində ey gül, sən bacar min rəng ilə nazlan!

Niyazi-eşqə, nazi-hüsnə şahiddir sənin sinən,
Əzizim, bundan artıq varmıdır aləmdə bir bürhan?!

O şirindillilərdən qəlbə bir dağ çökdü çox möhkəm,
Gərəkdir sinəmi mən dağ çapan tək eyləyim viran.

Bu adətdir vurarlar tənə Məcnuna, bari Qüdsi,
Özün öz namini rüsvaçılıqda eləmə elan.





Gül xoş olmaz Həsənin hüsnü nümayan olsa,
Həm bənövşə utanar zülfü onun yan olsa.

Günəşin surətini tirə edər bir anda.
Xali üstə Həsənin zülfü pərişan olsa.

Qönçənin qəlbi dönə qanə gülüstan içrə,
Həsənin al yanağı bircə dirəxşan olsa.

Surəti cilvələnən dəmdə batar müşkün iyi,
Ay sönər gərçi Həsəndən ona fərman olsa.

İstəməz başqa rəfiq vəhşi könül dünyadə,
Gər Həsən bircə kərə ruyinə xəndan olsa.

Hər tərəfdən əyilir qiblənüma əqrəbitək,
Həsənin səmtinə hər mötəbər insan olsa.

Hər kəs aləmdə tutar sevdiyi bir dost adını,
Mən "Həsən" söyləyərəm hər nə qədər can olsa.

Nurunu almış üzündən ruzu şəb mehr ilə mah,
Söylə, heç vardımı bu mətləbdən artıq bir günah?!

Xeyli müddətdir bizə cövr olsa da biz xoşdilik,
Eylər axırda ədalət ilə divan dadxah.

Bu nə gözdür, nə dodaq ki, azca zəhmət çəkmədən,
Qətl edər xalqı silahsız, mülk alar həm bisipah.

Hökmdən dönmək sanardım keçsən ismətdən əgər,
Əhdə bərəks fərz edərdim məndən olmazsa günah.

Damənin bir əl, əlin damən tutardımı məgər,
Udmasaydı Yusifi-Misri o Kənan içrə cah?!*

Mən öləndən sonra qəlbim od tutub qəbrimdə də,
Bir qızıldan lövh olar bu çəkdiyim atəşli ah.

Bunca təkid ilə Qüdsi eyləmə ərzi-niyaz,
Yox yeri, küstaxlığı sevməz hüzuri-padişah.





Eşq dərdi, atəşi-möhnətlə yanmışdır bu can,
Böylə qəmlə varlığımçın bilmirəm varmı güman?

Arizusu yanmın gah güldürür, gah ağladır,
Sanki şiddətli küləkdə od tutub şamdır yanan.

Müxtəlif meylərdə keyfiyyətcə bir təsir olur,
Şurə gəlmişdir içən ərkək, qadın, pirü cavan.

Rəngi güldən rəng alıb, bülbüldən ahəng öyrənib,
Ondan ətr almış səba, dolmuş çəmənlə busitan.

Bir pərivəş mahru olmuş gözümdə cilvəgər,
Ol nigarın böylə hüsnündən işıqlanmış cahan.

Haşalillah ol pəripeykər yəqin adəm deyil,
Bir mələkdir Allahın əmrilə salmış asiman.

Heç taparmı intizam bir gün cahanda intizam,
Qaşlarından bənd vurubdur işlərə, Qüdsi, zaman.

Vəqti-səbuh oldu bəs, badeyi-gülfam hanı?
Gündüzüm oldu qara, mahi-dilaram hanı?

Gül üzünə, sərv isə qibtə edir qəddinə,
Güldə bu cür xoş ətir, sərvdə əndam hanı?

Göz və qulaqdan sənə çoxlu şikayətliyəm,
Getmədə badi-səba, fürsəti-peyğam hanı?

Feyzi qənimət bilin xassə bahar çağı yar,
Əhdə vəfa etsə də, arxayın əyyam hanı?

Boşlayaraq gülşəni, girmə qəfəs küncünə,
Ovçudan etmə giley, danə hanı, dam hanı?

Qorxusu var virdinin, çünki həyat dərdidir,
Dərdin əgər eşq isə, illəti-sərsam hanı?

Qüdsi, ümid bağlama, bu qoca dünyayə sən,
Nil çayını tərh edən, banii-ehram hanı?





Aləmi etdin əsir nərgisi məstanına
Sinələr oldu hədəf nəvaki-müjganına

Nisfini görsə əgər bayram edər oxşadar,
Xalq orucluq ayın çaki-giribanına.

Alnıma basdı xalın dağ, qul etdi məni,
Oxşadıram halımı zülfi-pərişanına.

Yox məcalım söyləyim, çünki əzəldən məni,
Bülbül edibdir xuda səhni-gülüstanına.

Gər bu gözəlliklə sən gülşəni seyr eyləsən,
Səbzə ilə gül vurar çəngini damanına.

Bülbülü güldə bu cür nitqü təbəssüm hanı?
Qibtə edirlər sənin qönçeyi xəndanına.

Ahdan etmə həzər, Qüdsi, nəhayət bu ah,
Hicr günündə olar şəm şəbistanına.

Yəqin göz yaşlarından islanardı gülşən, ey Qümri,
Sənin sərvin mənim sərvim tək olsaydı şən, ey Qümri!

Sənin sərvin gilə bənddir, mənimsə sərvim azaddır,
Və lakin zövq alır yarı o bənd etməkdən, ey Qümri!

Nişanı çoxdur eşqin, lafə, yoxdur ehtiyac hərgiz,
Budur boynundakı tovqun deyir: aşiqsən, ey Qümri!

Başım sərvin ayağında, ayağın sərv başında,
Deməz aşiq olan bu şivənə heç əhsən, ey Qümri!

Əgər həmsirrü həmdərdsən, bizimlə birgə gəl şurə,
Əsirlər birgə xoşdur eyləyorsə şivən, ey Qümri!

Qiyas etmək deyil mümkün səninlə bir quşu hərgiz,
Nə gülşən var ona, nə aşiyan, nə məskən, ey Qümri!

Girehləndi boğazda naleyi-Qüdsi susub qaldı,
Çəmən bülbüllərindən sən danış, sən dillən, ey Qümri!





Söylə nə lazım mənə sənsiz cahan,
Çünki xəcalət çəkirəm hər zaman.

Xeyri nədir dünyada boş şeylərin,
Nurla günəş tapdı bu aləmdə şan.

Bağdakı quşlar hamısı lal olar,
Nəğmə desə bülbüli-şirinzəban.

Qorxuram axırda sənin işlərin,
Faydasız olsun da, çıxarsın ziyan.

Canlı və cansız nəki var dünyada,
Məhv olacaqdır hamısı bigüman.

Heç yaraşarmı, özün insaf elə,
Azad ikən qul olasan natəvan.

Tərif olunduqca sözün, Qüdsi bil,
Cilvə tapar şeirlərin anbaan.

Xalq axtarır iş, gəlməyir heç yerdə qərarə,
Tapdıqda bir iş həm, eləmir rəğbət o karə.

İmkansız olan yerdən ümid gözləyir hər an,
Məqsəd boşa çıxdıqda sanır taleyi qarə.

Dəhrin qəminin, eyşinin əncamı məlaldır,
Ey eşq, yetiş öylə ürək dağinə çarə.

Yoxdur işim heç kəslə, xəlayiqdən əl üzdüm,
Bağlandı bu divanə könül zülfi-nigarə.

Var olsun o sevda ki, o meydən içən ölməz,
Başqa meyin asarı edər qəlbimi parə.

Hər küncü qəfəs rahət olar bülbülə çünki,
Gülşəndə gələr rast o xəzanə və bəharə.

Bais olacaq, Qüdsi, sənin naləvü zarin,
Əğyar sevincinə və dərdi-səri-yarə.





Şəfəqqətli görmədim ol şux dilrübani,
Bu günkü eşqbazlıq bir qaydadır zəbani.

Bülbülsifət uçur qəlb gülşən tərəf vüsalə,
Fikr etməyir bahardan sonra gələn xəzani.

Kimdəndir hüsnə cəzbə, qəlbə edir nə təsir,
Yoxdursa ortalıqda təqdiri-asimani?!

Bir növcavanı sevdim, getdi cavanlıq əldən,
Umdum cavan edər o, bu piri-natəvani.

Ol şux bir tük ilə yüz qəlbə vurdu zəncir
Möcüzmidir bu, yoxsa bir sehri-riysmani.

Firqətdə yar dərdi, vəslətdə xofi-əğyar,
Doydurdu canə məni bu səbk zindəkani.

Qüdsi, ağıl gücilə gəlməzsən eşqə ğalib,
Çəkmə əbəs əziyyət verməzsən imtahanı.

Gəncliyimdə mən qocaldım ah, aman,
Mətləbim qaldı ürəkdə hər zaman.

Zahirən olsan da xoş, bir fitnəsən,
Zülm edənsən, görsənirsən mehriban.

Ya mələksən, bənzəyirsən insana,
Ya ki, insansan, bəlayi-asiman.

Ya olub Nəmrudla Musa atəşi,
Ki, ağacdan od tutubdur bustan.

Məstə təsir eyləməz zahid sözü,
Dərdə dərman eyləyər dərdanlayan.

Sən kimi, dünyaya nifrət etmirəm,
Bizlərə bəsdir bu cami-ərğəvan.

Qudsi, kimdir bunca tərif etdiyin?
Vəsfinin hər hərfidir bir dastan.





Nə qəlbdə var taqət,
Nə vəslinə var fürsət,
Nə vəslinə var fürsət,
Nə qəlbdə var taqət.

Yarəb bu günü heç vaxt,
Heç şəxsə rəva görmə,
Heç şəxsə rəva görmə,
Yarəb bu günü heç vaxt.

Varsa fəğanına niyyət,
Əyləş mən ilə bülbül,
Əyləş mən ilə bülbül,
Varsa fəğana niyyət.

Gül xarə ola qismət,
Görmək onu müşküldür,
Görmək onu müşküldür,
Gül xarə ola qismət.

Öldürdü məni həsrət,
Yol yox bu gülüstanə,
Yol yox bu gülüstanə,
Öldürdü məni həsrət.

Divarda görüb illət,
Lazımmı çəkim qorxu,
Lazımmı çəkim qorxu,
Divarda görüb illət.

Möhkəm dayanıb səbr et,
Qüdsi, çətin işlərdə.
Qüdsi, çətin işlərdə,
Möhkəm dayanıb səbr et!

Ey gözəllik çəməni içrə güli-tazəbahar,
Ey məhəbbət bağının sərvi – gözəl, nazlı nigar!

Misli yox səndə olan gül yanağın, qamətinin,
Heyf, axir solacaqdır bu lətif gülrüxsar.

Bağladım bel o vəfanə inanıb bilmədim heç, –
Ki, cəfapişəvü bədşivəsən həm bədkirdar.

Qeyrə yar oldun əgər eyb eləməz, çünki mənim,
Nazənin dilbərimin dünyada çox şöhrəti var.

İncəsən, şuxü zərif sevgili bir afətsən,
Belə dildar heyifdir eləyə zülmü şüar.

Nüktəpərdaz, füsunkar, sərapa nazsan,
Gözlərin nərgisi də oldu əcəb badəgüsar.

Qüdsi qəlbində yəqin ki, sənə yer verməyəcək,
Sonradan gərçe peşiman oluban gəlsən a yar!





Cəfadan başqa bir karın yoxundur,
Fələk bundan məgər arın yoxundur?

Nəzarən başqadır, cilvən də başqa,
Məgər heç şövqi-didarın yoxundur?

Mənə eyb etmə getdimsə yanından,
Vəfavü əhdə girdarın yoxundur.

Yığışdır sən bu xudbinlik mətaın,
Bu meydan içrə bazarın yoxundur.

Qəfəs küncündə ey bülbül, nə kam var,
Ki, gülşəndən həvadarın yoxundur.

Rəqibin cövrünə dözmək olarmı?
Köməkçin, bir yaxın yarın yoxundur.

Necə Qüdsi, fərağət gözləyirsən,
Ki, dil varın və dildarın yoxundur.

136

Pis işdən olursan əgər peşiman,
Neçin bəs ona sən verirsən imkan?!

Elə söz söylərsən ki, sığmaz əqlə,
Gəzdiyin şeylərin hamısı pünhan.

Yazıq pərvanəni yandırdı şölə,
Nə şamdır ki, olur fanusda suzan?

Torundan canquşu gəzməz uzaqda,
Nə üçün yazığı həbs etdin, canan!

Vüsalın hər kəsə bir pay verirsə,
Neçin bəs tək məni qovdun qapından?

Fələk bir güzgüyə bənzər, hər işi,
Orada tərsinə edər nümayan.

Hünərmi, ey Qüdsü, xalqa əziyyət?
Mərdsənsə, et xalqın dərdinə dərman.



# Qəsidələr

## BAHAR VƏ XƏZAN

Gəldi qış ləşkəri, ah, bağları viran etdi,
Tökdü gül paltarını, hər xolu üryan etdi.

Yığdı bağdan necə gör nəşə, fərəh məclisini,
Dostların yığnağını məhv, pərişan etdi.

Bülbülü saldı necə sevdiyi güldən ayrı,
Gülşəni Yusifin hicrində cigərqan etdi*.

Yıldırım ağladı göydən, gülə matəm tutaraq,
Buludu sərv qəmində gözü giryan etdi.

Bu fələk rəhm nədir bilmədi, yağdırdı dolu,
Gülşəni pozdu, əcəb qorxulu tufan etdi.

Nərgisin gözlərini yumdu əbəd xabi ilə,
Həm qərənfil tacını xakilə yeksan etdi.

Yasa batmış kimi gör geydi bənəfşə qara don,
Yığdı asarını bir guşədə pünhan etdi.

Sünbülə, susənə bax tökdü üzə saçlarını,
Zülmdən nalə çəkib çaki-giriban etdi.

Çəmənin səhnəsinə etdi hücum Bəhmənü Dey*,
Bircə rəhm etmədi min zülm nümayan etdi.

Xoş onun halına kim guşeyi-xəlvətdə bu dəm,
Nazlı bir yar qucub könlünü xəndan etdi.

Məni xoş saxladı bir yaz gününün ümmidi,
Yarımın hicri isə qüssədən heyran etdi.

Bağda bülbül dil açıb, nəğmə dedi şur ilə,
Onu bu ətri-çəmən gör nə xoşəlhan etdi.

* *
*

Hanı güllər, çoxalıb dəhrdə gülzar olsun,
Gözəlin al üzü tək rəngi-çəmənzar olsun!

Lalətək cam tutub, səf çəkə dostlar gülərək,
Çəmənin bülbülü tək çoxlu sənətkar olsun.

Quşların nəğmələri şur sala hər yandan,
Açılıb gül şeh ilə badəsi pərgar olsun.

Rəqs edənlər çəmənin otlarını tapdalasın,
Qoy çiçəklər dağılıb yerə şərarbar olsun.

Biri gülzarə baxıb, başa çəkə qırmızı mey,
Ağac altında biri talibi-dildar olsun.

Səpə hər bir tərəfə badi-səba Çin ətri,
Lalə yarpaqlarının hər biri bir nar[1] olsun.

Tökə aşiq kimi dil yalvararaq hər susən,
Nəğmələr içrə bir az dərdi-dil izhar olsun.

Nərgisin gözləri bir rind kimi badə içə,
Nəşədən can alıcı sərxoşu xummar olsun.

Çəmənin süfrəsinə lalə tökə peymanə,
Aşiqin daməni tək butəsi xunbar olsun.

[1] Od



Görünüb səbzəyi-tər, sünbülü nəsrin bir dəm,
Yar xəti, zülfü, üzari belə aşkar olsun.

Yeni mətlə açaram mən təzə bir qafiyədən,
Ki, bahar ətri bu təbimdə xoş əşar olsun.

* *
*

Hanı yol ta üzümü mən də gülüstanə tutum?
Baxaraq tazə gülə, dərdimi dərmanə tutum.

Səbrimi aldı əlimdən gözəlin vəsl həvəsi,
Ah aman, bəs nə qədər könlümü hicranə tutum?!

Hər kimə mən baxıram kami-dil olmaz hasil,
Dəli qəlbim dilər üz dəştü biyabanə tutum.

Göz yaşım, ahi-dilim verdi oda, söylə məni,
Bir dua etməyə əl mən ulu yəzdanə tutum.

Deyim axır nə qədər mən çəkim işgəncə, ələm,
Ömrümün yaz gülünü badi-zimistanə tutum.

Nola bir yaz açıla, can gülə min şadlıqla,
Lalə tək ta üzümü mən də o bustanə tutum?!

Oturum güllər arasında gözəl yarım ilə,
Hüsnünə valeh olub, əldə də peymanə tutum.

Aparıb qəlbimi dilbər dilərəm həsrətilə,
Nola zülfündə onun bir balaca xanə tutum?!

Gah öpüb ləblərini, gah da baxım gül üzünə,
Gah onu can kimi mən sinədə məstanə tutum.

Basaraq bağrıma bihuş qalım bir müddət,
Kam alım, yoxsa o cananımı bu canə tutum?!

Yoxsa yaddan çıxarıb, tərk eləyim arzuları,
Ya da bu xam təməi vahi bir əfsanə tutum?!

Qoy keçim başqa sözə, bir yeni mətləb qoy açım,
Şerimin didəsini surəti-canana tutum.

* *
*

Xoş onun halına kim rədd edə bu dünyanı,
Bir sözün mətləi tək tez unuda sevdanı.

Bax gülün ömrünə kim təntənəsi beş gündür,
Payız olca boşalar xoş çəmənin meydanı.

Lalə üzlər solaraq hüsn gedər bilmərrə,
Unuda sevgililər verdiyi hər peymanı.

Sən könül vermə, gözüm vəslətə ya hicranə,
Şad olə qəmlə keçən ömrü bir az pünhani.

Şirin olmaz sənə bu zəhr dolu cami-həyat,
Yada sal Fərhadı, ol aşiqi-bihəmtanı.

Bax cahan keçmədədir, aqil olan bişübhə,
Keçici dövrə inanmaz, yaşayar xudmani.

Bağlamaz bel bu ötər şöhrətə, atmaz vətəni,
Ani bir ləzzət üçün tərk eləməz məvanı.

Bədbəxt oldur ki, yeyə xuni-ciyər, dərdə düşə,
Lalə tək qan qusa və olmaya bir dərmanı.

Yetişəndə əcəli can quşu bir gün susaraq,
Tərk edər can evini, odlu dili-şeydanı.

Tapmadım mən də yol ey vah ümid gülşəninə,
Min təəssüflə keçirdim bu gözəl dövranı.



Yaz odur ki, ona əl gəzdirəməz bir də xəzan,
Bu çəmən içrə olan yazda mətinlik hanı?

Qudsi canda arayır solmayacaq tazə bahar,
Çünki saf olmalıdır söz deyənin vicdanı.

## GÜNƏŞDƏN BİR ŞÜA

Gül üzündən əxz edib gövhər günəş,
Saçlarınla örtülübdür hər günəş.

Ey xuda, nə ali şövkətdir bu ki,
Bir hüma tək bəxtə açmış pər günəş.

Zülfdə görcək üzün oldu xəcil,
Başına şəbdən salıb məcər günəş.

Aşiq olmuş ruyinə bica deyil,
Hər deşikdən daxil eylər sər günəş.

Tez verin zülmətdəki Xızra xəbər,
Çeşmeyi-heyvanı bəxş eylər günəş*.

Nurlu simanı nümayiş etməyə,
Gəzmədə səyah tək kişvər günəş.

Eşqdən dəm vurmuşam bir sübh tək,
Qəlbim içrə doğru bir azər günəş.

Hər günəşdən bir şüa peyda olar,
Hər şüadan rəng alar digər günəş.

Ey hilalı qarşısında daima,
Olmuş aləmdə zəif çakər günəş!

Ay çıxartdı qarşına çərxi-fələk,
Gördü parlar üzdə bir əhmər günəş.

Al şəfəqdən çıxdı qanla örtülü,
Qeyzdən əldə tutub xəncər günəş.

Bax Həməl bürcündəki qurbanə sən,
Ta şikar olsun sənə yeksər günəş*.

Dördnala cövlan edəndə köhlənin,
Göstərər altı ədəd əxtər günəş,

Ey şahım, sal başıma öz kölgəni,
Nur salar hər xarədə ənvər günəş.

Zatının yox ehtiyacı tərifə,
Çünki hər şeydən daha dilbər günəş.

Mədhsiz də bir lətafət bəxş edər,
Hər şeyin rəsmində surətgər günəş,

Qüdsiya, pis göz sənə dəyməz yəqin,
Bir üzərlik yandırıbdır ər günəş.

## MƏDHİYYƏ

Yer üzündə odur verən fərman,
Bir günəşdir işıq salır hər yan.

Hökmünə baş əyir bütün aləm,
Kölgəsində nəfəs alır dövran.

Vəsfini mən soruşdum əqlimdən,
Dedi ki, bil odur böyük sultan.

Hünərə nisbətini sordum mən,
Dedi: "Feyzun ləhüm..." ona şayan.

Asiman ondan istəyər mətləb,
Belədir şahimizdə şövkətü şan.



Fəxr edir varlığıyla bu dünya,
Möhkəm oldu onunla din, iman.

Fəzlü ədli ümid bəxş eylər,
Səltənət işlərində bipayan.

Başqalar şahlıq ilə fəxr eylər,
Onun öz surətindədir bu nişan.

Sözlərim hər nə nüktə kəşf etsə,
Hamısı vəsfini edər ünvan.

Mən soruşdum dünən ay ulduz nə,
Necədir söylə hali-kahkəşan?!

Verdilər tez cavabımı: "Dərk et!
Soltanın ləşkəri olubdur əyan".

Bu necə oxşayış ki, nisbəti yox,
Göydəki ulduz ilə yerdəki san?!

Başqalarla qiyası tərk eylə,
Varmı heç burda təşbihə imkan?

Şübhəsiz rəmzidir bu təşbihlər,
Açdı ərz üstə şah özü meydan.

Möcüz eylər əli əsası, necə –
Möcüzə etdi Musiyi-İmran*.

Təkyəgahi də qüdsdür, bir bax,
Məsnədi-Əhmədə odur bürhan.

Qüdsinin nisbəti bu dərgəhədir,
Bir qul olmuş bu yerdə çun Rizvan*.

"Sali-fərxəndəfali-ali ovc"
Tarix olsun bu şöhrətə əlan*.

## SAQİNAMƏ

Gəl ey saqi, ver cami-geytünümə,
Ki, gün tək salar torpaq üstə ziya.

İçim ta özümdən olum bixəbər,
Mənə ta görünsün bütün macəra.

Bu gülşəndə açmış əcəb gül, çiçək,
Sitarəylə dolmuş sanasan səma.

Vücudə edib bəxş öz feyzini,
Özün göstərir sanki köhnə fəza.

Dünən könlümü cuşə saldı süruş,
Gəlib huşimin güşinə bu nida.

Dedi: "Çatmısan şöhrətü şənə sən,
Bir atəş kimi yüksəlib daima,

Bu din bəsləyən mötəbər divanın,
İçində yer almış xudavənd, xuda.

Sədaqət sənə çox da olmaz nəsib,
Sən öz xeyrini güdmüsən bərməla.

Günə bir nəzər sal o salmaz işıq,
Ki, yer söyləsin afərin, mərhəba!

Bu qüdrətli təbin ziyasinə bax,
Ki, dövlət işi ondan almış cila.

Onu tərifə yoxdur heç ehtiyac,
Gərəkməz onunçun daha müddəa.

Uzun ömr versin ona girdigar,
Şahın dövləti tək o tapsın bəqa.



Səyahət zamanı gülüb taleim,
Mənə bir yol açdı böyük dərgaha.

Edib lütf göstərdi min iltifat,
Belə nemət etdi cəhanə əta.

Xoş olmuş onun hər işi, Qüdsiyə,
Olub tarixi: "Ganə tarixünə"*.

# Müxəmməslər

## TİFLİS

* Qəm çəkmə, könül, gər ciyərin qanə dönübdür
Əyyami-vüsalın şəbi-hicranə dönübdür.
Bülbül-tək işin naləvü əfqanə dönübdür.
Tiflisə nəzər qıl ki, gülüstanə dönübdür.
Hər bir gözəli afətü cananə dönübdür.

İrs ilə yetib bunlara asari-vəcahət,
Geysuləri sünbül tək alıb tabü təravət,
Qamətləri dünyaya salıb türfə qiyamət,
Hər dilbərə bir növ verib rəngi-nəzakət,
Kür suyu məgər çeşmeyi-heyvanə dönübdür!?

Hər şuxi-pəripeykər açıb türreyi-tərrar,
Dildadələri etmək üçün damə giriftar.
Səyyadi sitəmgər bu guzərgahdə çox var,
Ahubeçələr tək doludur kuçəvü bazar,
*Çin mülkünə bu mənzili-viranə dönübdür.*

Hər kim gələ Tiflisə tamaşa tələbindən,
Zülfi-ruxi məhvəşləri görmək səbəbindən,
Görməz əsəri rahəti-can ruzi şəbindən,
Xoşləhcə pərizadələrin ləli-ləbindən,
Bu kişvəri-pürşur bədəxşanə dönübdür.

Bunlarda bu yarəb, nə səfadir fərəhəngiz,
Hər sərvqədin şivəyi-rüxsarı bəlaxiz,
Rüxsari-niku, türrəyi-mişkini dilaviz,
Hər əbruyi-xəm şəkldə bir xəncəri-xunriz,
Qan tökmək üçün hər müjə peykanə dönübdür.

Hərçənd bu gülzardə çox dilbəri gördüm,
Can qəsdim edən şuxi-sitəmküstəri gördüm,
Arizləri mehtaba bərabərləri gördüm,



Əvvəl yetişən gündə ki, İskəndəri gördüm,
Aya bu mələkdir, dedim, insanə dönübdür.

Qüdsi ki, dəmi-qüds vurub lafi-təvəlla,
Tən eylər idi görsə birin valehü şeyda,
Tərk eyləmiş islamı görüb bunları hala,
İstər ola carubkeşi-səhni- kəlisa,
Zünnar salıb boynuna sənana dönübdür*.

## BİSMİLLAH

* Dila! Əzm eylə sən bülbül sifət gülzarə, bismillah,
Muradın olsa meyl etmək fəğanü zarə, bismillah,
Gər istərsən müdam olmaq cigər sədparə, bismillah,
Qərəz fikrin tamaşadır əgər dildarə, bismillah,
Nəzər qıl ləli-canbəxşi-gülnarə, bismillah.

Təmənnasında gün-gündən məni-dilxuni şeyda qıl,
Gərəkməz namü namusum, qəmi-eşqilə rüsva qıl,
Verib dünyavü din nəqdin, mətai vəslə sevda qıl,
Əgər yox dəstrəs, sevdayə bari get tamaşa qıl,
Gəlibdir Yusifi-gülpirəhən bazarə bismillah!*

Çəkərdin arzu daim deyirdin şövqi yar ilə,
Ki, düşsün ittifaqi-vüslət ol siminuzar ilə,
Etdim canım ona təslim zövqü etibar ilə,
Durubdur ol buti-sərməst tiği-abidar ilə.
Sözün gər doğrudur ey aşiqi-biçarə, bismillah.

Demişdin ey büti-tərsanigəh, bərhəmzəni-aləm,
Ki, etməm aşiqimdən mən yaman gün iltifatim kəm,
Alıbdır səbrimi dərdü bəla can qəsdin eylər həm,
Əgər iqrarı sabitsən vəfa həngamidir bu dəm,
Tərəhhüm qıl, qədəm bas dideyi-xunbarə, bismillah.

Olubdur qərqi-xunabi-cigər çəşmi-tərin, Qüdsi,
Yanıbdır daği-möhnətdən dili-qəmpərvərin, Qüdsi,
Gətir təqrirə bir-bir yarə ərz et qəmlərin, Qüdsi,
Əgər bu şivədən dilgir olarsa dilbərin, Qüdsi,
Şüru eylə bir özgə vəchlə izharə, bismillah.

## ÖZGƏLƏRƏ

* Ah gör kim genə yar oldu nigar özgələrə,
Qoşulubdur yüzü gülbərgi-bahar özgələrə,
Göstərir şəmi ruxi leylü nahar özgələrə,
Yəni bizdən usanıb ülfəti var özgələrə,
Tərk edib aşiqini oldu düçar özgələrə.

Həmdəmim qeyr olub, ləli-ləbim, mahvəşim,
Xətti-xali-xütənim, çeşmi-siyahi-həbəşim,
Dilbərim, simibərim, işvəgərim, laləvəşim.
Dövrü dönmüş fələkə bax ki, mənim badəkeşim.
Saqiyi-məclis olub, cam tutar özgələrə.

Mənə həm yar idi, həm munisü həm dilbər idi,
Mən ona çakər idim, həm o mənə sərvər idi,
Nə mənə bəlkə tamam aləmə taci-sər idi,
Nəqdi-canimi alıb çox mənə naz eylər idi,
İndi gör müftə verir busü kənar özgələrə.

Səngdil rəhm elə ki, könlüm olub şişə mənim,
Salmısan şamü səhər başımı təşvişə mənim,
Dövrü dönmüş fələk, et halımı əndişə mənim,
Bilmədin qədrimi ey şuxi-cəfapişə mənim,
Axırı üzü dönük oldu düçar özgələrə.

Həzər et, sərzənişi-xəlqdən ey bisərü pa,
Gəzmə əğyar ilə sən bəsdir usan, eylə həya,
Qüdsiya, sən biləsən yoxdu gözəllərdə vəfa,
Lənət olsun buların zatına hər şamü səba,
Ki, mənim sirr sözümü eylədi car özgələrə.

## YƏQİN

Gül belə rəxşan ola bilməz yəqin,
Ay belə xəndan ola bilməz yəqin,
Sən kimi ceyran ola bilməz yəqin,
İşvəli canan ola bilməz yəqin,
Can alan insan ola bilməz yəqin.



Qaşlarını eylədi xaliq kaman,
Ox elədi kirpiyini canalan,
Qəmzələri səndə yaratdı nihan,
Eşqə düşər xilqətinə hər baxan
Vəslənə imkan ola bilməz yəqin.

Səndən uzaq ey məhi-ərşi-cəlal,
Gündüzüm olmuş gecə, mahimsə sal,
Qoymadı rahət məni bir an məlal,
Dərdimə dərman yaranıbdır vüsal,
Ayrıca dərman ola bilməz yəqin.

Dilsizə bax gör nə edir müddəa,
Hər sözü guya yetirirmiş səba.
Uydurur hər kəs belə bir macəra,
Sənsiz olarmı yaşamaq bir daha,
Cism ki, bican ola bilməz yəqin.

Eşqə sənin meylin olarsa əgər,
Yanmalıdır səndə əzəl balu pər.
Sonra oda düşməlidir can, ciyər,
Bir belə odla yananın müxtəsər,
Tüstüsü pünhan ola bilməz yəqin.

Məclisi aç, ilk sözü ver dilbərə,
Odla dolu bir suyu tök sağərə,
Vəlvələ sal məmləkəti-xavərə,
Örtü əgər salsan o xoş peykərə,
Mehri-dirəxşan ola bilməz yəqin.

Qüdsi, daha bəndə düşüb müşkülüm,
Qüdsi, töküldü yerə tel sünbülüm.
Qüdsi, xəzan gördü deyən bülbülüm,
Qüdsi, daha yoxsa açan bir gülüm,
Eşqi-gülüstan ola bilməz yəqin.

# Mürəbbe-tərkib

* *
*

Qardaşlarım, mənim sonsuz möhnətimə baxınız,
Nəhayətsiz dərdlərimə, həsrətimə baxınız.
Yad ellərdə çəkdiyim bu qürbətimə baxınız,
Nacinslərin etdikləri töhmətimə baxınız.
Aman, dostlar arzusundan mən kənarə çıxmışam,
Düşmən deyən sözə baxıb öz evimi yıxmışam.

* *
*

Varlığımı yaman əzdi sitəm ilə ruzigar,
Təkcə bir boş vəsl ümidi etdi məni xoşgüvar.
Ürəyimi oxşamışdır şirin, dadlı arzular,
And içirəm ki, ruhimi qırdı sonsuz intizar.
Min cür qəmü dərd içində qəlbim gül tək hey solur,
Həyatım da gün keçdikcə yavaş-yavaş puç olur.

* *
*

Şuridə bir bülbül kimi düşdüm birdən xəzana,
Sınıq qəlblə mən düşmüşəm qəfəs adlı zindana.
Bu bağdan bir gül dərərsəm o tez dönər tikana,
Əziz dostlar, mən elə bir talesizəm cyhana –
Bir gülzarə qədəm qoysam solar bütün yarpaqlar,
Qönçəylə gül əvəzinə ağaclardan od yağar.



* *
*

Zəmanədən nə əzablar görməmişdir yazıq can?!
Qəlbim gözdən yağdırmışdır ətəyimə qızıl qan.
Öz-özümə etdiyimə bərk olmuşam peşiman,
Bilmirəm ki, bu sevdada hələ nə cür var ziyan.
Bu nə oddur ki, adına söylədilər məhəbbət,
Nə işdir ki, çəkdim ondan mən bu qədər məlamət?!

* *
*

Məhəbbətin dağlarıyla yaralıdır can, ciyər,
Heyrətəm ki, əhvalımda o başqa hal törədər.
Gözümdən su, ürəyimdən od və alov püskürər,
Qüdsi, nədir nagəhani bu fəlakət, bu xətər.
Yoxsa, matəm salmış sənin dostlarını həyəcana,
Fitnə qalxıb qəm tökülmüş, yoxsa bütün cahana.

# Məsnəvi

## EŞQ

Ey xuda, mən istərəm rəncü bəla,
O bəlayə qoy canım olsun fəda.

Can atır çıxsın dəli könlüm yenə,
İstəyir çəksin məni meyxanəyə.

Şövq özü oddur ona pərvanə biz,
Qorxumuz yoxdur bu oddan, şübhəsiz.

Bu yarımçıq yanmışı yandır tamam,
Bir dava ver dərdinə, tapsın məram.

Mən nə Fərhadəm, nə də bir Vamiqəm,
Mən nə Şirin, Əzraya bir aşiqəm*.

Şirin eşqi artıranda rişəni,
Dağçapan da başə vurdu tişəni*.

Aşiqəm bir Leyliyə kim karivan,
Eşqi ilə qaldırır şurü fəğan.

Naqəsi dünya, yükü dünya qədər,
Bu yükü kim çəksə taqətdən düşər.

Cümleyi-aləm sənə heyran olub,
Bu tənü canim də sərgərdan olub.

Aşiqü məşuq da sən, dildar da sən,
Qazi də, Mənsur da sənsən, dar da sən*.



Bənd qıldın eşqinə canü təni,
Leylinin eşqilə yandırdın məni.

Qəlbimi etdikdə eşqin-aşiyan,
Əqlimi Məcnunə döndərdi haman.

* *
*

Parə etdim rişteyi-tədbiri mən,
İstəməm bundan belə zənciri mən.

Aç belə zənciri boynumdan daha,
Qoy gedim hər bir yer olsa müddəa.

Səni harda axtarım, ey binişan,
Bilmirəm ki, harda salmışsan məkan?

Bilmirəm məsciddəsən, ya deyridə,
Gah vücudun məndədir, gah qeyridə.

Gahi ünqasan, ovham kimi,
Gah yanırsan can evində şam kimi*.

Bilmirəm sən hankı bir mənzildəsən,
Anladım axır ki, qəlbü dildəsən.

Afərin eşqə, onun qovğasına,
Mən yenə düşdüm onun sevdasına,

Eşq salmış aləmə həyəcanları,
Eşq zəncirə salıb aslanları.

Eşqdir su, torpağı odlandıran,
Eşqdir göy xərmənini yandıran.

Eşqdən şahlar umar razü niyaz,
Mahmudu eylər haman bəndi-Ayaz*.

## AĞ VƏ QARA

Ayüzlü bir gözəl fərrü şövkətlə,
Bir qara həbəşə baxıb nifrətlə,

Çəkildi kənara, elə bil səhər,
Qaranlıq gecədən qaçdı. Müxtəsər –

Yenə xoş sifətlə o qara qulam,
Daş qəlbli gözələ edib ehtiram,

Dedi: Ey cəmalı parlaq günəşdən,
Neçin həqarətlə mənə baxdın sən?

Olsaq da biz qara, ya ağ, hələlik –
Hamımız bir çəmən bülbülləriyik.

Yaradan ağlığı sənə verəndə,
Gözəllik etmişdir qaranı məndə,

Günəştək olanda o hüsnü camal,
Mənim də rəngimdən qoydu ona xal.

Bu xalla o camal bəzənən zaman,
Başqa bir gözəllik olur nümayan.

O xaldan gözəllik birə yüz olar,
Dalınca sürünər min pərəstişkar.

Əgər ağlığından mənə düşsə xal,
Mənim gözəlliyim məhv olar dərhal.

Xalq məni şüumsuz bilib hər zaman,
Böyük bir nifrətlə qaçar yanımdan.

Ağarmaz bilirəm qara bədənim,
Barı ağaraydı taleyim mənim!






* Ey bəhri-məlahətdə ləbin gövhəri-yekta
bir dürri-müsəfa.
Ustadi-əzəl qıldı bəhic lohidə peyda
Bir sən kimi ziyba,
Eşq əhlinə xunriz qaşıntək hanı dulab?
Zülfün kimi qüllab?
Zöhd əhlinə kuyin kimi yox kəbeyi-mina,
Ey qaməti tuba!

Aşıq diləyəm, keçmişəm hər iki cahandan.
Bəlkə dilü-candan.
Məstanə çıxıb göstərəsən nuri-təcəlla,
Çün atəşi-Musa.
Görgəc üzünü şəmi-sifət yandım, alışdım
Odlara tutuşdum.
Çeşm-siyəhin qıldı məni valehü şeyda,
Məcnun kimi rüsva.

Şənində məgər nazil olub ayəti-lövlak,
Ey niyyəti-əflak!
Məbhut hüzurunda durur aqilü dana,
Ey zülfü mütərra!

Bir navəki-dilduz ilə qıldın məni məqtul,
Ey gözləri məkhul!
Bari tut əlim lütf ilə qıl mürdəni əhya,
Manəndi-Məsiha.

Təfsir qılır zülfün əgər leylətü merac,
Gəl eyləmə tarac.

Bir tünd nigah ilə bədən mülkünü yağma,
Ey kafəri-tərsa!

Təxsir elədi aləmi bir tünd nigahın,
Bu zülfi siyahın.
Sehr eyləməyə qəmzələrin, bu-Əli Sina –
Olmaz sənə həmta!

Gör silsileyi-eşq də pabənd idi Məcnun,
Nə mən kimi məftun.
Şul türrələrin hər biri bir surəti-Leyla
Etmiş məni şeyda.

Ustadi-əzəl qıldı məni eşqə müqəyyəd,
Pabəndi-mücəəd.
Sərrişteyi-zülfün əlimə saldı ilala,
həm başıma sövda.

Çək zülfünə bir şanə edə aləmi bərbad,
Ey gözləri cəllad!
Hər tarinə pabənd ola yüz Vamiqü Əzra,
Sal aləmə qovğa!

Divaneyi-eşqəm güzərim küçəvü bazar,
Mən eyləmə zinhar!
Kuyində nə hacət qılam izhari-təmənna,
Bir ğeyri təvəlla.

Düşdüm həvəsi-danə ilə dami-məlalə,
Uydum xətü xalə.
Yay kimi qaşından tökülür, qəmzə sərapa
Ey gözləri şəhla!

Qüdsi sənə məftun olalı bulmadı bir kam,
Ey sərvi-güləndam!
Keçdi qəmi-hicrində günüm, çün şəbi-yelda,
Ey zülfü cəlipa!



# Qitələr

1

Xəbərdar ol ki, aləmdə olan cümlə hekayətlər,
Məcazi olsa da, orda həqiqətdən nişan vardır.

Deyirlər Xızra çatdı su, qayıtdı məyus İskəndər
Rəvayətdir, içində başqa cizli dastan vardır.

Mənə aydın olub artıq ki, Xızra çatmamışdır su,
Ləbi-İskəndərə bir bax, bu su orda hər an vardır*.

2

Heç bir zəhmət çəkmədən hər kəs olsa kamiran,
Deyirlər ki, bəxti var, onda yoxdur ləyaqət.

Hər işini ağılla görüb, yetirsən başa,
Bundan yəqin bir zərər görməzsən heç nəhayət.

İş düzəlsə, deyərlər, yaxşı çatdın arzuna,
Düzəlməsə, çəkməzsən başqasından məlamət.

3

Dün gecə röyada gördüm bir kəman əbrunu mən,
Ox vurub kipriklə canə sel kimi axıtdı qan.

Sındırıb əhdü vəfanı güzgüdə göstərdi üz,
Surətindən pərdə düşdü, ayna oldu binişan.

Saçları çin-çin edərkən, asiman gəldi yerə,
Saldı zəncirə cünuni, əqli etdi natəvan.

Mən özümdən bixəbər qaldım, mənə sən ver xəbər,
Bu nə röyadır? Bunu təbir qıl, ey kardan!

4

Atım qalıb ota həsrət,
Saralmışdır saman kimi,

Üzü bəzən ağa çalır,
Eşqə düşən cavan kimi.

Çöpə dönür zəiflikdən,
Töylədə ac qalan kimi,

Dili yoxdur şikayətə,
Şeyhə çəkir baxan kimi.

Onu görsən qəlbin yanar,
Mənim qəlbim yanan kimi.

Qüdsi, əl çək, yoxsa sən də
Solarsan bu heyvan kimi.

5

Bir gecə gördüm qoca öyüt verir oğluna,
Deyir malü dövlətə bel bağlama amandır.

Get, bala, elmi öyrən qulaq ver hər hikmətə,
Elmlə bu dünyada hər iş əqlə batandır.

Fəqrdədir aləmin ləzzəti, asayişi,
Hər dövlətli nadanın əhvalı çox yamandır.

6

Məclisdə xudnümalıq adət olmuş hər kəsə,
Təkəbbürlə öyünmək qəribə bir halətdir.

Biri fitnə törədib, qurur hiylə, kələklər,
Yalan deyib danışmaq hər əldə bir alətdir.



Özgənin zərərində axtarar öz xeyrini,
Alçaqlıq və rəzalət onlara bir adətdir.

Hanı özündən keçib millətə xidmət edən,
Kimin işi göstərin vətəninə xidmətdir?!

7

Nə gözəl rəng alıb aləmdə təbiət, baxınız,
Ona Çin ölkəsi də qibtə edir həsrətlə,

Gəldi novruz çağı, bu gülşənə tay yox, şəksiz,
Dağ basıb laləyə gülçin əli çox möhnətlə.

Bu gülüstan ki, onun fəsli dəyişməz əsla,
Tək bahardır ki, gülər daimi bir şəfqətlə,

Sehr, ya möcüzədir onda rəqəmlər guya,
Qasımın tərifi çoxdur iki yüz zinətlə.

Tarixi doqquz, otuz, min iki yüz oldu tamam,
Rəcəbin son günü bitdi bu rəqəm hikmətlə*.

8

Çox zamandı məhrum idim ürək açan xoş söhbətdən,
Ğafil idim bu dünyada canlar yaxan məhəbbətdən.

Xəbərsizlər məni daim bir bəxtəvər adlandırdı,
Məncə zülmə hədəf oldum qurtarmadım məlamətdən.

Nə həqiqət güldü mənə, nə istəyim hasil oldu,
Ömür hədər getdi, hələ əl çəkmədim bu adətdən.

Nə gözəldi, dostlar ilə bir hücrədə şadlanardıq,
Dərdi, qəmi bilməz idik, zövq alardıq səadətdən.

Qüdsi, mənim xatirimdən çıxmır hələ görüş zövqü,
Çox avara dolandımsa, qurtarmadım bu qürbətdən.

9

Mən şikayət eyləyəndə incimə heç ey hiyləgər,
Sən ki, qırğı əvəzində verdin düdük saldın yola.

Bir gün qırğı verən kimi tez geriyə aldın onu,
Bəs mən neçin söyləyim ki, qırğı alıb saldım qola.

Yenə qırğı diləsəm, mən sənə ağız açmaram bil,
Ta etdiyin oyunbazlıq, axır sənə sabit ola.

10

Mənəm ki, rəzm günündə pələngə, şirə dönüb,
Hünərlə düşməni məhv eylərəm şücaətlə.

Mənəm ki, zəhr yağar düşmən üstə sövtimdən,
Ölüm tutar yaxasından hər anda qüvvətlə.

Mənəm sənin üzünə güzgü, ey rəzil düşmən,
Gəlib müayinə et bu üzü ədalətlə.

11

Ey özünə insan deyib öyünən,
Nə öyrəndin bu dünyada: iki şey,

Biri bada verib varı, dövləti,
Əyyaş kimi səhər, axşam içdim mey,

O biri də hərzə, yüngül qadınla,
Oynayaraq öz dalını atdın hey!

12

Gözəllərin məclisinə düşən zaman ayıq ol,
Öz nəfsinə qələm çəkib sözlərində sayıq ol.

İnsan təbi öyrəşdiyi şeyləri çox arzular,
Çünki, hər şey nəhayətdə öz əslinə qayıdar.

Sən Allahı şahid çəkmə nahaq yerə durmadan,
Yaxşı bilir gizli aşkar hər bir işi yaradan.



Bu məbədə fazillər də ehtiramla baş əyər,
Çatar yüksək mərtəbəyə bura təzim edənlər.

13

Dedilər ki, xandan sual eyləmə,
Ki, onunçun əziz kimdir, ya nədir?

Kufə əhli belə misal deyərlər,
Bilmirəm bu doğru, ya əfsanədir?

Deyirlər ki, xanda olmaz ədalət,
O, nə bilir yaxşı nə, fəna nədir.

14

Az bilən, çox danışan axmaqdır, arif deyil,
Bənzəyər qamışlıqda küləyə sözləri bil!

15

Gəl rumi ayları sayım, nə olar,
Qoy qalsın o məndən sənə yadigar.

Otuzdur hər iki kanun və təşrin,
Azər otuzbirdir, qaydadan kənar.

Həziran, ab, neysan, iylul və təmuz
Təşrin tək otuzdur, saydıqda miqdar.

*İyirmi səkkizdir şübat üç ildə,*
İyirmi doqquzdur qalan il təkrar.

Hicrət ğərs, miladsa ğəzməddir indi,
Bu il də şübatda kət qədər gün var*,

Miladla sən qiyas etməli olsan,
Hicri il yüz il də üç il çoxalar.

16

Bu dünyaya niyə gəldik, yol-hara?
Nə üçün biz gəzirik hey avara?

Hər gün belə gördüyümüz şeylərdə,
Sirrləri örtür qara bir pərdə.

Səbəblərin səbəbini bilən yox,
Ağlımızdan acizliyi silən yox.

Hər şey bizi salır sonsuz heyrətə,
Sövq eləyir nəhayətsiz zülmətə.

Oğul ölər bilməz əvvəl və sonu,
Bilməz neçin ata yaratdı onu?!

Hər kəs bunu kəşfə çalışsa, ancaq,
Bir uçurum qarşısında qalacaq.

Yaşa, nolar bu əsrarı bilmədən,
Öz əqlini boş şeylərdə yorma sən.

Ömrü bada vermək nəyə gərəkdir?!
Onsuz da bu ömürlər çox gödəkdir.

Öz ömrünə məna ver sən hünərlə,
Bu aləmə baxsan açıq nəzərlə,

O zaman bil ömr ağacı boy atar,
Çiçək açar, verər çoxlu şirin bar.

Müvəqqəti yaşasaq da indi biz,
Barlı olsun barı bu az ömrümüz.

20

Aldanma, ey oğul, mala, şöhrətə,
Qalib gəl əqlinlə hər xəsarətə.

Ədalət uğrunda sən möhkəm dayan,
Dövlət qoy pozmasın səni heç zaman.

Bil namus girməz heç qızıl paltara,
Zəka da yaraşmaz tac qoyanlara.



# Rübailər

1

Biliklər, önündə bir müşgülatdır,
Səni dərk etməkdə ağıllar matdır.
İqrar etməsək də cəhlimizi biz
O fəxri-kainat olan bir zatdır.

2

Qəlbimin istəyi hər arzu, məram,
Əqlin istəyində əks olmuş təmam.
Müxalif olursa iki yoldaş bil,
Onların cəhdi də boş çıxar müdam.

3

Kafirlik ömrümü etmişdir hədər,
Məqsədçin mən hara eyləyim səfər?
Hardadır dünyada o müsəlmanlıq,
Ki, olsun bu yolda qəlbimə rəhbər?!

4

Dərgahda olmaq bir böyük dövlətdir,
Ona qulluq etmək bir səadətdir,
Qüdsi bir aləmdən yaranmış Qüdsi,
Onun öz adından bir əlamətdir.

5

O gözlər qəlbimi edir tarmar,
Şərabsız məst edir, yuxusuz bidar,
Ey Qüdsi, bu odlu baxışdan qorxma,
Bu odla sulanır bizdəki gülzar.

6

Sözlərin şəkərdir şirin bir nabat,
Xoşdur şəkərdən də o bir neçə qat.
Bizim məktubları cavabsız qoydun,
Görünür beləymiş səndə iltifat.

7

Ruhumu çox tərif etsən də kamil,
Nə xaric söylərsən, nə də ki, daxil.
Dəniz başdan-başa bir ünsürdəndir,
İstər o dib olsun, ya səth, ya sahil.

8

Əgər can nur isə, bu zülmət nədir?
Zülmətsə, bu nurlu məhəbbət nədir?
Demək var vücudda zülmət də, nur da,
İfrata varmaqda bu adət nədir?

9

İradə çox olsa, təəssüb artar,
Qorxaqlıq çox olsa, gedər ixtiyar.
Ağıllı odur ki, ifrat etməsin,
Hər şeydə bilməli bir tənasüb var.

10

Tərsinə dolanır amansız dövran,
O xalqı həmişə edir imtahan.
Sən laqeyd olduqca kam verir sənə,
Kamini istərkən o verir ziyan.

11

Sənətin fırçası köhnə, şahkar –
Bir işi etməzsə bizə aşikar,
O hansı babadır, yeni nəsilçin.
Qoymasın qiymətli töhfə, yadigar?



12

Əlində tutduğun dolu peymanə,
Şərabə bənzəyir belə məstanə.
O suyun rənginə baxarkən sanki,
Günəşdir eyləmiş bir bürcü xanə.

13

Talein yar olsa sənə hər zaman,
Hər hünər qarşında diz çökər inan!
Əflatun olsa da, tale dönərsə
Hər işi tərsinə çevrilir haman*.

14

Təkcə nöqsan görər eyib axtaran,
Düzü də o əyri görür hər zaman.
Əgər belə isə bəs nə üçün o,
Özündə görməyir tək bircə nöqsan?!

15

*Yaxşılıq sevməyir dünyada riya,*
Hünərlə eyb ki, birləşməz əsla.
Quranda müvafiq bir ayə vardır,
Yaxşılıq eyləyən çatar yaxşıya.

16

Fəryad ki, əksimə dövr edir fələk,
Hicran çox, vüsalı o məhv edərək –
Bu hürkmüş qəlbimə verir təsəlli,
Yaşar boş təvəkkül, ümidlə ürək.

17

Davada tüfəng də verir bizə səs,
Düşməni məhv edir ondakı nəfəs,
Düşməni məhv etmək lazım gələndə,
Ona göz ucuyla bir işarə bəs.

18

Halım etmiş məni həyatdan bizar,
Sağlamkan, etmişdir sağalmaz bimar.
Hicran bir dərddir ki, sonu bilinməz,
Bir sözlə kim edər bu halı izhar?

19

Allahım istəsə qurtarram qəmdən,
Qəzanın əksinə şad olaram mən,
Düşmənlər könlücə keçdisə ömrüm,
Bir az da dostlarçın yaşayaram şən.

20

Bürümüş tənimi, canımı fəraq,
Ağrıdır, günlərim keçsə bu sayaq.
Yar hicri, rəqibin dərdi, fələklə,
Məhvimçin qurmuşlar necə ittifaq?!

21

Odunla alışdı bu can xirmənim,
Min ələm bürüdü qəlbimi mənim.
Odlu göz yaşımdan anladım axır,
Cigər şişməsindən yanmış bədənim.

22

Saqi, gəl badə ver, dağılsın bu qəm,
Dağılsın bəlkə bu qəlbimdən ələm.
Açıb dil deyim bu viranə yerdən,
Nə vaxt çıxıb getmiş Xosrov ilə Cəm.*



23

Sinəmə dağ çəkir mənim bu dövran,
Halımı dərk edər kim çəksə hicran.
Qəlb odu bir yazıq xəstə qəribin,
Gözündən axıdır gör necə sel, qan.

24

Ümidim çoxdur ki, hicran tükənər,
Xoş keçər bəlkə bu ömür bir qədər.
Günəş tək camalın çıxanda bəlkə,
Gecəmiz məhv olub açılar səhər.

25

Sənsiz rahatlığım yoxdur, a canım,
Nə şadlıq varımdır, nə xoş zamanım,
Belə bir dolaşıq aləmdə hələ,
Azacıq ömrə də gəlmir gümanım.

26

Gözəlim bilmədi necəyəm bir az,
Kim ona aşiqsə bəxtiyar olmaz.
Zəmanə dərdindən qurtarsam əgər,
Kefimi edərəm yar yanında saz.

27

Tamahla səadət birləşməz inan,
Tamahkar həsrətdir şadlığa hər an.
Heç kəsdən götürmə azacıq minnət,
Bar çoxsa, tez sınar budaq hər zaman.

28

Ayrıldıq, ürəyim qana döndü yar,
Nə deyim bilmirəm yoxam, ya da var.
Örtüksüz görünüb keçdi məclisdən.
Lakin bir kimsəyə baxmadı nigar.

29

Bu fələk işləri etdi pərişan,
Şadlığı fitnəylə o qoydu viran.
Zəmanə kələkdir ürək vermə, bil,
Kim könül verdisə buraxdı nöqsan.

30

Söz yandı qələmin ucuyla həmən,
Fitnənin əliylə soldu bağ, çəmən,
Bu ürək mülkündə canını qoru,
Hər yandan hücuma keçmişdir düşmən.

31

Ah necə mən tapım bu dərdə dərman,
Ki, zülfü, dodağı, rüxsarı haman.
Sünbültək, qönçətək, lalətək məni,
Dağıdır, qan edir, yandırır hər an.

32

Saraldı günəşin üzü bu səhər,
Məhtabım boyuyla sərvi xar edər.
Üzünün kitabı yazılan zaman,
Qələm yox, reyhanla yazılmış əsər.

33

Ey könül, yanmaqdan qorxmursan sən də?
Pərvanə xisləti varmıdır səndə?
Hansı daş sındırdı qol-qanadını?
Yuvana dönmürsən qəlbin əsəndə*.



34

Dost yoxsa bir an da olmaram aram,
Ancaq didariylə alıram mən kam.
Ömür sona çatdı, yüksəldi ahım,
Ürəyim vermədi işə sərəncam.

35

Ey könül zülfünə sən düşmə dəxil,
Yüksəlmək bu yolda heç mümkün deyil.
Bu yol qorxuludur, sürəti azalt,
Artırsan, fəlakət törəyəcək bil!

36

Olsaydı əlimdə mənim ixtiyar,
Qəlbimi qoymazdım çəksin intizar,
Xəncəri çəkməkdə qətlimsə məqsəd,
Bir göz et canımı ovla, et şikar.

37

Yolları ey gizli, ahəstə gedən,
Həyatın məhv olar ayrılsan məndən.
Belə gedirsən ki, görməyim səni,
Sən çıxa bilməzsən əsla ürəkdən.

38

Nəsimin baxışı ruhpərvərdir,
Gül fəsli, gecəylə gün bərabərdir.
Şadlıqdan muştuluq gətirmiş bülbül,
İlin də tarixi indi sağərdir*.

39

Dünyada bir yerdə olur şadlıq, qəm,
Şadlıq kədər ilə bağlanmış möhkəm.
Şadlıq keçən kimi qəm edər zühur,
Şadlıq zühur edər, qəmlər keçən dəm.

40

Cünunluq etməyə maildir bəşər,
Birində az olur, birində bətər.
Hər kəs qafildir öz cünunluğundan,
Başqası edərsə tez tutar xəbər.

41

Dörd heydən bir yerdə olmasa asar,
O yerin əhlini bil əhli-məzar*.
Həkimü həmamü həsarü hakim,
Qüdsi, gəl bununla sözünü qurtar!

42

* Güldür bu? deyil, gül belə xəndan olmaz,
Gündürmü? deyil; gün gecə rəxşan olmaz.
Derdim mələkü mələk məhəbbət bilməz,
Kimdir bu ki, təşbihinə imkan olmaz?!

43

* Bu şəhin zatini haq məzhəri-tofiq etdi,
Namini çünki Qədir isminə tətbiq etdi.
Aləmi-qüdsdə təqdiri-əzəldən olaraq,
Qədri gör kim, qədəri həm onu təsdiq etdi.





# Alleqorik şeirlər

## (təmsillər)

## TÜLKÜ VƏ QOYUN

Yazılıb bir maraqlı dastanda,
Vardı bir tülkü bir biyabanda.

O da zahid kimiydi guşənişin,
Gözü ac, hiyləgər, dəcəl, xudbin

Bir gün oldu acından avarə,
Aclığa tapmadı o bir çarə.

Baş alıb gəzdi çöl-biyabanı,
Yem üçün axtarırdı dünyanı.

Gördü çöldə həvəslə biperva,
Bir qoyun otlayır təkü tənha.

Bir ona baxdı, bir də qüvvətinə,
Gördü işlər yaman düşüb çətinə.

Gücü çatmaz ki, bitirə işini,
Qıcıdıb hirs ilə ona dişini.

Dedi: "Ey canı bərk, quyruğu boş,
Belə bir zülm getməz Allaha xoş.

Bu ərazi mənim babamdandır,
Səndə bu nə ürək, nə vicdandır,

Ki, edirsən bu yerləri viran?
Kirəsin verməsən, düşər bil qan".

Bu acı sözləri eşitdi qoyun,
Çarəsi qalmayıb əlində onun,

Dedi: "Yoxdur sənə inamım bil,
Ola bilməz, bu yer səninki deyil.

Sahib olmaz bizim bu səhrada,
Mən kimi min qoyun gəzir burada".

Söylədi tülkü: "Şahidim vardır,
Həqqi onlar bilir, bu aşkardır.

Bu sözü hamı eyləyir təsdiq,
İstəsən ki, bu söz ola təhqiq

Neyləyim, sabit olsa bu əhval?"
Dedi: "Olsun sənə bu canım həlal"

Tülkü getdi, qoyun yazıq, miskin.
Gəlib evdə oturdu çox qəmgin.

Ağanın bir böyük iti var idi,
Bir hücumda pələngi yırtar idi.

Gah olardı çoban ilə həmdəm,
Evi də gözləyərdi o hər dəm.

Qorxusundan onun səmada belə,
Yaxlaşammazdı göy şiri Həmələ*

Ona nəql etdi macəranı qoyun,
Hirsi coşdu bu macəraya onun.

Dedi: "Tülkü kələk qurub bir bax,
Dostumun qanına susur axmaq".

O qoyunla gedib ora çatdı,
Bir çuxur qazdı, gizlənib yatdı.

Dedi: "Get, otla, qorxma, arxayın ol,
Tülkü şahid gətirsə etmə qəbul.



And üçün yanıma gətir onu sən.
Sonra gör neylərəm o şahidə mən?!"

İt ki, gizləndi qazdığı yerdə,
Sizə qoy tülküdən deyim bir də.

Özünü tülkü çöllərə vurdu,
Qoca bir qurda rastlaşıb durdu.

Getdi, hörmətlə o salam etdi,
Ona çox izzət, ehtiram etdi.

Dedi: "Ey vəhşilər əmiri, sənə,
Verirəm muştuluq, məni dinlə!

Görmüşəm bir qoyun səfeh, nadan,
Bayramın lap içindədir qurban"*.

Söylədi macəranı tülkü tamam,
Qurda gəldi fərəhli bir ilham.

Dedi: "Haqqı danammarıq heç biz,
Dediyin yer sizinkidir şəksiz".

Belə şahid tapıldı çox "adil",
Müddəi hər nə söyləsə qail.

Müxtəsər qaniçən iki qəddar,
Gülüşüb verdilər hücuma qərar.

Elə ki, oldular ora varid,
Dedi tülkü: "Budur bu da şahid.

Hər sözü doğrudur, həqiqətdir,
Məqsədi dünyada ədalətdir.

Necə olmaq bu hökmə narazı,
Özü həm şahid, həm də ki, qazı".

Dedi: – "Yox, yox, bu söz qəbul olmaz,
Müddəa sabit olmalı bir az.

Tanıram qurdu, istəyir ala can,
Şəri, haqqı o tapdalar o hər an.

Sahibim yoxsa da yanımda mənim,
Bir ocaq var yaxında xeyli qədim.

Gedərək and için ona dərhal,
Qanım olsun sizə o dəmdə halal".

Qurd dedi: – "Sənətimdir and içmək,
Qorxu olmaz təmizsə hər bir ürək".

Dedi tülkü: "Mənim də qorxum yox,
İçmişəm böylə andları mən çox".

Sözləşib getdilər ocağa sarı,
Yol hələ olmamışdı orda yarı.

Tülkü baxdı ocağa heyrətlə,
Ürəyi vurdu bir əlamətlə.

Gördü bir göz parıldayır altda,
Sanki bir şam yanır o zülmətdə.

Dedi qurda: "Ocağa and içmək,
Bizim əcdada olmamış məslək.

Atam and içdi düşdü bəndə haman,
Ovçu soydu dərisini nalan.

Anam and içdi, yeddi il yatdı,
Yeddi il dərdə, qüssəyə batdı.

İndi mən qorxuram bu anddan çox,
Özün and iç, sənin ki, qorxun yox".



Qurd dedi: "Hiyləni burax, tülki,
Güc olan yerdə hiylələr bil ki,

Boş olar, qorxmuram ocaqlardan,
Tülkülər qorxuya düşər hər an".

Qurd əl atcaq ocağa it çıxdı,
Hulqumundan yapışdı, bərk sıxdı.

Tülkü görcək əkildi tez aradan,
Qışqırıb qurda söylədi: "Nadan, –

Demədim burda gizli hikmət var,
Bu ocaqda yəqin ki, bir illət var?!"

Qüdsi, sən işlədib hiyləvü zur,
Olma heç öz nəvan ilə məğrur.

Gücsüzə rəhmsizcə zülm etsən,
İntiqamı alar bir it səndən.

## QURD VƏ İLBİZ

Bir almanın içində bir qurd vardı, nagəhan,
Külək qopdu, ağacı silkələdi durmadan,

Alma qopub budaqdan düşərək yerə dəydi,
Qurd da düşüb qorxuya əvvəlcə nalə çəkdi.

Sonra gördü sağ qalmış, sakitləşdi bir qədər,
Ahəstə çölə çıxıb saldı ətrafa nəzər.

Qamətini qaldırıb dedi: "Mənəm qəhrəman,
Zərər yetirməz mənə nə bir külək, nə tufan".

Bizim bala qurdcığaz hey döşünə döyürdü,
Qabil şəxsiyyət kimi hey özünü öyürdü.

Deyirdi : "Çox gərəkli varlığam ki, belə mən,
Allah məni qurtardı qəbr içində ölümdən".

Qurda yaxın bir ilbiz sıxılıb daxmasına,
Ətrafı seyr edirdi, qurd onun baxmasına –

Nəzər salıb fəxr ilə bağırdı: "Ey, bura bax,
Gör mən necə qoçağam". O, bir az da qalxaraq,

Alma üstə dikəldi, dedi: "Minarəyəm mən,
Yaxın gəl, ta sayəmdə qorunasan küləkdən".

Lakin ilbiz sıxıldı etibarlı qınına,
Dinməyib altdan – altdan baxdı heyrətlə ona.

Birdən külək başqa bir güclə əsdi, çoxaldı,
Ağacdan yer üstünə böyük bir alma saldı.

Alma düşdü dos-doğru məğrur qurdun başına,
Bu qoçağı döndərdi dərhal xəmir aşına.

Hava sakitləşəndə ilbiz çıxdı yuvadan,
Gördü əzilmiş səfeh, təkəbbürlü pəhlivan.

İlbiz ahəstə dedi: "Budur şöhrətin sonu,
Yersiz öyünmək, qurur məhv etdi axır onu".

İnanın bu ilbizə, bir hikmət söyləyim mən,
Öz yurduna sığınmaq yeydir sarsaq ölümdən.

## YERSİZ İFTİXAR

Sizə deyim qəribə bir hekayət,
Ağıllılar ondan alsın bir ibrət.

Küdü dəni düşdü çinar altına,
Qorxutmadı onu yağış, qasırğa.

Qucaqlayıb çinarı tez boy atdı,
Çinardan da yuxarı baş ucaltdı.



Bilmədi ki, çinarın sayəsində.
Yer tutmuşdur səmanın sayəsində.

Tənə edib dedi: bəh, bəh, ey çinar!
Bu bağda sən görmüşsən bir çox bahar.

Bir mənə bax azca zaman içində,
Qoydum geri səni dövran içində.

Bir neçə il qucaqlaşsaq belə biz,
Heç kim mənə çata bilməz şübhəsiz.

Oynaq olar mənə yüksək fələklər,
Meyvə dərər budağımdan mələklər.

Çinar gülüb dedi, öyünmə sən də,
Hünər məlum olar xəzan əsəndə.

* * *

Qüdsi xatırladım bu macəranı,
Öz həddini aşan səfil gədanı.

Bu dünyada yaşayaraq tüfeyli,
Pul topladı titrəyərək o xeyli.

Güman etdi o bir fərmanrəvadır,
Bilmədi ki, yazıq fəqət gədadır.

## EŞŞƏK VƏ BÜLBÜL

*Krılovdan tərcümə*

* Nəqlidir bülbülü görüb eşşək,
Dedi: "Qəlbimdə vardır üqdeyi-şəkk.

Xalq edər sövtü, ləhcəni tərif,
İstərəm mən həm eyləyim tövsif.

Ey olan hüsnü-sövtdə məruf!
Eylə bu şəkk üqdəsin məkşuf.

Xalq əqvalı ta ola məlum,
Sidqü kizbini mən edim məfhum.

Et bu dəm bir nəvayi-xoş avaz,
Qıl qəbul iltimasım, eyləmə naz.

Eşşəyin iltimasın ol bülbül,
Çün qəbul etdi, eylədi qülqül.

Guşini tutdu xər ki, çün nasus,
Özü həm durdu sakitü salus.

Eşidib sövt nəğməsini tamam,
Dedi: "Səd heyf, heyf, heyf müdam!

Gərçi aləm içindəsən məşhur,
Şöhrəti-kizbə olma sən məğrur!

Nəğmədə nəqs çox və leyk, əfsus!
Sənə təlim etməyibdi xorus.

Nə xoşavazdır, xorusi-səba,
Qəlbi şad eyləyir qılanda səda!.."

Bülbülə sözləri edib təsir,
Dedi: "Xoşdur sənə həmişə nəfir!

Ləhni-sövtim edər cahana əsər,
Sənə təsir etmədi, ey xər?!"

Bülbül azürdə eylədi pərvaz,
Bu misal ilə çox olur pərdaz!

Ol kəsin halı matdır heyran,
Özü aqil, mürəccəhi nadan!

Bizə xaliq ola müinü pənah,
Cahil hakim edəndə əmri-təbah!





1

Sən orda səfa eylə
Dilcülər arasında.
Mən qalmışam avarə
Gürcülər arasında.

Dərdü qəmi-hicrandan
Qürbətdə pərişanam.
Döndü ciyərim qana,
Qayğular arasında.

Bir yana əgər baxsam,
Qəm çəkmək olur bica.
Bunlar kimi məhtələt,
Xoşxulər arasında.

Hər canibə əzm etsəm,
Əzbəski gözəl yoxdur,
Tuti sifətəm, heyran –
Güzgülər arasında.

Əbr içrə günəş manənd,
Pərtov salır afaqə,
Rüxsarəsi hər şuxun,
Geysular arasında.

Yüz işveyi-mehr ilə,
Aşiqlərə meyl etmək,
Bu şəhrdə adətdir,
Məhrulər arasında.

Bunları görüb Qüdsi,
Hər kimsə ki, aqildir.
Qılmaz özünü rüsva,
Bədgulər arasında.

2

Ey yari-əzizi mehribanim,
Vey munisi-cani-natəvanim,

Nolmuş sənə boylə mübtəlasan,
Guya qəmi-eşqə aşinasan?!

Gündən-günə çoxlanır məlalın,
Aşüftə olur səyaqi-halın.

Salmış səni damə hansı ahu,
Əfsuno çəkib nə çeşmi-cadu?!

Aldanma cəmalına bu cəmin,
Pərvanəyə netdi hüsnü şəmin.

Bu şuxlərin cəmalı xoşdur,
Arayişi-zülfü xalı xoşdur,

Fikr eyləsən axırı yamandır,
Canane demək bəlayi-candır.

Ol çeşmi-xumar qəmzəpərvər.
Bir məstdir əlində xəncər.

Ol türrə ki, piçi pür təbəhdir,
Can qəsdinə əfiyi-siyəhdir.

Məkr ilə alırlar ixtiyarın,
Gündüz səbrin, gecə qərarın.

Axirdə qutub səyaqi-bidad,
Nə qətl edələr səni, nə azad.

Mən eşq yolunda çox yügürdüm,
Çox təcrübələr bu işdə gördüm.

Eyş ilə gəzib keçirdim əyyam,
Hər noilə hasil eylədim kam.



Çox mahliqalərə olub yar,
Çəkdim qəmi-hicrü rənci-oğyar.

Çox məst gözün xumarı oldum,
Çox zövqin ümidvarı oldum.

Çox zülfi-siyahə bağladım bel,
Can boynuna eylədim həmayil.

Hər halidə eşqdir şüarım,
Bu işdə nedim, yox ixtiyarım,

Ta oldu mənə bu şüğl pişə,
Təğyirilədir işim həmişə.

Bir dilbərə mehr olanda möhkəm,
Bulmaq dilərəm bir özgə həmdəm.

Ol həm məni eyləyəndə mayil,
Bir başqa nigarə bağlaram dil.

Tən etmə mənə ki, bivəfayəm,
Hər gündə birilə aşinayəm.

Bu tayifənin vəfası yoxdur,
Daim sevən aşinası yoxdur.

Hər şux qılır yüz işvə izhar,
Ta gördiyin eyləsin giriftar.

Yüz rəngilə göstərir cəmalın,
Zülfü-siyəhin, üzari-alın.

Sevdayə verir rəvaci-bazar,
Ta hüsnünə çox ola xiridar.

Çün böylə imiş bularda adət,
Bica nə üçün çəkim nədamət?!

Tərgimi olar qılandan əvvəl,
Yaxşımı degil ki, mən çəkim əl?!

3

Ömrüm əcəb dünyada, zarü, pərişan keçib,
Gündüzüm də daima gecəmlə yeksan keçib.

Hali-diləm, ey gözəl, sorma nədir hicridə,
Aşiqinin günləri didəsi giryan keçib.

Hər nəfəsi od olub çıxmış ağızdan hər an,
Sinədə etmiş tamam qəlbini büryan, keçib.

Can gedib əldən, budur məhv olur indi bədən,
Vəsl deyə cismdən həsrətilə can keçib.

Bu dili-zari sorub istəmə əhvalını,
Mən nə deyim kim ona nə kimi böhran keçib.

İstəmişəm daima həmdəmim olsun nigar,
Müntəzir olmaqlığım bilmə ki, asan keçib.

Gəldi nəhayət bu gün qasidi cananımın,
Verdi xəbər: "Sakit ol, qorxulu tufan keçib".

Əldə tutub şövqilə nurla dolu naməni,
Şöləsi sanki onun cümlə cahandan keçib.

Qəlbim alıb ətrini göylərə açdı qanad,
Kənana köynək çatıb, zəhməti-zindən keçib.

Qüdsi gülüb talein başın ucaldı yenə,
Dəstinə sanki sənin səhni-gülüstan keçib.

4

Ey gözlərimin ziyası dildar,
Sənsiz bu cahan mənə olub tar.

Sən canıma, cismimə dayaqsan,
Şadlıq və qəmim səninlədir yar.



Qəlbin kamısan gözün süruri,
Səndən güc alır bu cismi-bimar.

Səndən uzaq olsam bircə an mən,
Möhnət canımı edər xələldar.

Hicrində həmişə ağlaram mən.
Bülbül necə gül deyib sızıldar.

Səndən uzaq od içində yandım,
Bir şam kimiyəm dilim şərərbar.

Hicranın edib məni şikəstə,
Ey tazə gülüm, nədir bu rəftar?

Mən ki, özümü unutmuşam tək,
Bəxtin kimiyəm həmişə bidar.

Bil ki, sənə həmdəm olsam, olmaz –
Nə cövri-rəqib, nə zülmi-əğyar.

Gah-gah qoy öpüm şirin dodaqdan,
Bəlkə qala bu könüldə asar.

Xoş-xoş baxım o camala heyran,
Gül tək qızara o lalərüxsar.

Hicranə salıb məni zəmanə,
Qaldım necə gör hər işdə naçar.

San ömrümə bir bəzəksən axır,
Sənsiz nə behşit, nə dəhşəti-nar?!

Hər dəm yadıma düşür o dəmlər.
Yüz incə fikir edirdin izhar.

Sən vədə verib dedin unutmam,
Hər əhdimə bil mənəm vəfadar.

Hər gün bu sözü şirin zəbanın,
Yüz qəmzə ilə edərdi təkrar.

Noldu ki, belə məni unutdun,
Oldun nə üçün bu eşqə bizar?!

Biz bir can idik iki bədəndə,
Bəs kim ayırıb bizi edib xar?

Etsən nə qədər mənə sitəm sən,
Etsən nə qədər bu qəlbə azar,

Qüdsi səni heç bir an unutmaz,
Ancaq özünü unutmuş, ey yar!

5

Vəfapərvər, əzizim, mehribanım,
Səxavət sahibi ali məkanım.

Axı illər boyu həmkar idik biz,
Xeyirdə, şərdə möhkəm yar idik biz.

Hərə bir yol tutub olduq müsafir,
Fəqət məqsudimiz gəldi müğayir.

Sənə qismət olub hər nemət, hər zad,
Mənisə qane etdi bir təmiz ad.

Sənə tale gülüb tapdın səadət.
Məni hər yerdə tutdu bir fəlakət.

Adımdan almısan şöhrətlə pay sən,
Neçin pay vermədin xoşbəxtliyindən?!

Yeyib sən duz çörək bir nankor oldun,
Ki, duzsuzluq adıyla məşhur oldun.



Sənin beynin yaranmış neftə məxsus,
Sənə neftdən səva bir şey yox, əfsus!

Od oynar gözlərində əjdəha tək,
Bu oddan vacib oldu tez çəkinmək.

Əgər fikrində olsa şövqi-cənnət,
Qızıl ver atana etsin ziyarət.

Əgər dünyada bir hörmət dilərsən,
Mənə bir yolpulu ver rədd olum mən.

Nəyə lazım qızıl saysız-hesabsız,
Qızıl şahı olarmı iztirabsız.

Xəzinə gizlədib üstündə dursan,
Ona pərvanətək hey dövrə vursan.

Kimə xeyri, kimə var etibarı,
Mənə ver, sərf edim bir xeyrə barı.

Bizə bundan yəqin bil mənfəət var,
Bu gizli rəmzi anla, ol xəbərdar.

Bu pulla həll olar karımdə müşkül
Olarsan ehtirasdan sən də yüngül.

Yatarsan qorxmadan axşam səbükbar,
Səni narahat etməz xam xəyallar.

Yenə də saflaşar zatində əxlaq,
Daha çıxmaz dəhanından ləqü laq.

Əgər təklifimi rədd eyləsən, mən
Elə söz başlaram, rədd eyləməzsən.

Əlimdə and üçün bir çox səbəb var,
Qəbulə tez keçər mütləq bu andlar:

## QƏSƏMNAMƏ

And verirəm o səndəki ehtiraslı xislətə,
Sənin ögey atandakı xam xoyala, niyyətə.

And verirəm xəyalında bənd olduğun gəlinə,
O şüursuz qardaşının düz olmayan əlinə.

O boşboğaz yeznəndəki "ehtirama, kəmala",
Ki, ticarət aləmində düşüb böyük xəyala.

Heç bir həya anlamayan Zaman bəyin canına,
Ki, hərdəmbir dal qapıdan gəlir sənin yanına.

O sariban əminə ki, canı sənə əzizdir,
Sənin böyük nemətindən kisələri təmizdir.

O sevdiyin nazəninin issiz qalan qəbrinə,
Ki, dərmansız ölüb getdi, son qoydu öz ömrünə.

Səndən arpa, ot görməyən ölüb gedən ulağa,
Rəhm etmədən o yazığı alıb saldın duzağa.

O yalanı doğru kimi xurda verən dilinə,
And verirəm boş süfrənə, qapalı mənzilinə.

Ömründə bir kərəm göstər, bizi qurtar bu dərddən,
Bəlkə sən də həyatında bir yaxşı iş görəsən.





## FATMA TAR ÇALIR

Əlində titrərkən o nazik tellər,
Sonsuz həyəcanla titrədi qəlbim.
O incə, o şirin, dadlı nəğmələr,
Fələyə qaldırdı ruhumu mənim.
Eşqin yüksəldi
fərəhlə bir an.
Şövqə gəldi
can.
Qoy açsın qanad,
*sənin xəyalın.*
Bir an da olsa qoy gülsün bu həyat,
Məst etsin qəlbimi gözəl camalın.
Hamıdan xoşbəxtəm bu dünyada mən,
Səninlə bağlıdır bəxtiyarlığım.
Əqlim də sən oldun, düşüncəm də sən
Sənsiz nəyə lazım mənim varlığım?
Hüsnünün nurunu gördükdə bir dəm,
Könül qaldı mat.
Sanasan dövrəmdə rəqs etdi alət,
Bütün kainat
bir nəğmə oldu,
Füsunlu ahənglə qəlbimə doldu.
Mən səni araram ey əziz nigar,
*Qoyma ki, arizum qəlbimdə qalsın.*
Təbiət məst olub bizə oldu yar,
Çalışır tez bizi ağuşə alsın.
O şaqraq səsində
Məlahət vardır;
Ürəyim səninlə
Nə bəxtiyardır!

## TATAR NƏĞMƏSİ[1]

Qız:

Qalanın dibində durmuşdur yarım,
Əynində bahalı arxalığı var.
Qırmızı mahutun altından onun
Mavi rəng köynəyi gün kimi parlar
Məni danlamayın, töhmət vurmayın,
Deyiləm eşqimdə zərrə günahkar.
Əbədi sevirəm onu ürəkdən,
Deyildir əlimdə mənim ixtiyar.
Atma daş, yarımdan mən aralıyam,
Onsuz da ürəkdən mən yaralıyam.

Bütün el geymişdir bayram paltarı,
Tək qana batmışdır mənim ciyərim.
Divarlar dibində narlar sulanmış,
Əl çatmaz narlardan birini dərim.
Nəyimə lazımdır başqa bir oğlan,
Ondadır tək mənim fikrim, nəzərim.
Qaranlıq gecədə basıb bağrıma,
Nazlardım, gülüncə nazla səhərim.
Atma daş, yarımdan mən aralıyam,
Onsuz da ürəkdən mən yaralıyam.

İravan dağları ayırmış bizi,
O qarlı dağları bürümüş duman.
O gözəl işvəli gürcü qızları,
Ürəyi ovlayar bircə baxışdan.
Ah, məni səfalı o şən diyarda,
Bir söylə unudub, atmayacaqsan!
Mən sənin eşqində sədaqətliyəm,
Səndəmi eşqinə sadiqsən, oğlan?
Atma daş, yarımdan mən aralıyam,
Onsuz da ürəkdən mən yaralıyam.

[1] Azərbaycan nəğməsi



Buraya belə bir xəbər gəldi ki,
Orada qanlı bir müharibə var.
Deyirlər pusquya girmiş səngərdə,
Çox böyük hünərlə bizim oğullar.
Gözlərim yollarda qalmış amandır,
Öldürər məni bu ağır intizar.
Yavaşdan Allaha dua edirəm,
Yarımı sən saxla, ey pərvərdigar!
Atma daş, yarımdan mən aralıyam,
Onsuz da ürəkdən mən yaralıyam.

Oğlan:

Duyğusuz daş kimi qala dibində,
Uzanıb arzuyla mən də yataydım,
Ya bir kəs gələndə sizin tərəfə,
Arxadan mən ona qaçıb çataydım,
Belə bir gözəlin qardaşıyla mən,
Oturub səmimi ülfət qataydım.
Qalanın dibində üç ağac vardır,
Nə olar onlara bir daş ataydım.

Mənim də Zülcyxam məlahətlidir,
Yanağı qırmızı almaya bənzər.
O mənə qol açıb, gəl deyir aman,
Açılmış döşünə dəyməsin nəzər.
Sinəsi üstündə göyə əl açıb,
Edəydim Allaha dua hər səhər?!
İlahi, sən saxla onu bəladan.
Amandır, qoyma yar olsun mükəddər.

## GÖZƏL YAY

Dodaqlarında yarın incə bir təbəssüm var,
Təmiz səmada günəş sanki, şövqilə oynar.

İşıq saçar necə o dağlara məhəbbətlə,
Təbiət hüsnünə tacdır, tamam zinətlə.

Bizə yaxın yaşayır bir gözəl nigar həm də,
Tapılmaz heç ona bir tay cəmi-aləmdə.

Gecə aşıb hasarı, asta dövrəmə baxıram,
Qızıl gülü qoparıb, şümşad üstünə taxıram.

O nazənin səhər erkən duran zaman yuxudan,
Bu gülləri görüb olsun, bu möcüzə heyran.

Əzəl görəndə bu halı təəccüb eylədi yar,
Düşündü bəh, nə əcayib-ğərayib işlər var?!

Qızıl gülü yetirərmi, cahanda heç şümşad?!
Və sonra duydu bağa girmiş olmalı bir yad.

Kim isə əylənərək şuxluq eyləyir bu təhər,
O bir də heyrətilə salmadı bu halə nəzər.

Axı o nazlı cavan bilmədi ki, bu mən idim,
Qoca yaşımda demə mən özümlə əyləndim.

## XİTAB*

* Əya güruhi-sitəmkar, əhaliyi-Təbriz,
Vəfa yerində cəfa sizdə bu nə adətdir?!

Hovayi-nəfsə mütiü tamam eyşpərəst,
Görüm, ilahi, dağılsın necə vilayətdir.
Nə elmə talib olan var, nə rəsmdən agah,
Vəli bu firqəyə mətlub zibi-surətdir.

Kimin ki, xülqi müzəyyəndir, istəməz zinət,
Kişi özün bəzəmək cəhldən əlamətdir.

Yetişdi bir yerə iş hər kimin ki, saqqalı,
Hənalı olsa uzun, hörməti ziyadətdir.



Bu tərz olursa parak tazi tuladan yeydir,
Sürü içində siyiz sahibi-kəramətdir.

Nə qədər seyr edirəm kuçə ilə bazarı,
Adam çox az görünür, izdihami-kəsrətdir.

Vüfuri vardır üç firqənin bu kişvərdə,
Axund ilə xərü xan bihədü nihayətdir.

Bunun əmaməsi rəngin, onun yükü səngin,
Xüsusən ol birinin cübbəsi qiyamətdir.

Xəri çıxaq aradan bunlara şəbahəti yox,
O binəvanın işi rəncilə rəyazətdir.

Axund ilə xana hər tənə eyləsən yaraşır,
Bu müftəxorların əndişəsi şərarətdir.

Nə rahi-rəsmi-nəsara, nə şiveyi-islam,
Nə bütpərəst süluki, bular nə millətdir?!

Bular vuran od idi əhli fəqr xərməninə,
Ki, indi şöləvər oldu cahanda, vəhşətdir.

Süluki-dəhrdə təhzibi-nəfs üçün fazil,
Müdəlləl eylədigin söz sana nəsihətdir.

## DÖRD BAHAR

Könül, şad ol ki, şadlıq vaxtı çatmış,
Ki, hər şeydə xuda dövlət yaratmış.

Vəliəhdi-cavanbəxtə bax, ol şad,
Gözəl bir novərusə oldu damad.

Bu mövsimdə bahar içrə bahardır,
Atanın gün kimi təsiri vardır.

Uzaq olsun bu hallardan yaman göz,
Xeyirlə yad edilsin qoy şirin söz.

Xoş ol şahə ki, böylə təxti vardır,
Bu təxt üstündə ali bəxti vardır!

Bir İskəndər edibsə şərqi bəhrəm,
Biri də sülhü qərbdə etdi möhkəm.

Bu İskəndər də almışdır gözəl ad,
Olardan pay alıb olmuşdur ustad*.

## ("GÜLÜSTANİ-İRƏMİN" YAZILMASI SƏBƏBİ BARƏDƏ)

Bir möhtərəm cənab üçün, ələ alıb qələmi,
Çox həvəslə yazmışam bu "Gülüstani-irəm"i.

Qalsın bəlkə bu dünyada məndən ona yadigar,
Hər baxanda fərəh versin qəlbinə bu xoş bahar.

Burada var çox əcayib, çox məzəli xəbərlər,
Çox qəribə söhbətlərdən ibarətdir bu əsər.

Hər tamaşa edən zaman ləzzət verər insana,
Necə bəslər uşağını qayğı çəkən bir ana.
Uşaq tutub əllərilə soran zaman məməni,
Şıltaq edib əmə-əmə yoran zaman məməni.

Bu ananın hiss etdiyi ləzzət gəlməz hesaba,
Bənzər ancaq o ləzzət bu təravətli kitaba.

Bunda keçmiş məliklərdən, ruzigardan xəbər var,
Bu kitabda çox hikmətli və qiymətli göhər var.

Yarandısa xahişilə Moisey Zaxariçin*,
Yazılmalı oldu lakin, bu əsərim xalq üçün.



## DÖRD MÜXTƏLİF KƏLMƏNİN ŞERƏ SALINMASI

1

(*xal, qaş, ürək, sərv*)

O ağ üzə baxaraq gör, necə durub qara *xal*
*Qaşı* o dilbərimin sanki, oldu nurlu hilal,
Gözüm yolunda qalıb müntəzir, *ürək* titrər,
Papaq başında gələrmi dübarə *sərv* misal?!

2

(*yar, insan, Davud, at*)

O ay camallı *yarı* axtarır könül hər an,
Dözərmi bunca fəraqə tükə dönən *insan*.
Eşitdiyim görəsən *Davudun* gözəl səsidir.
Və ya ki, şeyhə çəkən *atda* yaxlaşır canan?!

3

(*fələk, iradə, bürc, təbiət*)

Heyif ki, insanı daim dəyişdirir bu *fələk*,
Onun *iradəsi* üstündə hökm edib gülərək.
Şüurla *bürclərin* sirrini bilən ancaq,
*Təbiəti* duyar hər cüzidən mürəkkəbədək.

4

(*kəmənd, buq, cirə, lalə*)

Kasıb *kəməndi* olar ay üzündə halə kimi,
O *buq* sədası onun səs salar hilalə kimi,
Çox oldu kim *cirədən* qüvvət aldı cismü bədən,
Qızardı günlə ayın təsirindən *lalə* kimi.

5

(*aləm, can, qüvvə, məhəbbət*)

Yarandı üçlük arasında *aləmi*-ərkan,
Mürəbbə üzrə verildi bu maddi aləmə *can**
Zəif düşəndə onun *qüvvəsi*, haman dəmdə,
*Məhəbbətə* sığınıb aldı qüvvəni ondan.

6

(*qayçı, paxıl, tüfeyli, qan*)

Həsəd qərarı kəsər *qayçı* tək aman verməz,
*Paxılların* çörəyi zəhr olar, təvan verməz.
O kəsləri ki, zəmanə *tüfeyli* xalq eləmiş,
O qansoran bitə bənzər, həyata *qan* verməz.

7

(*fəraq, üzgüçü, düşüncə, qanad*)

*Fəraq* bəhrinə düşdün, kənarı etmə güman,
Əgər bir *üzgüçü* olsan gülər sənə dövran.
Tutub *düşüncə* telindən gəmi qayır möhkəm,
Ki, dalğalar *qanad* olsun düşüncənə hər an.

8

(*eynək, günəş, eşq, ağac*)

Bilik düşüncə gözündə bir *eynəgə* bənzər,
*Günəş* batarsa, onun nuru şamda əks eylər.
Gözün bəbəkləri tək *eşq* göstərər cahanı,
Çiçək həmişə çəməndə ağacla cilvələnər.

9

(*pəncərə, ay, pinəçi dükanı, mirvarı*)

Hər özgə pəncərədən baxma ay kimi, barı,
Nə nisbəti pinəçi dükanı və mirvarı?!





1

* Eyləmək-şərhi-sifatin xarici-imkan olur,
Dəmbədəm vurduqca dəm bu şərh-bipayan olur.

Vəhm kimi səyyahi-iqlimi-fünuni-elmdir,
Bu biyaban seyrini qıldıqda, sərgərdan olur.

Künhi-zatin gər təsəvvür qılsa əqli-xurdəbin,
Mənzili-idrakə yetməz, valehü heyran olur.

2

Münkiri-zövqi-ələm qoy aşiqi-zar olmasın,
Aşiq oldur kim onun əhdində inkar olmasın.

3

Riyazi-qüds kimi filhəqiqə bu gülşən,
Lətayif ilə dolu məzhəri-həqayiqdir.

Dəxi bu vəchi-səbəbdir ki, sali-tarixi,
Hesabdə "li riyazil-qüdus" mütabiqdir.

Olub tənasüb üzündən təxəllüsüm "Qüdsi",
Ki, cəmi bir-birə bu rəmzilə müvafiqdir.

4

Yarəb, məni-həzinə dəri-lütf baz qıl,
Ver istəyimcə kami-dilim sərfəraz qıl!

Ənam edib məsalihi-cəmhuri-nəzmü nəsr.
Hüsni-bəyani-natiqəmi kəşfi-raz qıl!

5

Yarəb, rəhi-bəlayə səfər qıldım ixtiyar,
Bu yolda rəhbər et mənə tofiqi-iqtidar.

Sərhəddi-müddəayə yetir, sərbülənd qıl,
Sərgəştə qoyma kim, dolanım xarü xaksar.

6

Fələk cahan işini naləvü fəğan etdi,
Binayi-feyzi pozub fitnələr əyan etdi.

Ümid bağlamaq olmaz bu kəc dönən fələyə,
Həmişə naxələfi, çünki, kamiran etdi.

Bu hiyləgər zamanın uyma məkrinə, zinhar,
Kim alver etdi onunla o çox ziyan etdi[1].

7

Gecələr ey mah, sənsiz bəs ki, əfğan eylərəm,
Göylərə əncüm şərarın daği-suzan eylərəm.

Ahi-ataşbarindən izhar olur suzi-dilim,
Sinədə möhnət odun hərçənd pünhan eylərəm.

8

Dövrani-çərxi-bivəfa.
Qalmış füzun rəsmi-cəfa.
Vəsl etgilən qismət, xuda
Hicran məni zar eylədi.

9

Bu şərhi-qəmfəzani ki, gün-gün füzun olur,
Yazmaq şüar qılsa qələm, sərnigün olur.
Bari-müsibət əydi nihali-vücudimi,
Ari, çox olsa meyvə, budaq vajigun olur.

10

Fəğan kim, saqiyi-dövri-zəmanə,
Bəla bəzmində verdi sağəri-qəm.
Edib zəhri-cəfa iylə ləbaləb,
Kimin kim, rütbəsin gördü müəzzəm.

[1] Farscadan tərcümə edəni M.Soltan



11

Ey dil, həvəs etmə bu cahanə,
Aldanma süpehri-cansitanə.

Çox sən kimini firibə çəkmiş,
Ovzai-təqəllübi-zəmanə.

Bu mərhələyə, nüzul edənlər,
Tədricilə oldular rəvanə.

Axir, səni inqilabi-əyyam,
Tiri-əcələ qılar nişanə.

12

Tayiri-gülzari-qüdsəm aşiyandan düşmüşəm,
İstərəm pərvaz edəm, amma sınıbdır şəhpərim.

İlləhil-həmd oldu hisal paybusindən mürad
Möhnəti-qəmdən xilas oldu dili-qəmpərvərim

13

Dünyaya rücu eyləsə dilbəndi-əzizin,
Ənvai-qəm ilə cigəri qan gərək olsun.

Bir can ilə yüz dərdü bəla çəkmək olurmu!
Bir dəmdə bəla çəkməyə yüz can gərək olsun.

14

Dövləti-baqi təmənna eyləyən əhli-səlah,
Bitəvəqqüf can nisari-xakipayi-yar edər.

Çün cəmii mümkünat eylər cahandan irtihal,
Ey xoş ol arif ki, dünyadan bu zövqilən gedər

15

Bu nə şuriş, nə qovğadır, tutubdur aləmi nalə,
Qana qərq olmuş hər bir göz qızarmış, sanki bir lalə.

Uzanmaz hər qəmü matəm, aman bəs bu nə matəmdir,
Ki, hey artar güni-gündən yenə o çatmaz ikmalə?!

Axar rüxsarimə qan yaş, qızartmış çöhrəmi əşkim,
Sanasan kim, bahar olmuş, düşüb bərgi gülə jalə.

Bu matəmdə yanıb könlüm ürək qəmdən olub bitab,
Bu ahü nalə ardınca düşür varlıq yaman halə.

Bu odlu qəlbim, ey Qüdsi, alovlu ahımın içrə,
Sansan aydır, ətrafın tutubdur bir bulud halə[1].

16

Dərdü qəmdən cigərim qan oldu,
Düşmənim gərdişi-dövran oldu.
Gündə bir növ bəla çəkməkdən,
Dili-qəmdidə pərişan oldu.

17

Sənsiz siyah olur bizə bu ruzigarlər,
Əldən alır inanımızı ahü zarlər.
Ali-Rəsul bisərü saman qalan zaman,
Qılsın nə çarə dərdinə [bəs] dilfikarlər?

18

Həyati-müstəarın təng olubdur,
Götür rəğbət bu mülki-bivəfadən!
Fəzayi-qüdsə ahəngi-səfər qıl,
Xilas olmaq dilərsənsə bəladən.

[1] Farscadan tərcümə edəni M.Soltan



19

Gül üzarım belə olmaz şiveyi-dildarlıq,
Sən degildin bivəfa, aya nədir bizarlıq?

Bir tərəf qürbət bəlası, bir tərəf hicran qəmi,
Barmağımı qan etdi billah, qılmadın qəmxarlıq.

20

Ayini-vəfa tərki-dilü can gərək olsun.
Can nəzri-nisari-rəhi-canan gərək olsun.

Məşuq dilaraminə biməksi-təəllül,
Üşşaqi-cigərsuxtə qurban gərək olsun.

21

Afərin ol zümreyi-əşrafə kim, bu cəngdə,
Göstərib sövlət dili – ədadən aram aldılar.

Məhfili-izzətdə sərməst oldular bicami-mey,
Verdilər can, zövqi-cami-vəslidən kam aldılar.

22

Kəsilsün tağı-bidad ilə ol dəst,
Ki, məzlumə çəkər bir tiği-bidad.
İlahi, görməsin kam ol sitəmkiş,
Ki, eylər xaneyi-imani bərbad.

23

Hərdəm səmumi-hadisədən dövri-ruzigar,
Bir novgüli füsürdəvü xar eylər, ey driğ!
Dəşti-bəladə gürgi-əcəl ləhzə, ləhzə, ah!
Bir mişkbu ğezalı şikar eylər, ey driğ!

24

İbrət gözlə ey dil,
Gərdunə qıl nəzarə.

Nə etibar edirsən,
Dövrani-ruzigarə?!

Gülzari-aləm içrə,
Hər qönçə kim yetirmiş,

Bağrını eyləmiş qan,
Cismini parə-parə.

25

Ah ol şikəstə halə ki, canandan ayrılır,
Bir noilən ki, cismi-həzin candan ayrılır.
Gül bağrı qan olur ki, gəlir mövsimi-xəzan,
Bülbül fəğan edər ki, gülüstandan ayrılır.

26

Zehi sövləti-mötəbər, həbbəza,
Rusumi-şücaət kəmali-hünər,

Nə tab eyləsin fovci-zağü zəğan?!
Açan dəmdə şəhbaz bali-hünər.

Bəli şir cəngində məlumdur,
Ki, rubah qılmaz xəyali hünər.

27

Dəhri zalim zahir etdi adəti-mötadını,
Aşikar etmək təmənnasında ğəm bünyadını.

Kimdürür aləmdə ol ğəmdidə kim yandırmadı,
Daği-hicrilən fələk cövri-dili-naşadını.

Müxtəsər, yoxdur cahan qeydində ümmidi-nicat,
Ey xoş ol kim, payibənd etməz dili-azadını.



28

Ol namivəri-büləndcahə,
Kim mehri nəzər buraxsa mahə,

Keyvandan alıb kəmali-rüfət,
Bercisə verərdi min səadət*.

Əzmində görüb fütuhi-fərcam
Almazdı əlində tiğ Bəhram*.

Ol rəmzə nəzər qılanda əflak,
Səhmindən olurdu zəhrəsi çak.

29

Yetdi ol dəm kim, həyati-bibəqayi-dəhrdən,
Eyləyim qəti əlayiq dideyi-xunbar ilə.

Laləvəş torpaqdən baş qaldırım hicran günü,
Qəlbi-suzanü təni-çakü rüxi-gülnar ilə.

30

Səndən ayrı getsəm ey nakam, Yəsrib şəhrinə,
Yüz bəla ilə məni əndühi-hicran öldürər.

Hicri-ruyindən müqərrərdir həlakim, doğrudur,
Bülbüli-şuridəni şövqi-gülüstan öldürər.

31

Dil dərdilə biqərar olubdur,
Ləb ahilə pürşərar olubdur.
Qan rəngi tutub üzarı-zərdim,
Həngami-xəzan bahar olubdur.

Dövrani-fələk cəfalər eylər,
Can düşməni ruzigar olubdur.

32

Yandırıb əhbab könlün laləvəş daği-ələm,
Qönçə tək diltəng edibdir aləmi ənduhü qəm.

Gülşəni-iymani pamali-xəzan etdi fələk,
Əndəlibasa fəğan eylər məlayik dəmbədəm.

33

Bir zaman əhvalımı qəmdən pərişan eylədim,
Dildə nalə, gözdə yaş, qəlbimdə al qan eylədim.

Son görünmürdü bu ğəm dərdü ələm dastanına,
Aciz oldum, çünki hədsiz nalə, əfqan eylədim.

Canə gəlmişdim Rəsul evladının dərdilə mən,
Söyləməklə dərdimi yüngül və asan eylədim.
Ğəm xəzanı solduranda dostların əhvalını,
Min bəzəklə rəng vurub səhni-gülüstan eylədim.

Son vəsi evladının meydandakı cövlanını,
Vəsf edib mən də qələm atilə cövlan eylədim[1].

[1] Farscadan tərcümə edəni M.Soltan



# QEYD VƏ ŞƏRHLƏR

## *"TƏHZİBİ-ƏXLAQ" ƏSƏRİNDƏ ADLARI ÇƏKİLƏN ŞAİRLƏR*

*Sənai* – Əbülməcd Məcdud bin Adəm miladi XI-XII əsrin məşhur sufi şairidir. Onun "Hədiqətül-həqiqət..." əsəri əsasən didaktik məzmunda olub sufizm təriqətinin məşhur kitablarından hesab edilir. Sənainin böyük Azərbaycan şairi Xaqaniyə güclü təsiri olmuşdur. Xaqani onun əsərinin təsiri ilə ilk təxəllüsünü "Həqayiqi" qəbul etmişdir. Sənai yaradıcılığının ilk dövründə Qəznəvi şahlarını mədh etmişsə də, ömrünün sonunda saraylardan üz döndərmiş və bir guşəyə çəkilərək irfani (hikmətli) əsərlər yazmaqla məşğul olmuşdur. Bir neçə məsnəvidən başqa onun 12000 beytdən artıq "Divanı" vardır. Mənbələrdə Sənainin miladi 1150-ci ildə vəfat etdiyi göstərilir.

*Mövləvi* – Mövlana Cəlaləddin Məhəmməd bin Bəhaəddin 1207-ci ildə Bəlxdə anadan olmuşdur. O, on dörd yaşında olanda atası Bağdada səfər edərkən oğlunu da özü ilə aparmış və bir neçə il müxtəlif şəhərlərdə yaşadıqdan sonra Konyəyə gəlib orada məskən salmışdır. Buna görə də Mövləvi eyni zamanda Rumi təxəllüsü ilə məşhur olmuşdur. Sənaidən sonra Cəlaləddin ən məşhur sufi şair kimi şöhrət qazanmışdır, onun "Məsnəvi" adlanan irfani əsəri sufizm təriqətinin ən məşhur əsəri hesab edilir. Bu əsərdən başqa Mövləvinin böyük həcmli "Divanı" da Şərq ədəbiyyatı tarixində mühüm əsərlərdən biri hesab edilir. Mövləvi 1274-cü ildə vəfat etmişdir.

*Qasim Ənvar* – Seyid Müinəddin Əli bin Nəsirəddin Təbrizi məşhur sufi şairlərindən biri olubdur. O, 1356-cı ildə anadan olmuşdur. İlk təhsilini Təbrizdə almış, sonra bir çox səfərlər edərək dövrünün məşhur sufi şairlərilə tanış olmuşdur. Çox zaman onun adının əvvəlinə şah sözünü artıraraq Şah Qasimi-Ənvar demişlər. O, Səfəvi xanədanı ilə yaxın münasibətdə olmuş, "Ənisül-aşiqin" adlı məşhur əsərindən başqa məsnəviləri və "Divan"ı məlumdur. O, farsca, giləkcə və türkcə şeirlər yazmışdır. 1433-cü ildə vəfat etmişdir.

*Hafiz Şirazi* – Şəmsəddin Məhəmməd bin Bəhaəddin, "Lisanül-qeyb" və "Şeir bülbülü" ləqəbilə məşhurdur. O, 1325-ci ildə anadan olub, 1388-ci ildə vəfat etmişdir. Qəzəlləri musiqi ilə oxunub yayılmışdır. Quranı əzbər bildiyi üçün ona Hafiz təxəllüsü vermişlər. Qəbri Şirazdadır. İndi də ədəbiyyat həvəskarlarının ziyarətgahıdır. "Divanı" başqa dillərə tərcümə olunub dəfələrlə çap edilmişdir.

*Şeyx Mahmud* – Şeyx Sədəddin Mahmud bin Əbdülkərim Şəbüstəri miladi 1288-ci ildə Təbrizin yaxınlığında olan Şəbüstərdə anadan olmuşdur və 1320-ci ildə vəfat etmişdir. Onun məşhur "Gülşəni-raz" əsəri sufi ədəbiyyatında mühüm yer tutur. Bu əsərə çoxlu şərhlər yazılmışdır. Onun başqa əsərləri də məlumdur.

*Sədi Şirazi* – Müşərrəfəddin Müslah bin Əbdullah 1184-cü ildə Şirazda anadan olub, 1291-ci ildə vəfat etmişdir. "Bustan" və "Gülüstan" adlı məşhur əsərləri keçən 600 il müddətində dərslik kimi istifadə edilibdir. Bu əsərlərindən başqa Sədinin böyük həcmli "Divanı" vardır. O, eyni zamanda qəzəl ustadı kimi şöhrət qazanmışdır. Şairin "Bustan" və "Gülüstan" əsərləri bir çox dillərə tərcümə edilərək nəşr olunmuşdur.

*Möhtəşəm Kaşani* – Səfəvilər dövründə yaşayıb, "Şəmsüş-şüəra" ləqəbilə şöhrət qazanmışdır. Mənbələrdə Miladi 1587-ci ildə vəfat etdiyi qeyd edilir. O, əvvəlcə

lirik qəzəllər və böyüklərə mədhlər yazıb, sonra ədəbi istiqamətini dəyişərək dini məzmunda mərsiyələr yazmışdır. "Nəqli-üşşaq" adlı əsəri də məlumdur.

*Baba Əfzəl* – Əfzələddin Məhəmməd bin Huseyn Kaşani Baba Əfzəl adı ilə daha çox şöhrət qazanmışdır. Məxəzlərdə onun miladi 1307-ci ildə vəfat etdiyi göstərilir. Baba Əfzəl dövrünün məşhur ədibi və filosof alimi olmuşdur. Onun "Cavidannamə", "İnşanamə" və məntiq elminə aid daha bir neçə əsəri vardır. O, əsərlərini fars və ərəb dillərində qələmə alaraq müasirləri içərisində böyük şöhrət qazanmışdır.

*Naziri* – Məhəmməd Hüseyn Nişaburinin vəfat tarixi miladi 1612-ci il göstərilir. XVI-XVII əsrin görkəmli şairlərindəndir. Lirik şeirlər "Divanı" Hindistanda nəşr edilmişdir. Əvvəllər şahlara və görkəmli şəxslərə mədhlər yazmışsa da, ömrünün sonlarında bir guşəyə çəkilib ibadətlə məşğul olmuşdur.

*Mir Findərəski* – Əbülqasim hikmət və riyaziyyat elmləri sahəsində böyük şöhrət qazanmışdır. O, əvvəlcə I Şah Abbas sarayına yaxın olmuş, sonra Hindistana köçüb, dərvişliyə qurşanmış və Budda dini təsiri altına düşmüşdür. Şeirləri sufiyanədir. Miladi 1640-cı ildə vəfat etmişdir.

*Yağma* – Mirzə Əbülhəsən bin İbrahim Cəndəqi 1859-cu ildə vəfat etmişdir. O, XIX əsrin birinci yarısında İranın ən məşhur satirik şairi olmuşdur. Onun "Sərdariyyə", "Qəssabiyyə" adlı şeirlərindən başqa "Xilasətül-iftizah" adlı əsəri də məşhurdur.

*Nişat* – Mirzə Əbdül Vahab İsfahani "Mötəməddüdövlə" ləqəbilə məşhurdur. O, miladi 1828-ci ildə vəfat etmişdir. Nişat şairlikdən başqa xəttatlıq, hikmət, riyaziyyat və dilşünaslıq elmləri ilə də məşğul olmuşdur. Nişat İsfahaninin əsərləri toplanaraq "Gəncinə" adı altında çap edilmişdir.

*Mənsur* – Hüseyn ibn Mənsur Həllac məşhur sufi şairi olmuşdur. Klassik Şərq ədəbiyyatında onun qorxmazlığı və məsləki yolunda mərdanə vuruşması şairlər tərəfindən nümunə kimi istifadə edilmişdir.

* * *

*Səh. 117*

Ərəbcə mətnin tərcüməsi:

"İnsanın ona şükr eləməsi cahillikdir".
Çünki Allah nə etdiyini özü yaxşı bilir.

*Səh. 119*

Əlif ərəb əlifbasının ilk hərfi olub şaquli çəkilmiş düz xətdən (I) ibarətdir. Bədii ədəbiyyatda düzlük, qədd-qamət çox halda əlifə oxşadılır.

*Səh. 126*

Verər xəlqi suri-Sirafiltək,
Fənayə onun dəminin dəmləri.

Dini əfsanəyə görə qiyamət günü "İsrafil" adlı mələk şeypur çalıb, xalqı ayağa qaldıracaq və onları Allah məhkəməsinə çağıracaqdır.



*Səh. 126*

Əgər Gavətək rəyəti-rəzm aça,
İtaət qılır aləmin əksəri.

Məşhur "*Şahnamə*" surətlərindən dəmirçi Gavəyə işarədir. O öz döşlüyünü bayraq edib qaniçən Zöhhakı taxtdan salmışdır.

*Səh. 126*

Əgər görsə Rüstəm onun zərbini.

Burada Rüstəm Firdovsi "*Şahnamə*"sində təsvir edilən yenilməz pəhləvan Rüstəm Zala işarədir.

Şair demək istəyir ki, Rüstəm Zal belə, təsvir etdiyi qəhrəmanın zərbinə dözmədi.

*Səh. 133*

Qəribədir, tarixi də doğmuş sanki əsrardan,
Hasil oldu bu can adı da bax "Mişkatül-ənvar"dan.

Burada "Mişkatül-ənvar" sözləri əsərin yazıldığı tarixi göstərir. O, "Əbcəd" ilə hesablandıqda hicri 1245-ci ilə təsadüf edir ki, bu da eramızın 1829-cu ilinə uyğun gəlir. "Əbcəd" hesabı ilə hərflərin ifadə etdiyi rəqəmlər belədir:

| | | | | |
|---|---|---|---|---|
| ا - 1 | ه - 5 | ك - 20 | ق - 100 | ض - 800 |
| ب - 2 | و - 6 | ل - 30 | ر - 200 | ظ - 900 |
| ج - 3 | ز - 7 | م - 40 | ش - 300 | غ - 1000 |
| د - 4 | ح - 8 | ن - 50 | ت - 400 | |
| | ط - 9 | س - 60 | ث - 500 | |
| | ى - 10 | ع - 70 | خ - 600 | |
| | | ف - 80 | ذ - 700 | |
| | | ص - 95 | | |

*Səh. 135*

Mən nə qədər gözü yaşlı qəlb odunda qovrulum?
Bu havadan torpaq kimi mən nə qədər sovrulum?

Şerin mənası: Ürək yanır, göz yaşım ilə onu söndürməyə çalışıram, lakin bu hava (həvəs, eşq) nə vaxta qədər məni torpaq kimi sovuracaqdır?

Şair burada dörd ünsürü (od, su, hava, torpaq) bir beytdə işlətmişdir ki, tərcümədə də onlar saxlanmışdır.

*Səh. 137*

İbn-əl Fərid kimi fürsət tapa bilsəm mən hərgah
Xalqı yeni xəbərlərdən eyləyərdim mən agah.

Məşhur Ərəb şairi İbn-əl Fərid (1181-1234) incə fikirlər deyən görkəmli sufilərdən biri hesab edilir. Onun "Xəmriyyə" adlı qəsidəsinə Əbdürrəhman Cami (1414-1492) şərh yazmışdır.

*Səh. 139*

Bu dünyada hər kəs olur bir vechlə kamiran,
Xızr zülmatdan, mənsə günəş çeşməsindən, hər zaman.

Dini əfsanəyə görə guya Xızr peyğəmbər zülmətdən dirilik suyunu tapıb içdikdən sonra ölməzlər cərgəsinə daxil olmuşdur.

Şair hər səhər öz dərdini günəşə deməklə təsəlli tapdığına işarə edir.

*Səh 140*

O şərabı istəməz ki, şər ab olmuş ləqəbi.
Zatında bir fitnə vardır, qarışdırar əsəbi.

Burada şair "şərab" sözünü iki hissəyə ayıraraq, onu "şər+ab" kimi oxuyub iddia edir ki, bu suyun zatında şər olduğu üçün ondan çəkinmək lazımdır.

*Səh. 143*

Elə bildim söz mülkünün mənəm qadir sultanı
Söz düzməkdə təkcə mənəm öz əsrimin Söhbanı.

*Söhbani* – Vail Abbasilər xəlifələrindən Harunərrəşid zamanı yaşamış çox qüdrətli ərəb alimi olmuşdur. O, nəsr sahəsində böyük şöhrət qazanmışdır.

Klassik şərq ədəbiyyatında şairlər özünü Məhəmməd dövrünün ərəb şairi Həssan ibn Sabitə oxşatdıqları kimi, nəsr sahəsində də özlərini Söhbani-Vailə bənzətmişlər. Bu beytdə Bakıxanov da incə sözlər düzməkdə özünü əsrin Söhbanı adlandırmışdır.

*Səh.144*

Sədi yaxşı demiş: "Susmaq yaxşıdır pis söhbətdən,
Pis söz salar söyləyəni xalq içində hörmətdən".

Burada Sədi əxlaqi nəsihətlər verən məşhur İran şairi Şeyx Sədi Şiraziyə işarədir. "Susmaq pis söhbətdən yaxşıdır" fikrini o, "Gülüstan" əsərində demişdir.

*Səh.145*

Firon belə küfrə düşüb Allah dedi özünə,
Lakin cavab tapmadı o, Musanın haqq sözünə.

Dini əfsanələrə görə Musa Kəlimullah zamanı hökmranlıq sürən Firon o qədər məğrur olmuşdur ki, özünü Allah elan etmiş, Musa peyğəmbər isə öz möcüzələrinə onu heyran qoyub ifşa etmişdir. Musanın bədii ədəbiyyatda ifadə olunan "möcüzələri" əsasən bunlardır:



1.Əlini qoltuğuna salıb çıxartdıqda əli işıq verərmiş,
2.Əsasını yerə atdıqda əsa ilana çevrilərmiş,
3.Tur dağında Allah ilə danışarkən dağı nur bürüyərmiş (guya Allah ona işıq şəklində görünərmiş).

*Səh.146*

Bu dünyanı sevən demək, faniliyə aldanmış,
"*Fəəğşeyna*" ayəsilə gedib olsun qoy tanış.

A.Bakıxanov öz fikrini sübut etmək istərkən bəzi Quran ayələrindən istifadə edir. Biz əksər halda onların tərcümə və ya şərhini vermirik. Misal kimi onlardan birisini oxucuların nəzərinə çatdırırıq.

Bu beytdə xatırlanan "*Fəəğşeyna*" ayəsi Yasin surəsindən götürülmüşdür:

وجعلنا من بين ايد يهم سد امن خلفهم سدا فاغشيناهم
فهم لايبصرون

Tərcüməsi: Onların (yəni yoldan azmışların – *M.S.*) önündə və arxasında sədlər yaradıb, gözlərini bağlayırıq ki, heç şeyi görməsinlər və baxmağa qadir olmasınlar.

*Səh.147*

Çox məşhurdur Səba şəhri gözəlinin dastanı,
Ki, dalğaya bənzətmişdi şüşədəki damlanı.

Səba şəhri gözəli məşhur Süleyman peyğəmbərin sevgilisi Bilqeyisə işarədir. Bilqeyis Səba şəhərinin hakimi olmuşdur. O, Süleymanın qüdrətinə məftun olmuş və axırda ona da ərə getmişdir. "*Süleyman və Bilqeyis*" adlı xüsusi aşiqanə əsər də vardır. Bu dastanda müxtəlif ecazkar rəvayətlər və sehrlərdən bəhs olunur.

*Səh.155*

Bu rəmzilə xitab etdi Xəlilullah insana,
Ona şahid ayla günəş, odur Allah insana.

Dini əfsanəyə görə yüz iyirmi dörd min peyğəmbər içərisində məşhur olanlardan biri də İbrahim Xəlilullahdır. O, bütləri qırmaq və odda yanmamaqda şöhrət qazanmışdır. O da dini əfsanəyə görə xalqı Allah yoluna dəvət edən ulu peyğəmbərlərdən hesab olunur.

*Səh.156*

Məhəbbətlə günəş dildə bir adlanır mehr, mehr,
Əbədidir günəş kimi məhəbbət də, deyil sehr.

Fars dilində "mehr" sözü həm "məhəbbət", həm də "günəş" mənası verir. Burada göstərilir ki, günəş əbədi olduğu kimi, eyni sözlə ifadə edilən məhəbbət də əbədidir.

*Səh.156*

Qurana bax, genişsə də mənaları, məzmunu,
"Bey"lə "sin"lə başlanaraq bitir, yaxşı bil bunu!

A.Bakıxanov az danışmağın məsləhət olduğunu sübut üçün Quranın birinci hərfi ilə ("Bismillah" sözündəki "b") Quranın axırıncı surəsinin son "s" hərfini birləşdirib "bəs" sözünü almışdır. Yəni həmişə danışarkən "bəsdir" sözünü yadında saxlamalısan.

*Səh.156*

Sözə yeni məna yeni şəkil versin fikrimiz
"İstincanı", "İstibranı" başqa cür şərh edək biz.

Bu beytdə xatırlanan "istinca" və "istibra" dini istilahları XVII əsrin böyük riyaziyyatçı filosofu şair Şeyx Bəhai Amilinin adı ilə belə izah edilir:

İstinca – qəlbi təmiz olub, çirkinliklərdən qaçmaq, istibra isə gizli qalmalı şeyi ifşa etməmək və paklıq axtarmaq deməkdir.

*Səh.158*

Öz nəfsinin məhbəsindən qurtar, azad qanad çal,
"Leysə lil-insanə illa ma səa" dən ibrət al!

İkinci misradakı ərəb sözlərinin mənası: "İnsan əməksiz mövcud deyildir".

Bu, Məhəmməd peyğəmbərin hədislərindən birisi hesab olunaraq Şərq ədəbiyyatında tez-tez xatırlanmışdır.

*Səh.159*

Bəhaidən yenə düşdü yadıma bir rəvayət
Bu yerdə münasibdir qoy eyləyim hekayət.

Bəhai təxəllüsü ilə şöhrət qazanan Bəhaəddin Amili ibn Şeyx Hüseyn, Səfəvi şahlarından Şah Abbasın rəğbətini qazanan görkəmli alim və filosof şairlərdən biri olmuşdur. Onun "Nanü həlva" əsəri, "Kəşkül" adlı məcmuəsi və mükəmməl divanından başqa bir çox elmlərə dair əsərləri vardır. Hicri 1040-cı (miladi 1630) ildə vəfat etmişdir.

*Səh.160*

Bu hikmətə sübut üçün lazım gəlsə hekayət,
Qoy söyləyim "*Məsnəvi*"dən bir münasib rəvayət.

"Məsnəvi" XIII əsrin məşhur sufi şairlərindən Mövlana Cəlaləddin Ruminin əsəridir. Altı dəftərdən (hissədən) ibarət olan bu əsər təsəvvüf ədəbiyyatının ən mükəmməli hesab edilir. "Mövləvi" təriqəti onun adı ilə bağlıdır.

*Səh.164*

Neçin bəs it Əshabi-Kəhf ilə kaha girərək,
Dördüncü və ya səkkizinci hesab oldu o köpək.



Dini rəvayətə görə Misirdə eramızdan əvvəl Deqyanus adlı əfsanəvi padşah zamanı altı nəfər onun zülmündən can qurtarmaq üçün şəhərdən çıxıb dağa – mağaraya (kəhf) getmişdir. Yolda bir çoban da öz iti ilə onlara qoşulmuşdur. Guya Allahın əmrilə onlar neçə yüz il həman mağarada yatıb qalıblar. Çobanın iti də insan şərafətilə səkkizincidir. Dini rəvayətə görə qiyamət günü Lutun arvadının dərisi bu itə bəxş ediləcək və o artıq tamamilə insan olacaqdır.

*Səh.170*

Biri dedi: bir cavan var, çalan zaman o rudu
Gözəl, şaqraq nəğməsilə heyran qoyar Davudu.

Dini rəvayətə görə Süleyman peyğəmbərin atası davudun gözəl səsi olmuşdur. Buna görə də klassik Şərq ədəbiyyatında məlahətli səsə işarə edilərkən o, "Ləhni-Davud" (Davudun səsi) kimi ifadələrlə bir çox klassik şairlərin əsərlərində xatırlanmışdır. Rud-çalğı alətinin adıdır.

*Səh.173*

Qoy yandırıb vəzirimi tez yanıma göndərsin,
Bu cənnəti daha da şən bir aləmə döndərsin.

Qədimdə oda sitayiş edənlərin bir qisminin əqidəsincə müqəddəs odda yanıb kül olmaqla insan behiştə gedərmiş.

*Səh.183*

Ey sağlamlıq bəxş edən məriz Şəhab,
Pak ruhlusan gəl sorğuma ver cavab.

A.Bakıxanov bütün bədii əsərlərində iki yerdə Şəhab adını çəkir ("*Mişkatül-ənvar*" poemasında və həman bu "*Sualat*" şerində). Şəxsiyyəti hələlik bizə məlum olmayan bu adam, görünür, XIX əsrin birinci yarısında filosoflardan biri olmuşdur. Çünki Bakıxanov ona müraciətlə özünü maraqlandıran ən çətin suallara cavab istəyir. Digər tərəfdən Şəhab süzən ulduz və parlaq işıq mənası verir.

*Səh.184*

Təfəkkürdən taət üstünsə əgər
Heyrət içrə qaldı neçin peyğəmbər?

Burada Bakıxanov Məhəmməd peyğəmbərin Allaha xitabən: "Mən sənin necə olduğunu layiqincə dərk edə bilmədim" – sözlərini nəzərə çarpdırmaq istəyir. Şair demək istəyir ki, itaət təfəkkürsüz kor-koranalıqdır. Təfəkkür və mühakimə hər işdə üstün olmalıdır.

*Səh.186*

Ağıl bəndə düşərək burada mat dayandı,
İşraqi məşşailər doğub belə yarandı.

*İşraqi* və *məşşailər* islam fəlsəfəsində müəyyən müddəalar irəli sürən və bir-birini təftiş edən təriqət adlarıdır. İşraqilər işığı (nuru) əsas götürərək Allahın nuru ilə qəlbin işıqlanmasını eşq adlandırırdılar. Məşşailər isə əsl hikmətin vücudun özündə olduğunu irəli sürürlər. Bəziləri də bunları yunan filosoflarından Əflatun və Ərəstu ilə bağlayır.

*Səh.190*

Paskeviç! Bu adda böyük şöhrət var.
Öz adıyla məşhur olmuş bu salar.

Məlum olduğu üzrə Abbasqulu ağa Bakıxanov Paskeviçin yanında 1826-1828-ci il Rus-İran müharibəsində iştirak etmişdir.

Paskeviç İvan Fyodoroviç (1782-1856) general-feldmarşal olub, 1830-1831-ci illərdə Polşa üsyanını yatırmış və Polşada çar canişini olmuşdur.

*Səh.193*

Mən Firəngə bir səyahət eyləyim.

Klassik ədəbiyyatda Firəng dedikdə əsas etibarilə Rusiya (Peterburq) və ya Avropa nəzərdə tutulurdu.

*Səh.194*

Dəmir zərlə örtülübmüş nə yaman.

Bakıxanov demək istəyir ki, çox aldanmışdır. Ona qızıl kimi görünən Polşa paslı dəmirdən ibarətmiş.

*Səh.196*

Nə etməli ki, asudə olum mən,
İslam ilə Firəng çəkişməsindən.

Burada şair cana doyduğunu və sülhdə, rahatlıqda yaşamağı arzuladığını bildirir.

İslam – Firəng çəkişməsi o zamanlar Şərq ilə Qərb arasında gedən müharibələrə işarədir.

*Səh.198*

Zahirdə bir guşənişin görünər,
Lakin verər Hind, Rum, Çindən o xəbər.

Guşənişin – xalqdan kənara çəkilib təkbaşına yaşayanlara deyilir. Lakin bu beytdə Bakıxanov özünə işarə edərək zahirən guşənişin kimi özünü kənara çəkirsə, xalqdan kənar olmayıb elmi işlə məşğul olduğunu və Hindistan, Türkiyə və Çin ölkələrinin tarixindən xəbər verdiyini deyir.



*Səh.200*

Heyrət etmə cəhalətlə sən buna,
İp bağlamış nəfsin bil öz boynuna.

Klassik ədəbiyyatda çox zaman nəfs ilə əql qarşı-qarşıya qoyulur. Nəfsə tabe olanlar həmişə dünyada uduzurlar. Buna görə də şair öz-özünə deyir ki, sən öz nəfsinə tabe olmuşsan, o sənin boynuna ip bağlayıb istədiyi tərəfə aparır. Əqlə arxalanan özünü o bəladan qurtarar.

*Səh.215*

Ürək narahat oldu yenə etdim ahü vah
Qəlbim bir Müştəriydi, qarşısında Mehrü Mah

Müştəri – Günəş ətrafında dövr edən səyyarələrdən olub, Günəşdən uzaqlığı etibarilə beşinci yerdədir. Həcm etibarilə ən böyük səyyarələrdən biridir. Qədim Roma mifologiyasında yunanilərin Zevsi kimi böyük ilahi qüvvəyə malik xoşbəxtlik ulduzu hesab edilir (Müştəri ulduzuna Bərcis və Yupiter də deyilir).

*Mehr* – Günəş.

*Mah* – Ay

Beytin mənası: Qəlb səadət mənbəyi, önündə isə parlaq gələcək vardır.

Burada Azərbaycan xalqı arasında çox şöhrət tapmış "*Mehr və Mah*" dastanı və bu dastandan təsirlənərək özünün ölməz əsərini yaradan XIV əsrin məşhur şairi Əssar Təbrizinin "*Mehr və Müştəri*" poeması yada düşür. Görünür Bakıxanov bu dastan və poema ilə yaxından tanış olmuşdur.

*Səh.229*

Harun sarayına yaxın yaşardı.

Harun məşhur Abbasilər xəlifələrindən Harunərrəşidə (786-809) işarədir. Bəni-Üməyyə hakimiyyətini aradan qaldıran Əbu-Müslim Xorasani Abbasiləri hakimiyyət başına keçirmişdi. Harunərrəşid Abbasi xəlifələrindən beşincisi və qüdrətlisi olub, ərəb nağıllarında, xüsusən məşhur "Min bir gecə" əfsanəsində idealizə edilərək təriflənmişdir.

*Səh.231*

Abbasilər dövləti hökmrandı.
Bu vaxt düşdü bərk quraqlıq Bağdadda,
Hərarətdən ürək yandı, dil yandı,
Susuzluqdan Dəclə gəldi fəryada.

Abbasilər xilafəti Əbu-Müslim Xorasaninin qiyamından sonra yaranıb (VIII əsrin ortalarında), monqol hücumları zamanı (XIII əsr) aradan qaldırılmışdır.

Bağdad şəhəri İraqın mərkəzi və Abbasilər xilafətinin əsas paytaxtı olmuşdur.

Dəclə – Bağdadın yanından axan çayın adıdır.

*Səh.232*

Məcnunnüma Bəhlul bu dəm açdı dil.

Rəvayətlərə görə Bəhlul Abbasilər xəlifələrindən Harunərrəşidin qardaşı olub, siyasət və taxtü səltənətdən üz döndərmiş, özünü dəliliyə vurub, incə sözlərilə xalq arasında şöhrət qazanmışdır. Şərqdə "Molla Nəsrəddin" kimi onun da adına bir çox rəvayət, lətifə və məzhəkələr uydurmuşlar. Klassik ədəbiyyatda bir çox şairlər onun adı ilə bağlı şeirlər də yazmışlar. Burada "Məcnunnüma" dedikdə, Bəhlulun özünü dəliliyə vurmasına işarə olunur.

*Səh.237*

Danışma, heç bir şey görmə-əmr etsən,
Susaram, yumaram gözlərimi mən.
Əmr etsən anlama! Əfv et hökmdar,
Bu işdə əlimdə deyil ixtiyar.

Bu şeir Azərbaycanın məşhur satirik şairi Mirzə Ələkbər Sabirin aşağıdakı qitəsinə çox bənzəyir:

Görmə! Baş üstə, yumaram gözlərim
Dinmə! Mütiəm, kəsərəm sözlərim...

Çox ehtimal Sabir Bakıxanovun həmin şerini oxumuş və ondan istifadə etmişdir. Bəzi alimlərin fikrincə Sabir bu qitəni Əşrəf Gilanidən tərcümə etmişdir. Əgər belə isə o zaman Əşrəfin haman qitəni Bakıxanovdan almış olduğunu güman etmək olar. Hər halda bu üç şairin şeirlərində bir fikir vəhdəti mövcuddur.

*Səh.239*

Altı şey vücuda çox lazımdır bil,
Dörd şey də eyləyir mərəzi təhlil.

Bu rəqəmlərin arxasında ciddi bir məna yoxdur. Burada şair qəsdən özünü xəstəliyə vuran bir avamın uydurmasını nəzərə almışdır.

*Səh.245*

Dil "ənəl-həqq" söyləsə Mənsur şəklin göstərir.

Mənsur Hüseyn ibn Mənsur Həllac hicri 309-cu (miladi 921) ildə Bağdadda dara çəkilmişdir. İlk dəfə o, insanı Allah səviyyəsinə qaldırmış və "ənəl-həqq" (həqiqət mənəm) söyləmişdir. Ondan sonra bu fikir başqa sufilər tərəfindən də irəli sürülərək Mənsuru özlərinə nümunə göstərmişlər.

*Səh.245*

Asimanda-kövkəbi-səd olsa, Əsəd yerdədir.

Orta əsr astrologiyasına əsasən göydə ulduzlar xoşbəxtlik (səd) və bədbəxtlik (nəhs) əlaməti üzrə iki qismə bölünmüşdür. Guya hər kəs öz ulduzuna müvafiq ya xoşbəxt, ya da bədbəxt doğulur.

Beytin mənası Əgər göydə xoşbəxtlik ulduzu varsa, Əsədin (adam adıdır) yer üzündə olması daha böyük xoşbəxtlikdir.



*Səh.245*

Töfheyi-babi-Suleyman söyləsəm, Qüdsi, nolur,
Bu qəzəl rani-mələxlə mur şəklin göstərir.

Bu beyt məşhur əfsanə ilə əlaqədardır. Guya heyvanlara da hökm vermək qüdrətinə malik Süleyman peyğəmbərin şahlıq günündə bütün canlılar ona hədiyyə verirlər. Süleymandan kimin töhfəsinin qiymətli olduğunu soruşduqda, o öz bədənindən neçə qat ağır çəyirtgə ayağını daşıyıb gətirən qarıncanı göstərmişdir. Bu rəvayət Şərq klassik poeziyasında dəfələrlə bədii vasitə kimi istifadə edilmişdir.

Bakıxanov adı çəkilən Əsədə bu qəzəlin kiçik bir töhfə olduğunu nəzərə çarpdırmaq üçün həmin əfsanəni yada salmışdır.

*Səh. 248*

Qafi – qaşın, tayi – telin, lami – ləblərin
Aləmdə əlbir əyləsə, billah qital olur.

Burada Şərq poetikasında ərəb əlifbasının hərfləri üzrə qurulmuş bədii ifadə tərzi öz əksini tapmışdır. Yəni "Qaş" sözündən birinci hərf olan "ق" (Q), "Tel" sözündən birinci hərf olan "ت" (T) və "ləb" sözündən birinci hərf olan "ل" (L) hərflərini birləşdirdikdə قتل "Qətl" sözü meydana gəlir ki, bu da öldürmək mənasını verir.

Şair demək istəyir ki, sənin qaşın, telin və ləblərin aşiqin canını alır.

*Səh. 250*

Göstərsə, yox əcəb yədi-beyza kəlimi-təb:

(Bax, şərh səh. 144)

*Səh. 254*

Həm ruzədir, həm bayram açılsa giribanlar.

"*Ruzə*" – orucluq deməkdir. "Bayram" da orucluq bayramına işarədir.

Şair demək istəyir ki, yarın sinəsi açıldıqda orucluq qurtarır, bayram etmək lazım gəlir.

*Səh. 265*

Mur oturub təxti-Süleymanə, ah,
Hind qoşunu Şərqi sərasər tutub.

Murun (qarıncanın) Süleyman taxtında oturması, habelə Hind qoşununun Şərqi istila etməsi, cavanın üzünə tük çıxmasına işarədir. Burada qarıncanın və hindlinin qaralığı tükə, parlaq Süleyman taxtı və Şərq isə ağ simaya işarədir.

*Səh. 267*

Ürək olubdur əsirin zavallı Yusiftək,
Züleyxa qeydinə düşmüş, əsiri-zindandır.

"*Yusif və Züleyxa*" dastanının qəhrəmanı Yusifə aşiq olan Misir hökmdarının (Əzizi-Misrin) arvadı Züleyxa, Yusifin ona meyl etmədiyini görüb, ona böhtan ataraq yeddi il həbsdə yatmasına səbəb olmuşdu.

*Səh. 270*

Ah ki, o itmiş gözəldən pirəhən peyda deyil,
Pirəhən yox, *bəlkə bir beytül-həzən* peyda deyil.

Məşhur "Yusif və Züleyxa" dastanında Yusifin köynəyi iki dəfə xatırlanır. Birincisi onu qardaşları quyuya salıb qanlı köynəyini ataları Yəqubə gətirdikləri, ikincisi Yusif Misirdə padşah olduğu zaman öz köynəyini qardaşlarının buğda kisəsi içərisində göndərməsi. "*Beytül-həzən" (kədər evi) də Yəqubun oğlu Yusifi düşünüb ağ*ladığı evə verilən addır.

Səh. 270

Orda bişək hiyləgər bir Əhrimən peyda deyil.

Əhrimən (Anqroman) oda sitayiş edənlərin dinində şər allahının adıdır. O xeyir allahını təmsil edən Ahura-Məzdaya (Hürmüzə) qarşı mübarizə aparır. Əhrimən klassik ədəbiyyatda şər, hiylə və xəyanət rəmzi kimi işlədilmişdir.

*Səh. 271*

Yusif köynəyini Züleyxa yırtdı.

"Yusif və Züleyxa" dastanında Misir hökmdarının arvadı Züleyxa Yusifin ona ram olmadığını gördükdə, əl atıb onun köynəyindən tutmuş və Yusif qaçmaq istərkən köynək cırılmışdır. Sonra Züleyxa bu hadisəni öz xeyrinə – Yusifin ona xəyanət əli uzatdığı kimi qələmə vermişdir

*Səh. 276*

Hər Azərdən Xəlil olmaz cahanda,
Əgər olsa, hər od bir gülüstandır.

Xəlil – İbrahim Xəlilüllah peyğəmbərə işarədir. Azər – həm od mənası verir, həm də İbrahimin atasının adıdır. Dini əfsanələrə görə Nəmrud İbrahimi yandırmaq istərkən od bir gülüstan olmuş və onu yandırmamışdır. Şair demək istəyir ki, əgər bizim zəmanədə Azər oğlu İbrahim Xəlilullah kimi adam mövcud olsa, dünyada atəş də gülüstana çevrilər.

*Səh. 277*

Əgər aləm desə aşiq olubdur kafir, eyb etməz,
Bu sözlər macərayi-haləti-Səlmanü Buzərdir.

Səlman əvvəlcə bütpərəst, sonra atəşpərəst, nəhayət Məhəmmədin dinini qəbul edərək müsəlman olmuşdur. Məhəmməd Səlmana çox hörmət etmişdir.
A.Bakıxanov aşiqin kafirliyini də Səlmanın "kafirliyinə" bənzətmişdir.



*Səh. 278*

Məhəbbət bazarında naz satma çox, əzizim,
Burda çox Əzizi-Misr dağlanıb olmuş qulam.

Əzizi-Misr – qədim zamanlarda Misir hökmdarlarına verilən ümumi addır. Burada isə Misirdə qul kimi satılan Yusifə işarə edilir.

*Səh: 285*

Xət yarı saldı dərdə necə ki, Ali-Sami
Yafəslə xam nəsli gətirmişdi fəğanə.

Sam, Ham və Yafəs dini rəvayətdə Nuh peyğəmbərin övladları olub, sonra bunların arasında nifaq düşmüş və dünya üzərində müxtəlif tayfaların əmələ gəlməsinə guya onlar səbəb olmuşlar.
Beytin mənası: Yarın xətti dünyanı qarışdırıb, qırğın törətdi.

*Səh. 286*

Azər edərmi bir daha,
Sənətini əyan əbəs?

Azər (İbrahim Xəlilullahın atası) dülgər olub, taxtadan bütlər qayırıb satarmış. Onun qayırdığı bütlərə sitayiş edənlər əleyhinə oğlu İbrahim Xəlilullah çıxaraq, xalqı bir Allah yoluna dəvət etmişdi.

*Səh. 287*

Nə hisslər iş görür, nə ağıl, çünki,
Rəfrəfsiz deyildir mümkün bu merac.

Dini əfsanələrə görə Məhəmməd peyğəmbər Allahın yanına göyə qalxarkən, əvvəlcə Buraq adlı başı insana, bədəni ata bənzər qanadlı bir ata minmişdi. Lakin bu at onu dördüncü göyə qədər qaldırmış, bundan sonra guya Məhəmməd "Rəfrəf" adlı başqa səmavi bir nur atın belində göyün üst qatına çıxmışdı.
Beytin mənası: Həqiqəti dərk etmək üçün hiss və əql hələ kafi deyildir. Buna ilahi bir qüvvənin də köməyi lazımdır.

*Səh. 290*

İsa nəfəsitək bəxş eyləyir can.

Dini əfsanələrə görə İsa peyğəmbərin nəfəsi ölüyə dəydikdə dirilərmiş.

*Səh. 299*

Nəfsin İsgəndər olub zülməti-təb içrə, a Qüdsi,
Eşq oldu həyat çeşməsi, Xızr oldu həvadar.

Dini rəvayətə görə ancaq İsgəndəri-Zülqərneyn ilə Xızr zülmətdə dirilik suyu axtarmış, Xızr bu suyu tapıb içmiş, İsgəndər isə ondan məhrum olmuşdur.
Beytin mənası: Nəfs – İsgəndər kimi təbin zülməti içərisində yolunu itirmişdir. *Eşq* – dirilik suyudur. Xızr isə şairin eşqə olan həvəsidir.

*Səh.300*

Olub fərvərdinə dey bir bəzək kim,
Çiçəklər zinəti-gülzar olubdur.

*Fərvərdin* hicri-şəmsi ilinin birinci ayıdır. Bu isə baharın ilk ayı olub miladi mart-aprel aylarına müvafiq gəlir. Dey şəmsi ilinin qış aylarındandır.

Beytin mənası: Qışın son ayı da bahara bəzək vermişdir.

Məcazi mənası: Qocalıq gəncliyə bir bəzəkdir.

*Səh.302*

Bir zamanlar mars qalıb heyrətdə keçdi ömrümüz,
Cüt şeş atıb tapmışam indi ələmdən mən nicat.

Nərd oyununa işarədir, məlumdur ki, bu oyunda ən böyük şans "cüt şeş" atmaqdır. Şair nərd oyunundan misal kimi istifadə edərək bir təsadüflə ağır vəziyyətdən – marsdan çıxdığını nəzərə çarpdırmaq istəmişdir.

*Səh.302*

Bir yerim vardır ki, burada dincəlib Nuh bir zaman
Qorxmuram indi əgər dəryayə dönsə kainat.

Nuh – ikinci Adəm ləqəbi ilə məşhur olan peyğəmbərdir. Guya onun zamanında dünyada tufan baş verib bütün yer üzünü su tutmuşdur. Nuh isə gəmi qayırıb hər heyvandan bir cüt oraya qoyaraq tufan müddətində onları gəmidə saxlamış, sonra bu gəmi Çudi dağına oturmuş və orada olanlar məhv olmaqdan qurtarmışdır.

*Səh.304*

Qüdsi, bu cahan dövlətinin payəsi yoxdur,
Kavusi-Keyin halına bax, ibrət al ondan.

A.Bakıxanov da öz sələfi Xaqani Şirvani kimi bu dünya şöhrətinə bel bağlamağı irəli sürürkən keçmiş Kəyan şahlarından belə nişan qalmadığını misal göstərmiş və ondan ibrət almağı məsləhət görmüşdür.

Kavusi-Key – qədim İran şahlarından Keykavusa işarədir. Məlum olduğu üzrə bu şah pəhləvan Rüstəmin rəşadəti sayəsində fəlakətdən qurtarıb böyük qüdrətə malik olmuşdur.

*Səh.306*

Gözəllərin şahı, zənciri-ədl edib zülfü.

Zənciri-ədl – yəni ədalət zənciri. Rəvayətə görə qədim İran şahlarından Ənuşirəvan "Adil" ləqəbi ilə şöhrət tapmışdır. Guya onun ədalət zənciri varmış. Bu zəncir şahın oturduğu taxtın yanından həyətə salladılarmış. Şikayəti olanlar gəlib bu zənciri silkələdikdə şah özü şikayətçinin gəldiyini bilib, onun dərdini öyrənərmiş.



*Səh.307*

Qüdsiya, səbr eyləmək pirəhənə bənzər ki,
İtmişindən gələrək çatdı o beytül-həzənə

(Bax, şərh: səh.270).

*Səh.313*

Yaxşılıq hasil olar zahiri çirkindən çox,
Qoy büti məhv eləyən dəhrdə Azər olsun.

Azər – İbrahim Xəlilullaha işarədir (Bax, şərh: səh. 277)

*Səh.319*

Sən tutursan əməli, biz əməli ey zahid!

Bu misrada istifadə edilən "əməl" sözü omonim olub, "arzu" və "iş" mənasını verir. Ərəb əlifbasında bu sözlər müxtəlif hərflərlə başlayır: ( امال ' عمل )

Beytin mənası: Ey zahid, sən arzu (xəyal) ilə yaşayırsan, biz isə işlə məşğuluq.

*Səh.324*

Sən qiyas et yar üzün Nəmrud oduyla gör necə,
Atəşi onlar bizə misli-gülüstan eylədi.

Nəmrud – qədim Babil şəhərinin müəssisi, büdpərəst. Əfsanəyə görə İbrahim peyğəmbərin dinə dəvətini qəbul etməyib, onu oda atdırmışdır. Guya Allahın əmrilə sivri sinəklər (ağcaqanadlar) hücum edib Nəmrudu məhv etmişdir.

*Səh.326*

Eşq müşkül dərddir, dərmanə Loğman istəyir.

Loğman – əfsanəvi təbibin adıdır. Bəzi rəvayətlərə görə onun prototipi məşhur Yunan təbibi Hippokratdır: klassik Şərq ədəbiyyatında bütün xəstəliklərə dərman edən bir təbib kimi yad edilmişdir.

*Səh.326*

Rəhnüma oldu, dəlilsiz çıxdı azərdən Xəlil.

(Bax, şərh: səh.324).

*Səh.326*

Atəşi-Nəmrud içində xoş gülüstan istəyər.

(Bax, şərh: səh.324).

*Səh.329*

Qəza Yusif hüsnündə öz fırçasın,
Edib imtahan, çəkdi bu surəti.

A.Bakıxanov gözəlin hüsnünü təsvir etmək istərkən çox incə təşbeh yaratmışdır. Bütün klassik ədəbiyyatda "Yusifcamal" bir misal olaraq işlənmişdir. Hətta Züleyxaya tənə vuran Misir xanımları Yusifin hüsnünə heyran qalıb, turunc əvəzinə əllərini kəsmişdilər. A.Bakıxanov isə deyir: qəza (tale) gözəlin surətini çəkmək üçün əvvəlcə Yusif camalını yaratmış və sonra oradakı nöqsana yol vermədən bu gözəli yaratmışdır.

*Səh.333*

Arxalanma belə bir yolda gözə, qəlbə Kəlim
Bu cürə ol və əsa ilə xətər var yenə də.

Burada Kəlim Musa peyğəmbərə işarədir.
Beytin mənası: Musanın möcüzəsi bu göz və qəlbin sehrləri qarşısında aciz qalar.

*Səh.334*

Bu sevdadən çoxu olmuş xəcalət,
Gedib Sürxabi-Təbrizdə nihanə.

A.Bakıxanov Təbriz şəhərində olan məşhur Sürxab qəbristanlığını xatırladaraq, orada dəfn edilən böyük şairlərə işarə etmişdir. Mənbələrdən məlumdur ki, Xaqani Şirvani, Zəhirəddin Fəriyabi və başqaları həmən qəbristanlıqda dəfn edilmişlər.

Buna görə də Sürxab qəbristanı "Məqbərətüş-şüəra" (Şairlər qəbristanlığı) adı ilə şöhrət tapmışdır.

*Səh.334*

Nizaminin yeri eyvanda dardır,
Məgər Dəhlidən heç qalmış nişanə?!

Şairin ədəbi irsindən aydın olur ki, o, Azərbaycan və Yaxın Şərq klassiklərinin xüsusilə Nizami, Xaqani, Əmir Xosrov Dəhləvi, Sədi, Hafiz və Füzulinin əsərlərini sevə-sevə oxumuşdur.

Beytdə zəmanədən şikayət edərkən bu dünyadan məyus getmiş Nizami və Əmir Xosrov Dəhləvi xatırlanır.

*Səh.336*

Yədi-Beyza və əsa göstərər hər sehrbaza,
Kimsəyə olsa bu cür zülfi-pərişan qismət.

(Bax, şərh: səh.145)

*Səh.336*

Çünki olmaz sənə Keyvandakı eyvan qismət.

Keyvan – Şərq astrologiyasında eyni zamanda Zühəl adı ilə məşhur olan səyyarədir. Müasir nücum elmində Saturn adlanır. O, Günəşdən uzaqlığına görə altıncı yerdə durur. Bu səyyarə qədim yunanların əkin Allahı kimi təsvir edilmişdir. Bakıxanov bu misrada öz həddindən yuxarı mövqe axtarmağın lüzumsuzluğunu nəzərə çarpdırmaq istəmişdir.



*Səh.353*

Fərhad ilə dağdır gözümə görsənən hər şey,
Düşmür ələ Şirinlə gülüstan Qarabağda.

Bakıxanov Qarabağda nədənsə özünü yaxşı hiss etməmişdir. Bu qəzəldə o öz vəziyyətindən şikayət edir.

Beytin mənası: Qarabağda ancaq yazıq Fərhadın boş xəyal uğrunda dağ çapması nəzərə gəlir. Halbuki, ortalıqda nə Şirin var, nə də gülüstan.

*Səh.355*

Çeşmü xalü rüxü kakil törədər xofü xətər,
Ay düşər Əqrəbə, Mərrix də Keyvanə yaxın.

Bu beytdə klassik Şərq poetikasında "ləff nəşri-mürəttib" adlanan sənət işlənmişdir. Bu sənətə görə birinci misrada olan ifadələrin cavabı ikinci misrada sıra ilə əlaqələndirilir. Burada insanların simasında olan dörd əlamət (göz, xal, yanaq və zülf) dörd səma cismi ilə qarşı-qarşıya qoyulmuşdur. (ay, əqrəb, mərrix və keyvan).

*Əqrəb* – əqrəb bürcü.

*Mərrix* – mars ulduzu. Qədim romalılarda əvvəl əkin, sonra isə müharibə allahı kimi təsvir edilmişdir. Şərq ədəbiyyatında ancaq müharibə allahı kimi xatırlanmışdır.

Orta əsr astrologiyasında ayın Əqrəb bürcünə və Mərrixin Keyvana yaxınlaşması nəhs hesab edilərək, yer üzündə bir fəlakət törəyəcəyi kimi qələmə verilmişdir.

Beytin mənası: Gözəlin üzündə göz, xal, yanaq və zülf bir-birinə yaxın olduqları üçün (əlbir olub) dünyaya qovğa salmışlar.

*Səh.355*

Misrdən Yusifinin ətrini tez hiss elədi,
O adam ki, quyunu görmədi Kənana yaxın.

O adam – məşhur "Yusif və Züleyxa" dastanının qəhrəmanlarından Yusifin atası Yəqubə işarədir. O, Yusifin Kənan şəhəri yaxınlığında quyuya salındığını bilmədiyi halda, uzaq Misrdən onun ətrini duymuşdu. Şair bunu bir əfsanə kimi qiymətləndirir.

*Səh.358*

Qüdsi belə olmazdın,
"Sərdar" deyə hey azdın.
Tək sözlə əsər yazdın,
Bir söylə nədən ey dil?

Bakıxanov müvəffəqiyyətli cinaslar yaratmışdır. Burada şair "Sərdar" sözünü 14 dəfə təkrar edir və hər dəfə bu sözə müxtəlif məna verir. Bu cəhəti tərcümədə tamamilə saxlamaq mümkün olmamışdır.

*Səh.365*

Xalqa təlim eləyir sehr yarın didələri,
Cüt mələkdir quyuya nazil olub sanki xumar

Bu beytdə adı çəkilən cüt mələk dini əfsanədə məşhur olan Harut və Marut adlı mələklərdir. Əfsanəyə görə mələklər Allah tərəfindən cəzalandırıldığı üçün Babil şəhərindəki quyuların birində ayaqlarından asılmışdılar. Bədii ədəbiyyatda sehrkarlıq və cadu əksərən onlara isnad edilir.

*Səh. 365*

Kaf onun kakilidir, nun isə əyri qaşıdır,
Nə məhəbbətlə yaratmış gör onu sənətkar?!

Dini əfsanəyə görə guya Allah "kon" (ol) deməklə istədiyinə nail olmuşdur. Bu sözdə olan iki hərf: "kaf" və "nun", klassik Şərq ədəbiyyatında təkrar-təkrar xatırlanmışdır. Burada Bakıxanov gözəlin camalını təsvir etmək istərkən bu ilahi hərflərin gözəlin simasında öz əksini tapdığını nəzərə çarpdırmaq istəmişdir. Məlum olduğu üzrə klassik poetikada surətdə olan üzvlər əlifbanın müəyyən qismi ilə müqayisə edilmişdir. Bunları belə xülasə etmək olar:

ا = (əlif)=qədd, qamət

ص ع =göz

ر =ağız

ق ن =qaş

ج ل =saç, zülf

ن ، د =qəddin əyilməsi

س:ش =diş

*Səh.368*

Damənin bir əl, əlin damən tutardımı məgər,
Udmasaydı Yusifi-Misri o Kənan içrə çah?!

(Bax, şərh: səh.270).
*Səh.381*

Gülşəni Yusifin hicrində cigərqan etdi.

(Bax, şərh: səh.270).

*Səh.381*

Çəmənin səhnəsinə etdi hücum Bəhmənü Dey,

Bəhmən və Dey Cəlali təqvimi üzrə qış aylarıdır. Yəni qış gəldi və çəmən soldu.

*Səh.385*

Tez verin zülmətdəki Xızra xəbər,
Çeşmeyi-heyvanı bəxş eylər günəş.

(Bax, şərh: səh.299).



*Səh.386*

Bax Həməl bürcündəki qurbanə sən,
Ta şikar olsun sənə yeksər günəş.

Həməl səmadakı on iki bürcdən birincisidir. Lüğəti mənası quzu deməkdir. Şair bu bürcü qurbanla bağlayır. Digər tərəfdən Günəş öz dövrü zamanı Həməldən keçdiyi üçün guya o, quzu (qoç) tərəfindən "ovlanır". Bu isə bədii vasitə olaraq şairə imkan verir ki, Günəş kimi özünün bir quzu (gözəl) tərəfindən ovlandığını qələmə alsın.

*Səh.387*

Möcüzə etdi Musiyi-İmran

Musiyi - İmran yəhudilərin peyğəmbəri Musaya işarədir.

*Səh.387*

Qüdsinin nisbəti bu dərgahədir,
Bir qul olmuş bu yerdə çün Rizvan!

Rizvan - dini əfsanələrə görə behiştin qapıçısının adıdır.

*Səh.387*

"Sali-fərxəndəfali-ali əvc"
Tarix olsun bu şöhrətə olan.

Birinci misra Əbcədlə hesablandıqda hicri 1262-ci (miladi 1845) il olur ki, bu da həmin qəsidənin yazıldığı tarixi göstərir.
*Səh. 389*

Xoş olmuş onun hər işi, Qüdsiya,
Olub tarixi "Kanə tarixüna"

Burada şerin yazılma tarixi göstərilir. Bu da Əbcəd hesabı ilə hicri 1262-ci (miladi1845) il deməkdir.

*Səh. 391*

Zünnar salıb boynuna Sənanə dönübdür.

Şair gürcü qızına aşiq olub, eşqi yolunda öz dinindən də üz döndərən Şeyx Sənanı xatırladıb, eşqdə sabitqədəmlikdə özünü Şeyx Sənana bənzədir.

*Səh. 391*

Gəlibdir Yusifi-gül pirəhən bazarə, bismillah.

Şair burada məşhur "Yusif və Züleyxa" dastanına işarə edərək özünü tacirlər tərəfindən bazarda satılan Yusifə bənzədir.

*Səh. 396*

Mən nə Fərhadəm, nə də bir Vamiqəm,
Mən nə Şirin, Əzrayə bir aşiqəm.

Bu beytdə iki məşhur aşiqanə dastana işarə edilir: Bunlardan birisi "Fərhad və Şirin", digəri isə "Vamiq və Əzra"dır. Hər iki dastan Şərq ədəbiyyatında böyük şöhrətə malikdir.

*Səh. 396*

Şirin eşqi artıranda rişəni,
Dağçapan da başa vurdu tişəni.

Burada şair Nizami Gəncəvinin məşhur "Xosrov və Şirin" poemasını xatırladaraq, Şirinin eşqində Fərhadın özünü qurban verməsini nəzərə çarpdırır.

*Səh. 396*

Aşiqü məşuq da sən dildar da sən,
Qazi də, Mənsur da sənsən, dar da sən.

Bu beytdə panteizm dünyagörüşü hakimdir. Şair Allaha xitabla onun hər şeyə qadir olduğunu və hər şeyin ondan təcəssüm etdiyini ifadə edir. Burada adı çəkilən Mənsur "Hollac" ləqəbi ilə şöhrət tapıb "ənəl-həqq" (həqiqət mənəm) deyən məşhur sufiyə işarədir.

*Səh. 397*

Gahi Ünqasan, gahi ovham kimi,
Gah yanırsan, can evində şam kimi.

Ünqa - əfsanəvi bir quşdur. Şərq ədəbiyyatında bəzən o, "Simurq" da adlanır. Bir şeyin az tapıldığını nəzərə çarpdırmaq istəyən şairlər əksər halda onu gözəgörünməz və yeri bilinməz deyə Ünqa və Simurqə oxşatmışlar. Bu beytdə Bakıxanov yenə Allaha müraciətlə demək istəyir ki, bəzən sən Ünqa kimi yeri bilinməz, bəzən isə insanın qəlb evində yanan bir çırağa bənzəyirsən. Onun Allah haqqında olan bu fikirləri bir neçə yerdə təkrar olunmuşdur.

*Səh. 397*

Eşqdən şahlar umar razi-niyaz,
Mahmudu eylər tamam bəndi-Ayaz.



Mahmud onuncu əsrin məşhur İran padşahı Sultan Mahmud Qəznəviyə işarədir. Firdovsi öz "Şahnamə"sini onun hakimiyyəti illərində yazmışdır. Məlum olduğu üzrə Sultan Mahmud öz qulu Ayazın xatirini çox istəyirmiş. Buna görə də klassik Şərq ədəbiyyatında, "Mahmud və Ayaz" adlı dastanlar yazılmaqla bərabər, bir misal kimi də şairlər tərəfindən istifadə olunmuşdur.

*Səh.401*

Deyirlər Xızra çatdı su, qayıtdı məyus İskəndər
Rəvayətdir, içində başqa gizli dastan vardır.
Mənə aydın olub artıq ki, Xızra çatmamışdır su,
Ləbi-İskəndərə bir bax, bu su orda hər an vardır.

Burada iki İskəndər haqqında söhbət gedir. Birisi eramızdan əvvəl IV əsrdə yaşamış məşhur yunanlı İskəndəri-Kəbir, digəri Tiflisdə yaşamış, şəxsiyyəti bizə hələlik məlum olmayan İskəndər[1]. Birinci İskəndər dini əfsanəyə guya Xızr peyğəmbərlə zülmətdə dirilik suyu axtarsa da, onu tapmamışdır.

*Səh. 403*

Tarixi doqquz, otuz, min iki yüz oldu tamam
Rəcəbin son günü bitdi bu rəqəm hikmətlə.

Bu rəqəmi açıq yazdıqda hicri 1239-cu ilin rəcəbül-mürəccəb ayının son günü əldə edilir ki, bu da eramızın 1823-cü il mart ayının 31-nə təsadüf edir. Bu, əsərin yazıldığı ili göstərir.

*Səh. 405*

Hicrət Ğərs, miladsa Ğəmzəddir indi,
Bu il də şübatda kət qədər gün var,

Bu beytdə üç söz Əbcəd hesabına əsasən seçilmişdir. Öz-özlüyündə bunların heç bir lüğəti mənası olmayıb, ancaq rəqəm mənası vardır. Bunlardan:

Ğərs= غرس = غ + ر + س 1000+200+60=1260

Ğəzməd= غضمد = غ + ض + ا + د =1000+800+40+4=1844

Kət= ك + ط =20+9=29

Bu, şerin yazıldığı tarixi göstərir (hicri 1260 / 1844 miladi).

[1] Bəziləri bu İskəndəri rus çarı Aleksandr hesab etmişdir (*M.S.*).

*Səh.409*

Əflatun olsan da, tale dönərsə,
Hər işin tərsinə çevrilir haman.

Əflatun (Platon) – eramızdan qabaq V əsrin sonu, IV əsrin əvvəllərində yaşamış məşhur yunan filosofudur. Sokratın şagirdi və Ərəstunun müəllimi olmuşdur. Klassik Şərq ədəbiyyatında bacarıq və qüdrət rəmzi kimi işlənmişdir.

*Səh.410*

Açıb dil deyim bu viranə yerdən,
Nə vaxt çıxıb getmiş Xosrov ilə Cəm.

Xosrov – əsasən Sasani padşahlarına verilən ümumi addır. Konkret şəkildə Xosrov Pərvizə işarədir. Cəm isə Cəmşidin adının qısaldılmışıdır. O, eramızdan xeyli əvvəl yaşamış əfsanəvi İran padşahıdır. Guya öz qüdrətinə çox güvəndiyi üçün Zəhhak adlı zalım bir padşah onun taxt-səltənətini ələ keçirmişdir.

A.Bakıxanov şahlıq şöhrətinin fani olduğunu nəzərə çarpdırmaq istəyərək həyatı şən keçirməyi təbliğ edir.

*Səh.412*

Ey könül, yanmaqdan qorxumusan sən də?
Pərvanə xisləti varmıdır səndə?!
Hansı daş sındırdı qol-qanadını?
Yuvana dönmürsən qəlbin əsəndə.

Əslində bu rübai "Pərvanədari" söz tərkibindən istifadə ilə cinaslanmışdır. Bu söz öz tərkib hissələrinə bölündükdə belə mənalar verir.

*Pər* – qanad
*Va* – açıq
*Nə* – yox
*Pərva* – qorxu

Rübaidə üç dəfə təkrar edilən "Pərvanədari" söz birləşməsi hər dəfə ayrı məna verir:

I *pərva* + nədari = qorxun yoxdur.
II *Pərvanə* + dari = pərvanə (xasiyyəti) varındır.
III *Pər* + *va* + nədari = qanad açmırsan.
Tərcümədə bu cinaslar "Sən+də" sözləri ilə saxlanmağa çalışılmışdır.

*Səh.413*

Şadlıqdan muştuluq gətirmiş bülbül,
İlin də tarixi indi "Sağər"dir.



Bu əsərdə tarix "Sağər" ( ساغر ) sözü ilə ifadə edilmişdir ki, o da Əbcəd hesabı ilə hicri 1261-ci (miladi 1845) ili göstərir.

*Səh.414*

Dörd "hey" dən bir yerdə olmasa asar,
O yerin əhlini bil əhli-məzar.

Şairin fikrincə bir yerdə ki, "hey" hərfi ilə başlayan dörd şey yoxdursa o yerin əhalisi ölü kimi olar. Bu dörd şey isə həkim (təbib), hamam, hasar (qala) və hakimdən ibarətdir. Burda həkim səhhəti qorumaq, hamam təmizliyi təmin etmək, hasar (qala) düşmən hücumundan qorunmaq, hakim isə ölkədə xalq arasında ədalət və nizam-intizam olmasını təmin etmək mənasını ifadə edir.

*Səh.418*

Qorxusundan onun səmada belə,
Yaxlaşammazdı göy şiri Həmələ.

Göyün şiri səmada 12 bürcdən beşincisi olan Əsəd (Şir) bürcünə işarədir. Həməl isə on iki bürcdən birincisidir. Lüğəti mənası "Quzu" (qoç) deməkdir. Bakıxanov burada itin qorxusundan göydə şirin quzuya (Əsədin Həmələ) yaxınlaşa bilmədiyini nəzərə çarpdırmışdır. Orta əsr astrologiyasında Əsəd bürcü ilə Həməl bürcü çox az təsadüf edirlər. Bu isə Bakıxanovun nücum elmini yaxşı bildiyini göstərir.

*Səh.419*

Görmüşəm bir qoyun səfeh, nadan,
Bayramın lap içindədir qurban.

Bu şeirdə Şərq xalqları içərisində ənənəvi qurban bayramına işarə edilir. Yəni qoyun öldürülən kimi, tülkü ilə qurdun bayramı olacaqdır.

*Səh.440*

Bu şeir mətbuatda "Təbriz əhlinə xitab " adı ilə dərc edilmişdir. Halbuki, haman şerin alındığı ilk mənbədə katib onu belə sərlövhə ilə yazmışdır: "Min kəlami-Abasqulu ağa Bakui ke be ism-e Fazil qofte əst" (yəni: Abasqulu ağa Bakıinin Fazil təxəllüsü ilə yazdığı şeirdir).

*Səh.442*

Bir İskəndər edibsə şərqi bərhəm,
Biri də sülhü qərbdə etdi möhkəm,
Bu İskəndər də almışdır gözəl ad,
Olardan pay alıb olmuşdur ustad.

Bu şeirdə üç İskəndərin adı çəkilir. Birincisi eramızdan qabaq IV əsrdə yaşamış İskəndər Zülqərneyn, ikincisi Alban xalqının qəhrəman sərkərdəsi İskəndər bəy, üçüncüsü Tiflisdə yaşamış İskəndərdir. Bakıxanov bu İskəndəri tərif edərkən onu İskəndəri-kəbirdən döyüş və İskəndər bəydən sülh sənətini öyrəndiyini deyir.

*Səh.442*

Yarandısa xahişilə Moisey Zaxariçin.

Moisey Zaxaryeviç Arqutinski – Bakıxanov ailəsinə çox hörmət edən rus ordusu generalı, Dağıstan hərbi dairəsinin komandanı olmuşdur.

Şairin qardaşı Cəfərquluağa Bakıxanov onun yanında hərbi xidmətdə olmuş və general rütbəsinə yüksəlmişdir. Arqutinski şəxsən Bakıxanovla çox yaxın olmuş, dəfələrlə Qubada onların evində qonaq qalmışdır.

*Səh.443*

Yarandı üçlük arasında aləmi-ərkan,
Mürəbbə üzrə verildi bu maddi aləmə can.

Dünyanın üçlük əsasında yaranması cəmadət, nəbatət və heyvanat aləmi deməkdir (cəmadət – cansız daş, torpaq, dağ; nəbatət – bitki; heyvanat – insan və heyvanlar).

Mürəbbə üzrə ruh verilməsi isə dörd ünsürə (su, od, torpaq, havaya) işarədir.

Şairə görə bu dörd ünsürün müəyyən nisbətdə birləşməsi nəticəsində üç əsasda yaranmış aləmə ruh gəlmişdir.

*Səh.453*

Keyvandan alıb kəmali-rüfət,
Bercisə verərdi min səadət.

*Keyvan* – başqa sözlə, Zöhəl və ya Saturn səyyarəsidir ki, Günəşdən çox uzaq məsafədə yerləşir. Bercis isə Müştəri səyyarəsidir ki, mifologiyaya görə səadət ulduzudur.

Burada şair təsvir etdiyi qəhrəmanı yüksək mərtəbəli və səadət verici kimi qələmə almışdır.

*Səh.453*

Əzmində görüb fütuhi-fərcam,
Almazdı əlinə tiğ Bəhram.

Bəhram – Mərrix və ya Mars səyyarəsidir ki, mifologiyada müharibə Allahı hesab edilir.

Şair demək istəyir ki, təsvir etdiyi qəhrəman bir yeri almağa qəsd edərkən Bəhram səyyarəsi qorxusundan ələ qılınc almazdı.



# LÜĞƏT

## A

Ab – su
Afitab – günəş
Ağaz – başlanğıc
Ahən-dəmir
Ahəngər-dəmirçi
Ahəngərzadə-dəmirçi oğlu
Ahu-ceyran
Axirül-əmr – nəhayət
Alam – dərdlər
Amac – nişanə, hədəf
Amadə – hazır
Amal – arzular, ideal
Arayiş – bəzək
Ariz – üz, yanaq
Asiman – göy, fəza
Aşiyan-yuva
Aşüftə-kədərli, məyus
Atəşbar – odyağdıran
Ayin – qayda, etiqad
Azər – od

## B

Bab – qapı
Bad – yel, külək
Bak – qorxu
Bal – qanad
Bala – yuxarı
Balin – yasdıq, yataq
Bar – yük
Batin – daxil, iç
Baz – 1. qırğı; 2. açıq
Beytül-Həzən – qəm evi
Bəliyyə – bədbəxtlik, fəlakət
Bəradər – qardaş
Bərhəm – alt-üst, dağıntı
Bəriyyə – səhra, çöl
Bərq – ildırım, parıltı
Bərməla – aşkar
Bəsirət – açıqgözlülük
Bəstə – bağlı
Bəstər – yataq
Bəşarət – muştuluq, şadlıq xəbəri
Bəzm – məclis
Bidad – zülm
Bidar – oyaq
Bieman – amansız, zalım
Bihəd – hədsiz
Bihəmta – misilsiz
Bimar – xəstə
Biməks – durmadan, vaxt itirmədən
Binəhayət – sonsuz, nəhayətsiz
Binəsib – məhrum, məyus
Biniyaz – ehtiyacı olmayan
Bipayan – bitməz
Bipərva – qorxusuz, ürəkli
Birun – xaric, dışarı
Bisipah – qoşunsuz
Bişək – şəksiz, şübhəsiz
Bişümar – saysız-hesabsız
Bitəvəqqüf – durmadan, yubanmadan
Bizəban – dilsiz
Bizəval – zavalsız, yox olmayan
Bu – iy, ətir
Buq – dərvişlərin çaldığı buynuzdan qayrılmış çalğı aləti
Butə – qızıl əridən qab
Bülənd – uca
Bürhan – dəlil, sübut
Büryan – qovrulmuş, yanmış
Büzurgvar – böyük, ulu

## C

Cadu – sehrkar
Cah – mərtəbə, cəlal, mövqe
Cahantab – dünyanı işıqlandıran
Canişin – yerində oturan, övlad
Cansitan – canalan
Carub – süpürgə
Carubkəş – süpürgəçi
Cavid – əbədi, daimi
Cədəl – mübahisə, dava

Cəmmal – dəvə karvanını sürən, dəvəçi
Cərahət – yara
Cərəs – zəng, zınqırov
Cəzzabat – cazibə qüvvələri
Cihad – çalışmaq, dini qiyam
Cübbə – paltar, əba
Cüda – ayrı
Cünud – qoşun

Ç

Çah – quyu
Çakər – nökər, qul
Çalak – cəld
Çeşm – göz
Çəlipa – xaç
Çun – elə ki, kimi, bənzər

D

Dadxah – intiqamalan
Dadrəs – dada çatan, kömək
Dam – tor, tələ
Damən – ətək
Dehqan – əkinçi, bağban
Dəriğ – əfsus, heyf
Dəhan – ağız
Dəm – nəfəs, an
Dər – qapı
Dəst – əl
Dəşt – çöl, biyaban
Dide – göz
Digər – başqa
Dil – ürək
Dilaviz – ürəkaçan
Dilxun – ürəyi qana dönmüş
Dilkəş – ürəyəyatan
Dilşikən – ürəksındıran
Dirəxşan – parlaq
Duxtər – qız
Dun – alçaq
Dunpərvər – alçaqları bəsləyən

E

Ehtimam – himmət, çalışqanlıq
Etidal – mülayim, orta vəziyyət
Eybcu – eybaxtaran

Ə

Əbru – qaş
Ədəm – yoxluq
Ədimül-misal – misli olmayan, nadir
Ədu – düşmən
Əfal – işlər
Əflak – fələklər, göylər
Əhbab – dostlar
Əhmər – qırmızı
Əhriman – şər qüvvə (oda sitayiş edənlərin dinində şər allahı)
Əxtər – ulduz
Əkabir – böyüklər
Əqrəba – qohum-qardaş
Əqsam – qismlər, növlər
Əlaseviyyə – bərabər, özünə görə, müntəzəm
Əlayiq – əlaqələr
Ələm – 1. bayraq; 2. kədər
Ələssəbah – səhər olacaq, sübh erkən
Əlhan – gözəl səslər
Əliyyə – yüksək, uca
Əlvah – lövhələr
Əmma bəd – sonra, deməli
Əmsak (imsak) – qorunmaq, xəsislik
Ənadil – bülbüllər
Əncümən – cəmiyyət, məclis, yığıncaq
Əndəlib – bülbül
Əndərun – daxil, içəri
Ənduh – kədər, qəm
Ənəlhəq – haq (həqiqət) mənəm
Ənsar – köməkçilər, iştirakçılar
Ənva – növlər, cürbəcür
Ənvər – işıqlanmış, nurlu
Ərayis – gəlinlər
Ərğənun – orta əsrdə işlənən çalğı aləti
Ərğəvan – qırmızı
Ərsə – meydan
Ərş – göyün üst qatı
Ərz – yer küresi



Əsağir – kiçiklər
Əshabi-kəhf – mağara əhli
Əsna – ortalıq, zaman, vaxt
Əşk – göz yaşı
Ətiyyə – tövhə, bəxşiş
Əyan – aşkar, açıq
Əyyam – günlər, vaxtlar
Əzimət – köçmək, səfər
Əzm – qəsd, iradə

F

Fariğül-bal – asudə, rahat
Fəqih – dindar, din alimi
Fəqr – təsəvvüf istilahı, yeddinci (sonuncu) təkamül mərtəbəsi, kasıblıq
Fəramuş – unutmaq
Fərcam – xislət, xasiyyət, qabiliyyət, məzmun (insan)
Fərəh – şadlıq
Fərəhnak – şad
Fərxundə – şad, gözəl
Fətuh – fəthlər, qələbələr
Fiqh – din qanunu
Filhəqiqə – doğrudan da, həqiqətən
Firdovs – bağ
Firib – hiylə, aldatmaq
Fisqü fücur – pis işlər
Fitrak – ətək, yan heybəsi
Föve – dəstə
Fövq – yuxarı
Fünun – fənlər
Füsürdə (əfsürdə) – solmuş
Füzun – artıq

G

Geysü – zülf, saç
Gərdən – boyun
Gərdun – hərlənən (dünya)
Giran – ağır
Giranmayə – qiymətli, bahalı, görkəmli
Gireh – düyün
Girehkir – düyünlənmiş
Giriban – yaxa
Guş – qulaq
Guvah – şahid
Gülüzar – gül yanaqlı
Güruh – tayfa
Güzəran – keçən, dolanacaq, məişət

Ğ

Ğəmmaz – hiyləgər, yaramaz
Ğəzal – ceyran

H

Hala – indi
Halə – ayın ətrafında görünən işıqlı dairə
Haşəlillah – Allah eləməmiş
Hayil – araya girmək, manеə
Həbaleyi-nigah – kəbinə alma, evləndirmə
Həbbəza – nə yaxşı, bəh-bəh
Həqaiq – həqiqətlər
Həməl – göydəki 12 bürcdən birincisi, (qoç) quzu bürcü, quzu
Həmqərin – yaxın, bərabər
Həmzəban – birdilli, dilbir, həmfikir
Hənkam – vaxt, zaman
Hərasan – q orxmuş, diksinmiş
Hərim – qadağan olunmuş yer
Həsəb – qabiliyyət, bacarıq, iradə
Həvadis – hadisələr
Həzar – 1. min; 2. bülbül
Hicab – örtü
Higəran – 1. baxa-baxa; 2. nigaran
Hilm – həlimlik, yumşaqlıq
Himayət – kömək, yardım
Hisam – qılınc
Hur (huri) – mələk, pəri
Hüzn – kədər, qəm

X

Xab – yuxu
Xak – torpaq
Xakisar – zəlil, yazıq
Xamə – qələm
Xas – yüksək, təbəqədən olan adam
Xavər – şərq, gündoğan

Xəm – əyri
Xəndan – gülə-gülə
Xəndə – gülüş
Xəndəzənan – gülə-gülə
Xər – eşşək, uzunqulaq
Xəsm – düşmən
Xəzan – payız
Xirəd – ağıl
Xirədmənd – ağıllı
Xocəstə – bəyənilmiş, yaxşı
Xovf – qorxu
Xub – yaxşı, gözəl
Xuda (xudavənd) – Allah
Xudbin – özünübəyənən, eqoist
Xuddam – qulluqçular
*Xun – qan*
Xunab – qanlı su
Xunin – qantökən
Xurdəbin – incəliyi, görən, çürükçü

**İ**

İcab – lazım gəlmək
İffət – həya, namus
İxrac – xaricə göndərmək
İllət – səbəb, xəstəlik
İnbisat – genişlənmə
İrşad – yol göstərici, ayıq
İrtəhal – ölmək, köçmək
İstifsar – sorğu, sual
İstima – eşitmək
İşbah – kölgə, siluet, kabus
İştiyaq – şövq, həvəs, sevgi
İtalə – uzunçuluq
İza – əziyyət

**K**

Kardan – işbilən
Kəc – əyri
Kəcmədar – əyri yürüşlü
Kəcrəftar – pis münasibət
Kəhkəşan – qalaktika, kainat
Kəm – az
Kişvər – ölkə
Kiyti – dünya, aləm
Kiytinüma – dünyanı göstərən

Kövkəb – ulduz
Kuh – dağ
Kuhsar (an) – dağlıq yerlər
Kunun (əknun) – indi
Kutah – gödək
Künh – dib, əsl məna
Küştə – ölmüş

**Q**

Qədər – qəzavü qədər
Qədiri-mütəal – Allah
Qərin – yaxın
Qəziyyə – hadisə, hal, vəziyyət
Qiblənüma – kompas
Qital – qanlı döyüş, vuruşma
Qut – yem, çörək, güc
Qüds – pak, müqəddəs

**L**

Laəlac – əlacsız, məcbur
Laləvəş – lalə üzlü
Leyl – gecə
Leylətül-qədr – Qədr gecəsi (müqəddəs)
Ləb – dodaq
Ləzayiz – ləzzətlər
Liqa – surət, sifət
Lilləhil-həmd – Allaha şükr olsun

**M**

*Madər – ana*
Madərzad – anadangəlmə
Mah – ay
Mahi – balıq
Mahru – ayüzlü
Manənd – kimi, bənzər
Masəva – bundan başqa
Mehr – 1. günəş; 2. məhəbbət
Mehrab – müqəddəs yer
Merac – göyə uçuş (dini əfsanəyə görə Məhəmmədin göyə uçuşu)
Məcənnə – qalxan, qorunma vasitəsi
Məcər – örtü, çarqat
Məchur – ayrı düşmüş, yazıq



Məfariqət – ayrılıq
Məğfur – bağışlanmış, mərhum
Məhfil – məclis, yığıncaq
Məhmil – gəcavə, dəvə üzərində aparılan evcik
Məxmur – xumarlanmış
Məlaik – mələikələr, pərilər
Məlal – kədər, qəm
Məlamət – danlaq, töhmət
Məlaz – sığınacaq, məva, dayaq
Məlcə – pənah, sığınacaq
Mələx – çəyirtkə
Mənabir – mənbərlər, yüksəkliklər
Mənzur – məqsəd, nəzərdə tutulan fikir
Məratib – mərtəbələr, dərəcələr
Mərdum – 1. xalq, 2. bəbək
Məriz – xəstə
Məsa – axşam
Məsaleh – məsləhətlər, ləvazimat
Məsdud – bağlı, kəsilmiş (yol)
Məsərrət – şadlıq
Məstur – örtülü, yazılmış
Məşhun – dolu, yüklənmiş
Mətrukat – qoyub gedən şeylər, miras
Məva – yer, məkan, vətən
Məvasilət – birləşmək
Məzhər – doğuş yeri, tülu
Məzkur – yuxarıda adı çəkilmiş
Məzrəə – əkinəcək
Minbəd – bundan sonra
Misdaq – mövcibincə, əsasən
Misvak – diştəmizləyən
Mişkat – çıraq yeri
Mişkatül-Ənvar – işıq mənbəyi
Mişkin – qara, ətirli
Miyan – kəmər, bel, orta
Mötad – öyrəşən, adət edən
Muğayir – əks, əksinə
Mur – qarınca
Muy – tük
Mübah – şəriətə görə haram və günah olmayan şey, icazə verilmiş
Müdam – həmişə
Müəttər – ətirli, ətirlənmiş

Müxatəb – söz deyilən şəxs
Müxəlləfat – ev əşyası
Müjə – kirpik
Müjgan – kirpik
Mükəddər – qəmli
Mülaqat – görüş, söhbət
Münfəil – xəcalət
Müngir – inkar edən
Münkəşif – açılmış
Mürğ – quş
Müruri-zəmin – zaman keçdikcə
Müshəf – müqəddəs kitab (dini) burada: üz, surət
Müstəar – bürovuz, məcazi
Müstəmənd – möhtac, köməyə ehtiyacı olan
Müşəvvəş – qarışıq
Mütalibə – tələb, borc istəmək
Mütəəzzir – üzürlü
Mütərəssid – axtarmaq, araşdırmaq
Müti – tabe, sözə baxan
Müttəle – xəbərdar
Müztər – yazıq, zavallı, iztirab çəkən

**N**

Nabina – kor
Naim – yuxulu, yatmış
Nairə – od, atəş, alov
Nairəəfruz – odlu, yandırıcı
Naqə – dişi dəvə
Nam – ad
Nan – çörək
Nar – od
Naşünas – tanınmayan, yad, biganə
Natəvan – gücsüz
Nayab – tapılmayan, aztapılan, nadir
Nəmək – duz
Nəməkbəhəram – duz-çörəyi saymayan, nankor
Nərm – yumşaq
Nəsəb – nəsil, ailə
Nəşəyab – nəşə tapan
Nigah (nigəh) – baxış

Təcəssüs – axtarış
Təcrid – bir şuşəyə çəkilmək, üzlət
Təəllüq – əlaqəsi olan, dəxli olan
Təəllül – illətli, səbəb
Təəllüm – nəsihət, dərs
Təərrüz – hücum, etiraz
Təfriq – ayırmaq
Təğəllüb – saxta
Təhəyyür – heyrət
Təhniyət – yoxlamaq, halını soruşmaq, təbrik, alqış
Təhsin (etmək) – bəyənmək, tərifləmək
Təhzib – yaxşılaşdırma, təmizləmə, tərbiyə
Təqva – dini qaydaları gözləmək, ibadət
Təlxis – xülasə etmək
Təliə – günəşin doğması
Təmhid – bərabərləşdirmə, düzəltmə
Tənha – tək
Tərəb – şadlıq
Tərəbnak – şad
Təriq – yol, qayda
Təsvil – aldatmaq üçün tədbir
Təvəlla – dostluq axtarmaq
Təviq – yubanma, təxir
Təvil – izah, şərh
Tif – qılınc
Tifl – uşaq
Tir – ox
Tirə – qara, tutqun
Tiz – iti, cəld, kəskin
Türab – torpaq
Türrə – saç, zülf
Tüyur – quşlar

**Ü**

Üqba – axirət
Üqdə – düyün
Ülfə t – dostluq, mehribanlıq
Üməm – xalqlar, ümmətlər
Ümmət – bir peyğəmbərin dininə mənsub olan adamlar
Ümmül – xəbais-şərab, çirkinliklər anası
Üşşaq – aşiqlər

**V**

Vadi – çöl, oba
Vahi – boş
Vajgun – başıaşağı
Valid – ata (ana)
Vasil – çatmış
Vəhm – qorxu
Vər – və əgər
Vəsail – vasitələr, dövlət, pul
Vüfur – çox, artıq

**Y**

Ya əxil-idbar – ey yaramaz qardaş

**Z**

Zağ – qarğa
Zahir – aşkar, xaric
Zaye – məhv
Zehi – bəh-bəh, çox
Zəban – dil
Zəğən – qarğa
Zəxm – yara
Zəkiyyə – dərrakəlik, şüurluluq
Zəmair – ürəklər, qəlblər
Zəmin – yer
Zəmir – qəlb, ürək
Zər – qızıl
Zərd – sarı
Zimistan – qış
Zində – diri
Zivər – bəzək
Ziyadə – artıq, çox
Ziynət – bəzək
Zövqrəngiz – zövqü artıran
Zünnar – keşişlərin bel bağı (kəməri)



# KİTABIN İÇİNDƏKİLƏR

*Müqəddimə* ....4

*Təhzibi-əxlaq* ....17
Nəsihətlər ....65
Kəşfül-Qəraib ....73
Kitabi-Əsgəriyyə ....115
Mişkatül-Ənvar ....131
Ömür-gün şeirləri ....181
Mənzum hekayətlər ....219
Lirik əsərlər ....243
Qəzəllər ....245
Qəsidələr ....381
Müxəmməslər ....390
Mürəbbe-tərkib ....394
Məsnəvi ....396
Müstəzad ....399
Qitələr ....401
Rübailər ....407
Alleqorik şeirlər ....415
Mənzum məktublar ....425
Müxtəlif şeirlər ....435
Riyazül-qüds (mənzum parçalar) ....445

*Qeyd və şərhlər* ....455
*Lüğət* ....479

